*Bu kitab "**Qul Əli. Qisseyi-Yusif**" (**Bakı, Azərnəşr, 1995**) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Nəşrə hazırlayanlar, lüğət və şərhlərin müəllifləri: **Elməddin Əlibəyzadə**
**Əbülfəz Hüseyni**

**894.3611 - dc 21**
**AZE**
**Qul Əli. Qisseyi-Yusif.** Bakı, "Şərq-Qərb", 2004, 216 səh.

"Qisseyi-Yusif" (Yusif dastanı) hicri 609, miladi 1212-ci ildə tamamlanmışdır. Şərqdə "Yusif və Züleyxa" dastanı kimi məşhur olan bu mövzunu türk aləmində ilk dəfə Əli adlı şair qələmə almışdır.

Yusif əhvalatı çoxdan bəri Şərq xalqları arasında yayılmışdısa da, müəllif onun məzmunundan öz amalı, dünyagörüşü, məqsədi və istəyinə görə faydalanmış, yaşarı bir əsər yaratmışdır. Poemanın baş qəhrəmanı mənəvi cəhətdən pak, yetkin və kamil insandır.

Oxuculara təqdim olunan bu kitab dörd qədim əlyazması əsasında tərtib-bərpa edilərək çapa hazırlanmışdır. Əsərin süjet xəttinin alındığı "Yusif surəsi" də müqayisə məqsədilə kitaba əlavə kimi daxil edilmişdir.

**ISBN 9952-418-25-3**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## NİZAMİNİN ANA DİLİNDƏ YAZAN MÜASİRİ

"Qisseyi-Yusif" əsərinin müəllifi şair Əli haqqında hələlik geniş bioqrafik məlumat yoxdur. Poemanın sonunda o özü haqqında belə deyir:

Bunu düzən zəif bəndə, adı Əli,
Yarlığağıl, əya rəhim, asi qulı.
Yigirmi dörd rəqəm içrə saldı yılı,
Rəhmətindən mehribanlıq umar imdi.

Buradan ancaq onu adının Əli olduğu aydınlaşır. Atası, təxəllüsü və yurdumuzun harasından olduğu dəqiq məlum deyil. Qeyd edək ki, bəzən diqqətsizlik üzündən o, "Qul Əli" adlandırılıb. Bu səhv fikir şairin xatırlanan bəndindəki "asi qulı", yəni "günahkar bəndəni" və

Rəhmət qılğıl, əya rəhim, *qul Əliyə*

– ifadələrinə istinadən söylənib; onun adını "Qul Əli" deyə çəkiblər. Əslində isə, orta əsr şairlərimizin, demək olar, hamısı şeirlərində təvazökarlıqla özlərinə "qul" deyə müraciət etmişlər. Bununla yanaşı, "zəif", "bəndə" kimi sözlər də işlətmişlər. Həmin mənada Kişvərinin bu beytini yada salaq:

Həsrətindən oda yandığı üçün *qul* Kişvəri,
Ol səbəbdən çün Səməndər narı sevdim aqibət.

Buradakı "qul" nə satın alınmış qul, nə də ad-ləqəb deməkdir. Təvazökarlıqla işlənən sözdür.

"Qisseyi-Yusif" poeması həcmcə 5000 misraya yaxındır. Əsər Azərbaycan xalq şeri üslubunda, daha dəqiq desək, varsağı formasında yazılmışdır. Həmin şeir növü ağız ədəbiyyatı ilə birgə klassik ədəbiyyatımızda da işlənib.

Bu mənada şair Əlinin varsağılarında hər bəndin üç misrası qafiyələnir, dördüncü tamamlayıcı misra isə sərbəstdir. Bu şəkildə "Qisseyi-Yusif" kimi bir dastan yazmaq böyük hünərdir. Bu, müəllifindən güclü istedad, bilik və bacarıq, xüsusilə xalq həyatını yaxşı bilmək, canlı dil və şifahi ədəbiyyatla dərindən tanışlıq tələb edirdi. Müxtəlif, rəngarəng hadisələri, macəraları vermək, kütləvi səhnələr yaratmaq, fəlsəfi və ictimai-siyasi fikirləri belə məhdud bir qəlibdə qələmə alıb təsvir etmək həqiqi mənada məharətdi. Məsnəvi formasında şair bir qədər sərbəstdir, onun əl-qol atmaq imkanı, söz meydanı geniş və rahatdır. Şair Əlinin istifadə etdiyi formada isə fikirlər bir-birilə qafiyələnən üç misra daxilinə sığdırılmalı, dördüncü misra bunlara bağlanmalı



və fikrə məntiqi yekun vurulmalıdır. Poemanın bütün bəndləri beləcə möhkəm qayda-qanuna, nizama tabedir. Hər bənd ıəqticə əvvəldən axıradək üç yerə bölünən dörd hecalı ifadələrlə qurulmuşdur.

| | | |
|---|---|---|
| Halım düşvar, | tənim məcruh, | könlüm məğmum, |
| Nigah düşdüm, | bu möhnətə | mən bir məzlum |
| Ey dariğa, | atam Yəqub | qaldı məhrum, |
| Bundan sonra | bəni qaydan | görər imdi. |

Bu bənddə gördüyümüz "imdi" rədifi bütün bəndlərdə poemanın sonunadək gedir, təkrar olunur.

Poemanın bəndlərindəki əsas fikir üstündə qurulan üç misra bəzən qafiyə, bəzən də qafiyə və rədiflə işlənmişdir. Bu, hər şeydən əvvəl, ədəbiyyatımızda indiyə qədər davam edib gələn XII-XIII əsrlər şerimizin bədii zənginliyindən bir nümunədir, daha dürüst desək, Azərbaycan şeri həmin əsrlərdə belə bir səviyyədə formalaşmışdı; onun öz nizamı, möhkəm qayda-qanunu vardı; *qafiyəli, rədifli, vəznli, bölgülü, ölçülü-biçili, məzmun və forma vəhdətli klassik şeir idi.* Belə bir şeir ənənəsiz, uzun bir inkişaf yolu keçib gəlmədən bu səviyyəyə yüksələ bilməzdi.

Bu münasibətlə tariximizin dərinliklərinə bir nəzər salaq. Miladdan 7 yüz il əvvəl fars tayfaları Hind və Sind dərələrindən indiki İran adlanan əraziyə gələrkən, yerli əhali – turanlılarla (türklərlə) – la gedən savaşların birində yerli xalqların əfsanəvi qəhrəmanı Alp Ər Tonqa (Əfrasiyab) həlak olur. Böyük Nizami "Xosrov və Şirin" əsərinin "Məhinbanunun Şirinə nəsihəti" fəslində Məhinbanunun dili ilə iftixarla Əfrasiyabı xalqın ulu babası kimi yad edir:

Əgər Aydırsa o, biz də Afitabıq,
O Keyxosrovdursa, biz Əfrasiyabıq.

Şair Keyxosrovla Əfrasiyabı Ayla Günəş timsalında müqayisə edir. Məhz el arasında vaxtındaca bu Günəş haqqında bir çox sağı // sağu (matəm nəğməsi, mərsiyə, ağı) yazılır. Əsrlərdən bəri dildən-dilə, ağızdan-ağıza, nəsildən-nəslə keçib gələn həmin sağı // sağu, nəhayət, böyük Mahmud Qaşqarlının "Divani-lüğatit-türk" kitabında özünə yer tapır:

Alp Ər Tonqa öldimü?
İssiz azun qaldımu?
Özlək öçin aldımu?
İmdi yürək yırtılur.

***

"Qisseyi-Yusif" əhvalatı, onun məzmun və süjeti çoxdan bəri Şərq xalqları arasında yayılmışdır. Geniş şəkildə ona "Tövrat"da və "İncil"də rast gəlirik. "Quran"da isə "Sureyi-Yusif" adı ilə qısa şəkildə xatırlanır. Bu surə

"Quran"da "Əhsənül qisəs", yəni "Hekayətlərin ən gözəli" adlanır. İnsan həyatı, bəşəri hiss və duyğular, sədaqət, sevgi, səxavət, dözüm, ar-namus, ismət, ədəb-ərkan və s. ilə zəngin olduğu üçün bütün təfsirçilər də onu ən gözəl və həyati hekayət adlandırırlar. Məsələn, "Bəhrül-həqayiq"də deyilir: "Bu əsər ona görə gözəldir ki, insanın gerçək həyatına həsr olunub". Doğrudan da, surədəki bəzi əfsanəvi cəhətləri, məsələn, Yusif quyuya salınarkən, guya mələklərin göyərçin şəklində onun yanına gəlməsi, körpə uşağın dil açıb şahidlik etməsi, Züleyxanın yenidən cavanlaşması və s. hallar nəzərə alınmazsa, təfsirçilərin dediyi kimi, surə tam real insan həyatından söhbət açır.

Yusif əhvalatı, onun başına gələn macəralar hər cəhətdən bəşəri hisslərlə bağlı və insanlara doğma olduğu üçün geniş yayılmışdır. Azərbaycan klassikləri öz əsərlərində bu dastanın müxtəlif cəhətlərini bu və ya başqa məqsəd və münasibətlə xatırlamış, şeirlərinin bəzəyi etmişlər.

Bunlardan bir neçəsini yada salaq:

Nizami:

Hər gün parladıqca sübhün güzgüsü,
Doğardı Şərqin də Yusif üzlüsü.
Öz reyhan köksünə turuncu fələk
Qızıl bir turuncla verirdi bəzək.

Nəsimi:

Kənanı Yusifin ləbi-şirini buldum uş,
Fikr eylə kim, nə qəndi-şəkkərbarə düşmüşəm.

Kişvəri:

Gəlgil axır, ey nəsimi-kuyi-işrət, qandasan?
Müjdeyi-Yusif yetirgil Piri-Kənan ərzinə.

Xətai:

Mən ol Yəqubnisbət zar buldum,
Cəmalın Yusifi-Kənandır, ey dost!

Füzuli:

Bir qul oğlunu könül mülkünə soltan etdim,
Misridi, padşahın Yusifi-Kənan etdim.

Qövsi:

Kəm tutma binəvaləri, Yusifdən et qiyas,
Kim, ruzigar yaxşılara az baha verir.



Saib:

Viranə qıldı Kənanı göz yaşı Yəqubun
Heç ağ buludda bir belə əsla su olmayıb.

Nəbati:

Mərhəba, nami-xüda qüdrəti-yazdanə baxın,
Deyəsən, Misrə bu gün Yusifi-Kənan gəldi.

Ey xuda, sən bu Züleyxanın Əzizini xar qıl,
Saldırıb zindanə bir dustağı gözlər gözlərim.

Göründüyü kimi, Yusif macəraları ədəbiyyatımızda özünə çox geniş yer tutur. Şair və ədiblərimiz hərə öz məqsəd və istəyinə uyğun onun müəyyən cəhətindən faydalanmışdır. Nizami şərəf qazanmağı zəhmətdə görür, Qövsi zəmanəsində yaxşılara qiymət verilməsini Yusifin "az bahaya" satılması ilə müqayisə edir, bundan təəssüflə bədii obrazlar yaradır; Saib isə Yusifin başına gələn hadisələrin bir çox ibrətli və təsirli nümunələrini oxucuya təqdim edir.

Lakin şair Əli hamıdan qabaq həmin təsvirləri həyatda, hadisələrin gedişində surətlərin dili-danışığı ilə inandırıcı şəkildə vermiş, bu zaman sadəcə təsvirçilik yolu ilə getməmiş, ondan öz amalı, dünyagörüşü, ideyası, məqsədi yönündə ictimai-siyasi və tərbiyəvi nəticələr çıxarmağa çalışmış, ölməz və həmişə müasir bir dastan yaratmışdır. Şair Yusif surəsindən də bu mənada istifadə etmişdir (Müqayisə məqsədilə surəni əslindən tərcümə edib "Əlavələr" bölməsində kitaba daxil etdik; surəni gözdən keçirdikdə aydın olur ki, şair Əli süjeti oradan almış, lakin bədii söz qəlibində öz amal və istəklərini misralara düzmüş, hopdurmuşdur).

Yusif surəti rəvayət və deyimlərdə gözəllik, paklıq və dözüm, mərdlik, ağıl və tədbir, həsrət, göz yaşı, insaf və ədalət, ismət, namus və bir sıra başqa insani keyfiyyətlərin rəmzi kimi məşhurdur. Şair Əlinin əsərində bu xüsusiyyətlər yüksək qələmə alınmışdır.

Poemanın bədii xüsusiyyətlərinə və ənənə-məktəb məsələsinə gəlincə, o başdan-ayağa Azərbaycan milli şeir ənənəsinə bağlıdır. Bu barədə söz açmazdan əvvəl böyük müasirimiz və canlı klassik M.H.Şəhriyarın "Şərqdə şeir məktəblərinə dair" adlı yazısından bir yeri xatırlayaq: "İran ədəbiyyatında seçilən dörd əsas məktəb vardır. Birincisi, Nizami və ya Azərbaycan məktəbidir. Özünün uca dağlar diyarından, şöhrətli və qadir təbiətinin ehtişam və hökmranlığından ilham alan bu məktəb qədim tarixi mədəniyyətə malik əzəmətli hakimiyyətin və mədəni ictimaiyyətin səyilə yaranmış, incə ruhla və nəzakətlə birləşib vücuda gəlmişdir. Bunun nümunələri Nizaminin əsərləri və mənim "Gecənin əfsanəsi" poemamda müşahidə edilə bilər... Güman etmək olar ki, hind məktəbinin də əsası Azərbaycan məktəbi özülü üzərində

qurulubdur. Bu məktəb Saib Təbrizi və onun şagirdləri tərəfindən yaradılıb təşəkkül tapıbdır.

Qurban olum öz yarıma, onda nə desən var"[1]

Şair Əlinin "Qisseyi-Yusif"i məhz XII-XIII əsrlər "Nizami və ya Azərbaycan" şeir məktəbinin məhsuludur.

Biz böyük Nizami ilə şair Əlinin şəxsən görüşdüyünü və bir-birlərinin əsərlərini oxuduqlarını deyə bilmərik. Lakin istər yazılış, istərsə də təfəkkür tərzində bu iki şəxsiyyətin əsərlərində keçilməz yaxınlıq vardır. Nizami öz əsərlərində Tanrıya müraciətlə əsəri yazmaq üçün, necə deyərlər, qüdrət və ilham diləyir.

Təkcə "Xosrov və Şirin"in ilk səhifələrinə nəzər salaq:

Xudavənda, kömək et, dadə çat sən,
Nizamiyə gözəl bir yol yarat sən.
Sitayiş eyləməkdə pak könül ver,
Sənə tərif üçün bir odlu dil ver.
Ürəkdən pisliyi daim kənar et,
Həmişə xoş əməllə, haqla yad et.
Sinəmdə nurun ilə şam yandır.
Dili ağzımda mədhinlə dolandır.
Sinəm Davudi bir nəğməylə dolsun,
Zəburim Yer üzündə məşhur olsun.

Şair Əli:

Tofiq səndin umanurmən, bir zəif qul,
Dəlil sana tutanlara başruban yol,
Əgər tofiq verür isən, qüdrətin bol,
Bu bəndənə dəlilim sən olğıl imdi.

Və:

Bən zəifə hikmət butasın, sundurğıl,
Pəndi hikmət ayıtma sən qandurğıl.
Sudum içrə murad şəmi son yandurğıl,
Xatirimin sən münəvvər qılğıl imdi...

Və ya:

Tofiq vergil hikmət bitək qayıtmağa,
Aqil qullar xatirini bayıtmağa,
Yusif savçı əhvalını ayıtmağa,
Əqlim toluğ, dilim tatlığ qılğıl imdi.

[1] Divani-külliyati-Şəhriyar, Təbriz, 1347 (1968), s.60



Şübhəsiz ki, əsərin belə başlanğıcı o dövrdə ancaq məktəblə, ədəbi ənənə ilə bağlıdır.

Nizamidə olduğu kimi, şair Əlidə də qarşıya qoyulan məqsədlə əlaqədar ricətlər, haşiyələr, təsvir olunan hadisənin daxilində öz sözünü demək və s. tez-tez gözə çarpır. Hər iki şairin təsvir üsullarında da maraqlı yaxınlıq vardır. Müsbət və mənfi surətlərin daxili aləminin təsvirində, ümidsizlikdə ümid, yaxşılığın itməməsi və s. kimi bədii üsulların biri o birinin həmnəfəsidir. Əgər "Mahan" neçə-neçə bəlalardan qurtarıb, nəhayət, öz doğma yurduna qayıdırsa, "Xeyir və Şər"də Xeyir bir ovuc su üçün gözlərini itirib, sonra şahlıq məqamına yüksəlirsə, Əlinin Yusifi də quyudan, zindandan, xain qardaşların bıçağından xilas olub Misir padşahlığına yüksəlir, atasına, yurduna qayıdır. "Yeddi gözəl"də sarayların memar və nəqqaşlar tərəfindən bəzədilməsi "Qisseyi-Yusif"də dayəsinin tədbirilə Yusifi məftun və özünə tabe etmək xəyalilə Züleyxa tərəfindən xüsusi saray tikdirilib bəzədilməsi, mövzu və vəziyyətdən doğsa da, bir-birinə çox bənzəyir.

Azərbaycan ədəbiyyatı tarixinə Nizamidən sonra görkəmli ədəbi şəxsiyyət kimi şair Əli daxil olur. "Qisseyi-Yusif" poeması ilə Əli ana dilində Nizami ənənələrini davam və inkişaf etdirən ilk sənətkardır.

Sözün qüdrəti, insanın nitq-danışıq mədəniyyəti məsələsində Əli böyük müasiri Nizami ənənələrini özünəməxsus ədəbi səliqə ilə və yeni şəkildə davam və inkişaf etdirirdi.

Poemada öz bədii həllini tapan problemlərdən biri insanın insanlıq ləyaqətini təsdiq edən dili, gözəl danışığı, ağlı və kamalıdır. İnsan bu məziyyətlərlə şöhrət tapır, ucalır. Bu mənada Əli özünü Nizaminin ədəbi varisi kimi göstərir.

Nizaminin qələmilə Azərbaycan ədəbiyyatı tarixində şeirlə roman yazmaq ənənəsi yaranmışdı ki, ənənənin kökü möhkəm idi, qüdrətli idi.

Şair Əli Nizami ənənələri, Nizami arzuları və ideyalarından ilham alaraq öz sələfi və müasirini yaradıcı şəkildə, özü ilə onun arasındakı mənəvi yaxınlıq, xəlqi-milli xətt üzrə davam və inkişaf etdirmişdi. Nizami "Leyli və Məcnun" əsərində ana dilində yazmağın sənətkar üçün müqəddəs borc olduğuna işarə etmiş, poemanı fars və ya ərəb dilində yazmaq sifarişini alarkən ürək ağrısı ilə kədərlənmişdi. Nizami Şərqdə məşhur olan qədim "Leyli və Məcnun" dastanını ilk dəfə qələmə almış, sifarişlə onu fars dilində yazmışdı. Elə bil şair Əli müəlliminin dərdinə şərik çıxaraq Şərqdə məşhur olan başqa bir qədim "Yusif və Züleyxa" mövzusunu götürmüş, onu ana dilində və milli ölçüdə yazmışdı.

Hər iki əsərdə bir-birinə yaxın səhnələr, məsələnin bir-birinə oxşar bədii həlli nəzəri cəlb edir. Nizaminin Leylisi İbn Səlama ərə verilir. Ancaq o, ərini yaxınına buraxmır, bakirəliyini qoruyub saxlayır. Məcnuna sədaqət rəmzi olaraq belə də ölür. Əlinin Züleyxası da Misir Əzizinə ərə verilir. Ancaq heç

demə, bu, yuxuda ona "buta verilən" oğlan deyilmiş; Züleyxa aldanmışdı. Buna görə, ona yaxınlıq vermir, müxtəlif bəhanələrlə bakirəliyini qoruyub saxlayır. Əziz öz əcəli ilə ölür. Ancaq bundan sonra Züleyxa sevgisinə qovuşa bilir. Şair Züleyxa ilə Yusifin ər-arvad kimi ilk görüşünü də beləcə, ədəblə verir, xəlqi-milli əxlaq normalarını gözləyir.

Şair Əliyə qədər inkişaf edib gələn ana dilli şifahi, fars dilli yazılı ədəbiyyatımızın zəngin təcrübəsi vardı. Böyük müasirinin "Leyli və Məcnun" poemasından Əlinin xəbəri ola, ondan təsirlənə bilərdi. Bədii söz axtarışlarında o öz müasiri və müəllimi Nizamidən daha çox öyrənmişdi. Nizami yazırdı ki: "Söz dünyanın naxışıdır". Əli bədii yolla təsdiq edirdi ki, həm də "Söz insanın naxışıdır". Nizami yazırdı ki: "Söz kainatın şanı-şöhrətidir".

Əli bədii yolla təsdiq edirdi ki, həm də "Söz insanın şanı-şöhrətidir"... Nizami şeirlə poema-roman yazmaq ənənəsini yaratmışdı. Əli bu ənənə əsasında ana dilli şeirlə "Qisseyi-Yusif" poema-romanını yazmışdı.

Beləliklə, hələ öz sağlığında ana dilli ədəbiyyatda da Nizami təsiri genişlənir, Nizami ənənələri yaranır və inkişaf edirdi. Şair Əlidə bu təsir, bu ənənələr keçici olmayıb əhatəlidir, bir sıra problemlərin həllində özünü daha qabarıq göstərir. İnsan problemində – şəxsiyyətin azadlığı, insan hüququ və ləyaqətinin müdafiəsi və s. tərənnümündə şair Əli müəllimi Nizaminin ilk varisi və sədaqətli davamçısıdır.

"Qisseyi-Yusif" poemasının baş problemi insandır. Əsərdə pak və gözəl insani duyğular tərənnüm edilir: insan azadlığı, onun ləyaqəti, mənəvi təmizliyi, insanın daxili ilə zahiri gözəlliyinin vəhdəti ön plana çəkilərək, buna qarşı duran şər qüvvələr, paxıllıq və həsəd hissləri tənqid və ifşa olunur. Buna görə də poemada qoyulan və bədii həllini tapan məsələlər həmişə gərəkli və təzədir.

Bütün çətinliklərə, qul kimi alınıb-satılmağa, quyuya atılaraq ac-susuz qalmağa, "ilan-çıyan"la sirdaş olmağa və s. məruz qalsa da, Yusif insani ləyaqətini itirmir, get-gedə hörmət qazanır. Nəticədə, Yusif bir həqiqət – mənəvi saflıq və gözəllik rəmzi kimi yüksəlir, dünyada əbədi gözəllik və mənəvi paklıq rəmzinə çevrilir. "Həqiqət incələr, amma üzülməz" – əsərin leytmotivi budur.

Yusif Kənan ağıllıdır, insanlara münasibətdə ali hiss və duyğulara malikdir: o, mənəvi kamillik və zahiri gözəlliyin vəhdətindən yoğrulmuş insandır. Yusif çox müsibətlər çəkir, təhqir olunur və s. Lakin o, bütün bu əzab-əziyyətlərə dözür. Bununla belə, daxili insani duyğuları baş qaldırır, azadlığın, rahat nəfəs almağın nə qədər böyük nemət olduğunu duyur, dərk edir, qəfəsdəki quş kimi çırpınır, kədərlənir, anasının qəbri üstə gələrək, üzü üstə döşənir, dərdini ona söyləyir.

Ancaq o, qul olsa da, öz ağlı, dərrakəsi, səbri, təmkini ilə özünü hamıya sevdirir, heç kəs onun qul olduğuna inanmır. Yusif getdikcə ucalır, kamalı, əxlaq və rəftarı ilə insanları heyran qoyur. Bütün bu yüksək mənəvi keyfiyyətləri onu Misir padşahlığı taxtında əyləşdirir. O özünü ləyaqətli hökmdar kimi də göstərir.



Yusif ədalətli hökmdar kimi ağır vəziyyətdən çıxır; bir neçə il davam edən quraqlıq üzündən baş verən aclıq və kasadlıq illərində xəzinənin, taxıl anbarlarının ağzını açıb xalqa paylayır; öz ağlı, ədaləti ilə xalqın sevimli hökmdarı olur. Problemin bu şəkildə qoyuluşu və həlli Nizaminin "ədalətli şah axtarışları" probleminə çox uyğun gəlir.

Poemada Züleyxa ilə Yusifin eşq-məhəbbət təli orijinal qoyulur və inkişaf edir. Əsərdə qız oğlanı yuxuda görür və ona aşiq olur; qız öz eşqini oğlana elan edir, ona təriflər deyir. Bu isə hələ Nizamidən də qabaqkı – "yuxuda buta verilmək" kimi Azərbaycan folklorunun çox qədim ənənələrinin yazılı ədəbiyyata gətirilməsi, şifahi ədəbiyyatla yazılı ədəbiyyatın qarşılıqlı əlaqələrinin bərpası, təsdiqi və yenidən davamı idi. Nizamidə özünü güclü şəkildə göstərən bu folklor ənənələri şair Əli üçün də doğma idi. Poemada sevgi bəşəri səviyyəyə yüksəlir, sevmək, qıza eşq elan etmək tarixən ancaq oğlan tərəfilə bağlı insani keyifyyət kimi inkişaf edib gəlmişsə, oğlanın sevmək hüququna üstünlük verilmişsə, bu, tarixi ədalətsizlik deyilmi?! Nə üçün Züleyxa da "Məcnun kimi" sevə bilməsin, ancaq sevilsin?! Buna onun mənəvi haqqı, hüququ yoxmu? Züleyxa sevdiyinə, "quluna aşiq olduğuna" görə rəfiqələri, qonum-qonşu, el-gün:

> Züleyxa xatun quluna aşiq olmış,
> Quli müti olmamış, xəcil olmış

– deyə bunu "söz" edəyir, "rüsvayçılıq" sayırlar.

Sevib-sevilmək tarixən keçib gələn bir dərd idi. Əlidən 400 il sonra böyük Füzuli də buna öz münasibətini anasının Leyliyə etdiyi "tənələrdə" bildirmişdi:

> Neyçün sənə tənə edə bədgu?
> Namusuna layiq işmidir bu?..
> Sən qandanü eşq zövqü qandan?
> Sən qandanü dust şövqü qandan?
> Oğlan əcəb olmaz olsa aşiq,
> Aşiqlik işi qıza nə layiq?..

Züleyxanın öz quluna aşiq olması zamanına görə çox böyük cəsarət idi. Bu hadisə bütün Şərqi silkələyən qeyri-adi hadisəyə çevrilmişdi. Dövr, zaman bu hadisəni həzm edə bilməmişdi. Qədim Şərq xalqlarının ümumi dərdindən, kədərindən, fəryadından yaranan bu məşhur "qissə" – hekayət, onun dillərdə gəzən məzmunu azərbaycanlı şair-sənətkarın ürəyindən olmuş, öz sözünü demək üçün bu mövzunu qələmə almış, doğma türk dilinin cövhəri ilə yoğurmuşdu.

Problem öz-özlüyündə böyükdür, bəşəri mahiyyət daşıyır, Nizaminin qaldırdığı problemlər səviyyəsinə yüksəlir. Bu problem poemanın baş xəttinin mühüm bir qoludur və əsərdə layiqincə öz həllini tapır; hər iki tərəf – sevən qız və sevilən oğlan çox əzab-əziyyətə qatlaşır. Züleyxa öz eşqini Yusifə elan

edərkən Yusif duruxur, ehtiyat edir, təsvirlərin ümumi ahəng və məzmunundan anlaşılır ki, Yusif öz qul vəziyyətindən əziyyət çəkir, özünü Züleyxaya tay bilmir. Vaxt dolanır, Yusif azad olur. Öz ağlı, "fəzli" ilə Misir padşahlıq taxtında əyləşir. Züleyxa – Yusif məhəbbət teli yenidən təzələnir. Bu dəfə isə Züleyxa özünü Yusifə tay bilmir; çünki artıq hər şey əlindən çıxmış, gəncliyi, gözəlliyi də qalmamış, "qarı" olmuşdur.

Şair burada incə psixoloji vəziyyətdən istifadə edir: ağ gün adamı ağardar, qara gün qaraldar. Eşq odunun yenidən şölələnməsi Züleyxanın gözlərinə işıq gətirir, onun gəncliyini, təravətini, camalını və gözəlliyini özünə qaytarır. İndi onlar bir-birinə layiqdır, indi onlar bir-birinə qovuşa bilər. Nəticə etibarilə də məsələ müsbət həll olunur. Bizə belə gəlir ki, məsələnin bu şəkildə həlli azərbaycanlı müəllifin bədii kəşfi, əxlaq-etikasının bədii təsdiqi idi.

Beləliklə, şair Əli Azərbaycan ədəbiyyatı tarixinə Nizami ədəbi təsirilə ana dilində yazan Nizami ənənələrinin ilk doğma varisi kimi daxil olur.

"Qisseyi-Yusif" əsərini çapa hazırlarkən bir sıra çətinliklərlə üzləşdik. Əvvələn, əsər B-3422 №-li "Bakı" əlyazması və üç; V-2737, V-4233, V-3325 №-li "Leninqrad" əlyazma nüsxələri (bu əlyazmaların fotosurəti Nizami muzeyinin fondundadır) əsasında tərtib olunub. Lakin o, xatırladığımız dörd əlyazma üzrə yoxlanıb, necə deyərlər, "seçmə" yolu ilə bərpa edilib. Əsərin tərtib-bərpasına cəlb etdiyimiz həmin əlyazma nüsxələrinin keyfiyyətindən danışmaq lazım gəlir.

Bir daha xatırladaq ki, "Qisseyi-Yusif" yazıldıqdan sonra üzü dönə-dönə köçürülüb, yayılmışdı. Mirzələr və katiblər savadca, bilik və səliqəcə bir-birindən fərqləndiyinə görə, nüsxələrdə qarışıqlıq, çoxlu səhv və xətalar var. Köçürmələrdə bəzən bir nüsxədə müəyyən hissə tamam atılıb, başqasında bir fəslin yarısı yoxdur, üçüncüsündə bəndlər, beytlər düşüb və ya bir-birinə qarışıb fikir dolaşıqlığı yaradıb və s. Bəzən də misralar naqisdir. Görünür, katib köçürdüyü nüsxəni oxuya bilmədiyindən bir sözün və ya ifadənin üstündən keçib. Çox vaxt sözlər səhv oxunub, xüsusilə ərəb ifadələri, ayələr, eləcə də qədim söz və ifadələrimiz düzgün köçürülməyib. Beləcə, eyni söz və ya ifadənin bir neçə variantı alınıb ki, bu da mətnlərin məzmununda məntiqsizlik, fikir naqisliyi, anlaşılmazlıq törədib. Söz yox, əski əlifbada bir sıra hərfin eyni şəkildə olması, nöqtələr, saitlərin həmişə yazılmaması katibləri çaşdırmışdır.

Poemanı belə hala salan səbəblərdən biri də katiblərin əsərin vəzni və şerin ölçüsünü unutması olmuşdur. Deməli olar ki, nüsxələrin heç birində şairin seçdiyi vəznə və ölçüyə tam riayət edilməyib.

"Qisseyi-Yusif" Azərbaycan xalq şeiri üslubunda yazılıb, 12 hecalıdır, dördlüklədir. Misralardakı bölgülər 4-4-4-dür, yəni üç dəfə təkrar olunan 4 hecalıdır. Əlyazmalarda isə misranın biri 10, o biri 11, üçüncüsü 12 və ya 13 hecalıdır ki, bu da əsəri şeriyyətdən və bədiilikdən xeyli uzaq salmışdır.



Əlyazma nüsxələrinin xəttində də vahid prinsip yoxdur. Eyni nüsxədə, eyni fəsildə, hətta eyni bir bənddə təliq, nəstəliq, kəşidə, qubar və s. xətt növlərinə rast gəlirik.

Ümumi vəziyyəti təsəvvürə gətirmək üçün nümunə olaraq bir-iki bəndə nəzər salaq.

"Bakı" əlyazma nüsxəsində:

Məlik Doğar ehtiyat qıldı, aqil idi,
Yusifi qorqub anlara gerü verdi,
Anlar dirnəşib məsləhət eylə gördi,
Buna qul deyib bunlara satalım imdi.

Və:

Kənan eli yulaq qatı qızlıq idi,
Yəqub savçı oğlanlar həm buyurdı,
Aydur: Bizə darlıq əsər qıldı,
Aşlıq olu, Misrə varın imdi.

Birinci bəndin birinci misrası 13, ikinci misrası 12, üçüncüsü yenə 12 və dördüncüsü 13 hecalıdır. Təqti isə heç birində düz gəlmir.

İkinci bəndin birinci misrası 12, ikinci misrası 11, üçüncüsü 10 və dördüncüsü yenə 10 hecalıdır. Təqti isə ancaq birinci misrada düzdür.

Bəndlər o biri üç nüsxəyə əsasən və şerin ölçü-biçi qanununa uyğun olaraq tərtibdə belə bərpa edilib:

Məlik Doğar ehtiyatlı, aqil idi,
Qorqub, ana Yusifin gerü verdi,
Anlar danşıb məsləhəti eylə gördi,
Bunı, qul deb, biz satalım ana imdi.

Və:

Kənan eli yulaq qatı qıtlıq idi,
Yəqub savçı oğlanların həm buyurdı,
Aydur: Darlıq bizə yulaq əsər qıldı,
Aşlıq alun, Misrə varun, deyür imdi.

"Qisseyi-Yusif"in çapa hazırlanmasında istifadə etdiyimiz əlyazma nüsxələrin hamısında naqislik var. Məsələn, V-4233 №-li "Leninqrad" nüsxəsi "Yusifnin qardaşları yormanında" fəsli

Qardaşları ol saraya gəlib girdi,
Ol Rəvail yazuları anda gördi

– misraları ilə bitir. Halbuki bundan sonra 1042 misra vardır. Bundan əlavə, mətndə bəzən bir misra, bəzən bir beyt, bəzən də bir bənd çatışmır. Bu nüsxənin

sonunda orta əsrlər türk dilində nəsrlə bir dini risalə də verilib. Burada əsasən dini ehkamlar, qanunlar, dualar və s. toplanıb. Risalə dil-üslub baxımından maraqlıdır və oxunmağa, öyrənilməyə ehtiyacı var. Xatırladaq ki, eyni naqis-lik "Bakı" əlyazma nüsxəsinin əvvəlində də nəzərə çarpır. "Bakı" nüsxəsi

*Toquz qardaş ol Yusifə degər idi*
Yəhudəylə birlə dəva qılar imdi

– beytilə başlanır. Halbuki bundan əvvəl 221 beyt vardır. Bu, artıq katib "səliqəsi" deyildir; nüsxə əvvəlinin itməsi ilə əlaqədardır. Yenə bu nüsxədə "Yusif əleyhissəlamının şəhərə gəlib girməgində" fəsli ondan əvvəlki ilə qarışıb və birdən-birə 9 bənd atılıb. Ola bilsin ki, katib bunu özü ötürüb, bilərəkdən köçürməyib. Halbuki buna onun haqqı yox idi. Yaxud yenə həmin nüsxədə "Telmus qızı Züleyxanın yatuban duşında Yusif əleyhissəlanını görməsi" fəslində 4 bənd və aralarda beytlər, misralar "ixtisar" olunub və ya unudulub. Belə hallar o biri əlyazmalara da aiddir. Bütün bunları bərpa etmişik.

Poemanın vəzn və təqtilərinin bərpasında da nüsxələrin köməyi olub. Əsərdə *həm, ol, şol, şu, təklidək* və s. kimi ədatlar, köməkçi sözlər, əvəzliklər işlənib ki, nüsxənin birində var, o birində isə unudulub. Düzəliş nəzərdə tutulan misraya bunları əlavə etdikdə şeriyyət bərpa olunur və s.

Doğrudur, bu və ya digər səbəbdən bir söz, hətta misra oxunmaz olur, yaxud mətndən düşür. Belə hallarda mətnin digər misra və cümlələrinə uyğun şəkildə, çox ehtiyatla sözlər əlavə etmək mümkündür. Əlbəttə, bu, müəllif-tərtibçi mötərizəsində ( [ ] ) qeydə alınmalıdır. "Qisseyi-Yusif"də oxucular belə hallara bir-iki yerdə təsadüf edə bilərlər.

Oxuculara təqdim olunan bu kitabı sadəcə tərtib yox, tərtib-bərpa adlandırmaq daha düzgün olardı. Kitab 4940 misradır. Bunu poemanın mükəmməl çapı saymaq mümkündür. Biz uzaq dövrlərdə köçürülmüş, əldən-ələ, katibdən-katibə keçib gəlmiş əlyazmalar üzərində işləyib bu kitabı çapa hazırlarkən, mətnin əslini, dil və üslubunu eynilə saxlamağa çalışmışıq. Sözsüz ki, səhvlərə də yol verməmiş deyilik. Öz tənqidi qeydləri ilə, gələcəkdə əsərin daha mükəmməl və nöqsansız çıxacağına müsbət təsir göstərəcək hər kəsə irəlicədən minnətdarlığımızı bildiririk.

***Elməddin Əlibəyzadə***





# Qisseyi-Yusif



## BAŞLANĞIC

Əlhəmd, şükr həm sipaslər ol Əhədə,
Həm ol mülki-bizəvalə ol Səmədə,
Mülkət içrə bişərikə, ol əhədə,
Anı baqi, həm zülcəlal bildik imdi.

Andın sonra, anın dostı Məhəmmədə,
Peyğəmbərlər güzidəsi ol Əhmədə,
Qabiqovseyn məqamlı ol Məhəmmədə,
Anın üzrə telim durud olsun imdi.

Andın sonra, ol siddiqi – Sahibi – qar,
Ğarı içrə Mustafa tutdu anı yar,
Yar olmağa gəldilərsə, tutmadı ar,
Anın sidqi qamulardan artuq imdi.

Andın sonra, [həm ol] Ömər Xəttab oğlı
Aləm içrə məşhur idi anın ədli,
Yüz bin ərdən artuqraqdı anın fəzli,
Dörd bin, dörd yüz məscid bina qılmış imdi.

Andın sonra, əziz Osman şəhidi var,
Anın vəsfin Quran içrə ökdü Cabbar,
Zəhi, rüfət əta vermiş ana Qəffar,
Cəmi Quran xətü sözün düzmüş imdi.

Andın sonra, həşəm güzar Əli Kərrar,
Yüz min həzar əskər içrə siyasətvar.
Məşhurlıgi "La seyfə illa Zülfiqar,
Lafəta, illa Əli[1] Kərrar imdi.

---
[1] Zülfiqardan başqa qılınc, Əlidən başqa igid yoxdur.

Anın könli düşmüşü iki yigit,
Din-mürüvvət aykılası iki rəşid,
Biri Həsən, biri Hüseyn iki şəhid,
Şəbab əhli-cənnət anlar olsun imdi.

Andın sonra, ol ixtiyar ərənlərə,
Həq Həbibi Mustafanı görənlərə,
Heç əksiksiz otuz üç min ərənlərə,
Barçasına müqtəda bulalım imdi.

Andın sonra, xüləfayi – Rəşdinlərə,
Üləmai-şühəda ol tabeinlərə,
Övliyai-ətqiya həm irənlərə,
Cümləsindən xaliq razı olsun imdi.

Andın sonra, bir ər qobmış elm kani,
Anın birlə müzəyyən bu islam dini,
Zahir-əyan bilürmüsiz sizlər anı
Sabit oğlı Neman ana derlər imdi.

Andın sonra, din sərvəri imamlara,
İmam-ərkan islam nurı hümamlara,
Həqqə olar hümmətləri tamamlara,
Hazaran afərin anlara olsun imdi.

Allahummə, rəhmanıma sığınmanmu?
Rəhmətindən məğfirunlar ummanmanmu?
Sübhanimdən mudyarı dolanmayınmu?
Murad hasil qılmaq ana kənəs imdi?

Mövlasına sığınurmən mən bir zəif,
Tofiq səndən umanur mən, mən bir nəhif,
Xatirimni rövşən qılğıl edim lətif,
Fəzlin birlə mənə xeyir vergil imdi.

Tofiq səndin umanurmən, bir zəif qul,
Dəlil sana tutanlara başruban yol,
Əgər tofiq verür isən, qüdrətin bol
Bu bəndənə dəlilim səp olğıl imdi.



Bən zəifə hikmət butasın sundurğıl,
Pəndi hikmət ayıtma sən qandurğıl,
Sudum içrə murad şəmi sən yandurğıl,
Xatirimni sən münəvvər qılğıl imdi.

Könülümdən ğəmi-nəhim savı vergil,
Fəzlin birlə pəndü hikmət tavı vergil,
Mən zəifə ilham tofiq qavı vergil,
Qüdrətin var, "ol" dedügin olur imdi.

Xatirimdən səhvimilə soyu vergil,
Könlüm içrə rəhmət səna suçu vergil,
Bən zəifə tofiq qapusın açu vergil,
Əqlim səhih, dilim fəsih qılğıl imdi.

Tofiq vergil hikmət bitək qayıtmağa,
Aqil qullar xatirini bayıtmağa,
Yusif savçı əhvalını ayıtmağa,
Əqlim toluğ, dilim tatlıq qılğıl imdi.

Yusif içrə nətək əhval gəldügini,
Qardaşları Yusifə nə qılduğını,
Misir içrə uluq məlik olduğını,
Nəzm birlə ayıdalım, anlatğıl imdi.

Cahan içrə qopmış idi Yusif nəbi,
Ol atası Yəqub nəbi həq həbibi,
Dədəsi həm İshaq savçı din təbibi,
Rəbbi-Xəlil İbrahimə çığar imdi.

Bundan sonra hikmət bitə keçi sərvən,
Güli-reyhan, dürri-mərcan seçi sərvən,
Yusif nəbi əhvalını açı sərvən,
Möminlərə nefidürür, anlan imdi.

Qissələrdə, hikmətlərdə görklüraqı,
Usanmadan dinlənməğə datluraqı,
Kitab içrə bişək anın, məşhurlıqı,
Uşbu qissə anın irdi zahir imdi.

*FƏSL*

## YUSİF ƏLEYHİSSƏLAMNIN DUŞ GÖRMƏGİNDƏ TURUR

Əziz Yusif tamam on bir yaşar idi,
Yəqub puçı uyluqında uyur idi,
Uyur ikən bir əcayib uyqu gördi,
Təvilini atasından sorar imdi.

Toğarı gün tolunı ay, on bir yulduz,
Duşum içrə səcdə qıldı bana sansız.
Uşbu duşnı bəylə gördüm heç gümansız,
Aya ata, bana təvil qılğıl imdi.

Bu duşumnın təvilini qılu vergil,
Aqibəti nə bulasan, bilü vergil,
Bu duşıma görklü təvil olu vergil,
Bu duş içrə edkü saqınc sayqıl imdi.

Məşhur durur ayatında ol Cəbbardan,
Bir cühud var, adı isə anın Bustan.
Sual sordı həm ol cuhud həq rəsuldan
Dürüst cavab, həm səhih söz istər imdi.

Ya Məhəmməd, ol duşu ki, Yusif gördi,
Ay-gün, on bir yulduz ana səcdə qıldı,
Ol yulduzlar adları da nətək idi?
Birər-birər bana elam qılğıl imdi.

Əgər sən həq rəsulu həm olur irsən,
Möcüzənin dəvasını qılur irsən,
On bir yulduz atlarını bilur irsən,
Həqiqətin nübüvvəti sənin imdi.

Andın Rəsul təfəkkürü üzrə buldı,
Böyük Xızır həman dəmdə hazır gəldi.
Ol Əbəddən Məhəmmədə salam qıldı,
Yulduzların adın elam qılur imdi.



Məhəmməd der: Aya cuhud, aya Bustan!
Aydurirsəm imdi sana cümlə nişan,
İnanuban bulurmusan sən müsəlman?
Cuhudluqdan bezar olub döngil imdi.

Ol cuhudsa belə qəvlə razı oldı,
Məhəmməd ol yulduzları elam qıldı.
Cuhud anı eşitübən təsdiq buldı,
Fəsih dilnən səhih iman gəltür imdi.

Rəsul aydur: Əvvəl yulduz Bəyran idi,
Ol ikinci yulduz adı Təryan idi.
Həm üçüncü yulduz adı Rüyyan idi,
Dördincisi, yulduz adı Kənan imdi.

Beşincisi, yulduz adı Qabit idi,
Altıncısı, yulduz adı Sabit idi.
Yetincisi, yulduz adı Əmud idi.
Səkkizinci yulduz adı Səhih imdi.

Toqızıncı yulduz adı Sınığ idi.
Onuncı həm yulduz adı Qanığ idi.
On birinci yulduz adı Sonuğ idi.
Cümləsini səhih bəyan qıldı imdi.

*FƏSL*

## DUŞ YORMANIN BƏYANI TURUR

Andın Yəqub Yusifinin duşın yordı
Təvilini ol mübarək aydur irdi.
Ümiddür kim, muna səndən məded gördi,
Sana izzət, həm rüfət gömür imdi.

Ümiddür kim, sana xaliq verə mülkət,
Fəzli birlə ruzi qıla öküş nemət.
Qardaşların kob qılalar sana hizmət
On birisi sana hizmət qılur imdi.

Aləm içrə sənin adın məşhur ola,
Məşriq, məğrib uluğları səni bilə,
Qiyamətən dəxi adın baqi qala,
Xəlil səhih dönəltili görnür imdi.

Nübüvvət, həm sən risalət buldaçısan,
İyəsisən həm məmləkət buldaçısan,
Rahətlığı sən bəşarət buldaçısan.
Dünya, üqba dönəliti görnür imdi.

Aya Yusif, inanqılqıl bu gəz bana,
Bu duş içrə səltonəti görnür sana,
Həmd-səna telim ayğıl sübhanına,
Sübhan sana telim ehsan qıla imdi.

Vəleykin sən əmanət bil bunı, oğul,
Bu duşunnu qardaşlarına ayıtmağıl,
Anlar sana kin qılmasun, sən saqlanqıl,
Adəminə şeytan düşmən olur imdi.

Gərəkiməz uşbu röyan zahir ola,
Qardaşların bu mənidən əhval bilə,
Bu iş içrə anlar sana həsəd qıla,
İbtidası bizə möhnət ola imdi.

Bu pəndimni sən anlağıl, aya oğul,
Bu razımı qamulardan giz, saqlağıl,
Bu duşunnı heç kimsəyə ayıtmağıl,
Uşbu sirni xaliq bilsə yekrok imdi.

Var idi ol Yoqubnın bir ökük qızı,
Ol eşitmiş bu aykıdan uşbu sözi,
Qovçulardan saqılasun xaliq sizi!
Varubanı qardaşlarna aytur imdi.

"Qardaşınız Yusif bayıq bir duş görmüş,
On bir yulduz, Ay, Gün ana səcdə qılmış.
Atanız ol duşnı anun edkü yormış,
Bən eşitdim, görklü təvil qıldı imdi".



Qardaşları anı eşitüb keyd qıldı,
Həsədləri, keydləri qalib oldı.
Cümləsinin xatirinə qüssə doldı,
Dirnəşübən batil tədbir qılur imdi.

Əgər ol duş yerinəyə gəlür irsə,
Yusif uluğ bir padişah olur irsə,
Barıçamız ana hizmət qılur irsə,
Ol bizlərə qatı ardur, derlər imdi.

Ol Yusifi qatımıza ündəyəlim,
Nə duş görmüş, sorayalım, izləyəlim,
Ana layiq rəy-tədbir eyləyəlim,
Bu əhvalı biz həqiqət bilək imdi.

Aldayuban ol Yusifin gəltürdilər,
On qardaşlar yığlaşuban olturdılar,
Təvazölər, təməllüqlər göltürdilər,
Nə duş gördün, bizə ayğıl, derlər imdi.

Yusif duşnı anılara aytur verməz,
Ata qövlün sındırmağa rəva görməz.
Yoq deyübən yalğan dəği söyləyüməz,
Bunun üzrə əcayibə qalur imdi.

On qardaşı qamuları ura durdı,
Yekin-yekin Yusifəyə yenə sordı.
Qamuları Yusifəyə çoq yalvardı,
Hər birisi təvazölıq qılur imdi.

Gördükün duşı sən bizdən pünhan qılma,
Dəği içrə, saqınc içrə heyran qılma.
Eya qardaş, sən bizləri düşman qılma
Nə təvil ki, qıldı, razının ayğıl imdi.

Qardaşları xatirini duyumadı,
Razın gizləb ayrısı söz deyümədi,
Siddiq aydı, yalanı söz ayumadı,
Naçar olub, sirrin əyan qılur imdi.

Anı eşdüb bayağı tək olmadılar,
Yusifiyə hərgiz anlar yılmadılar,
Yusif duşun görütüyü bilmədilər,
Həqiqəti bu söz qələt, derlər imdi.

Gəl varalım, atamızdan solayalım,
Yusifini atamızdan diləyəlim.
Alıb iltüb bir dürlü iş iləyəlim
Öldürübən iraqığa ataq imdi.

Ol atamız anı bizdən artuq sevər,
Anın yuzin görimәki yuvlaq öyər.
İnanc verso ana bizdən artuq tövər
Anı bizdən iki artuq sevər imdi.

Gəlitdilər, salam, xidmət eylədilər,
Müşviqini rəva görüb söylədilər,
İsraildən Yusifini dilədilər,
Bizim ilə belə varsun, derlər imdi.

Aya baba, Yusif bizlə belə varsun,
Qoy qatında bizim ilə belə yorsun,
Fəhmi artsun, xatirisə rövşən olsun,
Gecə yenə xidmətinə gəlsün imdi.

Əlvan yerlər, akar suvlar cümlə görsün,
Hezərlərdən, rozələrdən çiçək dersün,
Gördügündən gəlib sana xəbər versün,
Sən dinləğıl, ol sözləsün, derlər imdi.

Yəqub anı eşidübən saqınc sandı,
Qüssə birlə qızığudan bağrı yandı.
Kəndusi bir duşı gördi, anı andı,
Yusifinə hərgiz dəstur vermoz imdi.

Yəqub aydur: Bü tünüyə bir duş gördüm,
Duşım içrə on bir quzı görər irdim,
Saqlar irkən birisüni yavuq qıldım,
Həqiqəti, qolumdan qurt qapar imdi.



Anlar aydur: Yusifi biz saqlayavuz,
Qardaşımız qaçan qurda qapduravuz?
Zalim qurdu qovarağuz, öldürəvüz,
Dükgəl, anlar Yusif üçün, derlər imdi.

Yəqub aydur: Olar eylə yarmaz irmiş.
Ol Yusifim sizin iylə varmaz irmiş.
Ol işi həm özmə rəva görməz irmiş.
Yusifimsiz könlüm qərar qılmaz imdi.

Anlar bu gəz Yusifiyi aldadilər,
Atamızdan səni dəstur alduq, derlər,
Bizim ilə tamaşaya yakıl derlər,
Rozələrdə dürlü quşlar qonar imdi.

Yusif aytur: Aya ata, dəstur versən,
Ağalarım birlə qatna birgə varsam,
Təfərrüc məqamlarını gözdən görsəm,
Gecə yenə hizmətinə gəlsəm imdi.

İsrail ol Yusifinə dəstur verməz,
Ayrulub, bir dəm qalmağa rəva görməz.
Bu məğbunın könli qopdı, ovudurmaz,
Boyununa sallanuban yalvar imdi.

"İza caəl-qəza amiyəl-bəsər"[1]
Qəza gəlsə, bəsarət də quldan getər.
Allah hökmi olursa, qul kim netər?
Labuddür ol anın hökmi olur imdi.

Yarlı Yəqub bu tədbirə razı oldı,
Yusifini verimәkə iqrar qıldı.
Oğlanları birlə möhkəm vədə buldı,
Yanındası bilə varsun, deyür imdi.

Yanındası bilə olub iletyəsiz,
Yusifini növbətləşü götürəsiz,

[1] Qəza gələndə göz bağlanır.

Hərəm birlə xoş nigarlar göstərəsiz,
Nəfsi, arı, könli şadkam olsun imdi.

İsrailin sözni eştüb sözləşdilər,
On qarındaş olturuban bağlaşdılar,
Yusifini öldürəlim, anlaşdılar,
Qüssəsindən qurtulalım, derlər imdi.

Sonra dönüb atamıza əgləyəlim,
Qalduğımız məsiyətgə söyləyəlim.
Andın sonra müdam taət eyləyəlim,
Töbəmizni səvab qəbul qıla imdi.

Ol tün keçdi, yarındası ertə buldı,
On qardaşlar ələssəbah ura durdı,
Cümlə gəlüb İsrailə salam qıldı,
Eykü sözün Yusifiyə derlər imdi.

Anı eştib Yəqub nəbi, varsun, dedi,
Könli darğub yığılayu evə girdi.
Kəndü əlin Yusifinin başın yuvdı,
Darayuban uzun saçın örər imdi.

Aş yedirdi, kəndusiyə suv içirdi,
Əkinəsə dürlü-dürlü ton geyürdi,
Ol tonunu yanar birlə süsləndirdi,
Gözlərinə sürmə dəği tartar imdi.

İbrahimin əmmaməsin başna urdı,
İshaq savçı kəmərini quşandurdı,
Dədə İshaq zənbilinə azuq qoydı,
Bardoğına suvın dəği qoyar imdi.

Göndürürdi Yusifini öbə-quca,
İsmarladı hər birinə ucdan-uca,
Ertə gəlün sizlər dəği uşbu gecə,
Ah, ol gecə qaçan gələ, deyür imdi.



Yəqub aydur: Sözüm barca anlayasız,
Yusifini növbətləşü sanlayasız,
Cümləniz uyku yatmarsız, qılasız,
Yoqsa, Yusif sizin ilə varmaz imdi.

Anlar aydı: Qəbul qılduq barça sözin,
Ğəmkin olman yalğurluqdan bu gün özin,
Tamaşamız, Yusif olsun bu gün bizim,
Gün batmazdan xidmətinə gəlsün imdi.

Yəqub anda yolı üzrə ötrü qaldı,
Yusifni götürüb anlar yola saldı,
Cümələri sevinişüb alub bardı,
Denə, miskin ağılayu yügrür imdi.

Yəqub aydur: Aya qızım, qança varsan?
Nə mənidən ağlayuban yükürürsən!
Təcil birlə Yusifiğə yetərürsən!
Qardaşları tamaşaya iltər imdi.

Denə, miskin dönimədin yükrüb yetdi.
Yetübəni Yusif əlin möhkəm tutdı.
Ya Yusifim, yetükibən döngil, aytdı,
Qardaşları qıra dönüb yapşar imdi.

Yarlı denə ağılayu gerü getməz,
Qardaşları puşdığunu heç eşitməz,
Bərk tutdı Yusifinin əlin qoməz,
Ya Yusifim, barma deyü yalvar imdi.

Ol Yusifi əginlərnə götürdilər,
Bir qaçanı yıraq yerə yetirdilər,
Yarlı Yəqub baqa qaldı, öntürdilər,
Deynə dəği ağılayu dönər imdi.

Deyn gəlib Yəqubca aydı: Yatur irdim,
Uyğumda bir duşu gördüm, ura durdum,
Yatıban, bən ol duşımda on qurt gördim,
Yusifni əlimizdən qapdılar imdi.

Yəqubın duşnı eşidübən məhzun oldı,
Haman dəmdə ğüssə birlə bənzi soldı,
Yusifinin barmakından peşman qıldı,
İkiləsi ol gənc ilə ağlar imdi.

Anlar bir qaş Yusifini aşurdılar,
Qaşa anğac iltib yerə düşürdilər,
Azuqını itə verib yedürdilər,
Bardoğından suvın yerə dökər imdi.

Yarlı Yusif yanlarınca yayaq yıldı.
Qardaşları qəsd qıldığın bəyan bildi.
Həqiqəti anılardan güman qıldı,
Şəklənübən əhvalların sorar imdi.

Yusif aydur: Ya qardaşlar, ümuqlarım,
Neşə belə qılduğınız, uluqlarım?
Neşə belə edərisiz qumuqlarım?
Bən sizlərə nə suç qıldım, deyür imdi.

Anlar aydur: Sən yalan duş görüdükin,
Atamıza ol duşını yorındığın,
Yalan duşla kənduzinni sevdirdikin,
Bu gün anın bədi tutur, bilgil imdi.

Yarlı Yusif ağlayuban ardum, deyür,
Susuzluqdan yıvlaq zəif oldum deyür.
Ayaqlarım ağrıdığı qaldım deyür,
Qardaşları, heç kiminə baqmaz imdi.

Bu gün sana asıq qılmaz arıdığın
Öz duşunnı atamıza yorıdığın,
Kənduzini bizdən yekrək sevirdikin,
Bu gün sana anın məkri dəgdi imdi.

Şəmun durub imdı ana qarşı səkər,
Rəvail həm tutubanı saçnı çəkər,
Yavuzları qəsd qılur andın bətər.
Hər birisi bir dürlü qəsd qılur imdi.



Saçın çəküb həm Rəvail yerə sürər,
Kəltürün də Yusifi öltürün, deyər,
Denə aytur: Əsirgəmin, yetrün, degər,
Şərt qılıuban ikiləsi urar imdi.

Oluq saat hazır gəldi ləin iblis,
Bu iş isrə qılu girdi məkrü təlbis.
Bu on qardaş niyyət qıldı bayıq xəsis,
Cümləsini batil yola tartar imdi.

Bu yalançı oğlanı öldürün, deyir,
Oşal yalan duş təbirin yetrün, deyir.
Yalançılıq cəzasın bildirün deyir,
Bidət üzrə rəy-tədbir qılur imdi.

Bunu eşdüb bular dəği bətər buldı,
Tədbirləri Yusif üzrə ğalib oldı,
Yusif bu göz halı nəymiş bayıq bildi,
Tatlu candın bayıq ümüd kəsər imdi.

Yusif aydur: Bayıq bana qıydınızmu?
Ləin şeytan sözlərinə uydunuzmu?
Bənim yaxşı canımı siz duydunuzmu?!
Qardaşlığı kəsdinizmi bəndən imdi?!

Qəsd qıldunuz, bayıq məni öldürəsiz,
Tolun ay tək nurlu yüzüm soldırasız,
Atamıza əhval netək bildürəsiz?
Sorar irsə cavab vermək gərək imdi?

Məhrum, məhzun qoyarsınız İsraili,
Həsəd birlə göydürərsiz ol zəlili,
Ey qardaşlar, görməzmisiz ol Cəlili?
Uşbu işi Cəlil rəva görməz imdi.

Halım düşvar, tənim məcruh, könlüm məğmum,
Nagah tüşdüm bu möhnətə mən bir məzlum,
Ey dariğa, atam Yəqub, qaldı məhrum.
Bundan sonra bəni qaydan görər imdi?

Özüm sadiq, atam Yequb, dədəm İshaq
Qardaşlarım cəfasından təqətim taq!
Onulası qəsd qıldılar, buldular aq!
Qamuları qəsd qıldılar, maña imdi.

Bunı eşdüb Şəmun yulaq vara buldı,
Puçaq tartub Yusif üzrə hazır gəldi,
Tez boğazlıb ana ol dəm həmlə qıldı,
Anı görüb Yusif qəbqəh gülər imdi.

Şəmun aydur: Aya Yusif, nedən güldün?
Yiti puçaq görübənü şadkam oldun?!
Mundan-ondan nöhə zarı telim qıldun?!
Bu kömləknin öslün elam qılğıl imdi.

Yusif aydur: Uluğlarım, bənsə güldüm,
Övdə ikən mən bir saqınc qiyas qıldım,
Mundan-ondan nöhə zarı telim qıldun?
Qul todbiri hərgiz rəva olmaz imdi.

Dedim imdi: Benim bu on törənlerim,
Onı zərif, onı şərif erənlerim,
Hazır ikən bənimki bu örənlərim,
Qanğı düşmən bəni qıya, dedüm imdi.

Ah, bana uş qatığ düşmən siz oldunuz,
Betər birlə ağır cəfa siz qıldunuz,
Axır, bəndən cürm-xəta nə buldunuz?
Bu ibrəti dünləməğə yarar imdi?

Övdə ikən mən bir saqınc qıldum idi,
Bu iş içrə sizdən güvənc qıldum idi,
Yenə dönüb ol saqıncda qaldum idi,
Qardaşlarım qaçan qıya, dedüm imdi.

Bu dəm bana ol gümanım gəldi bayıq,
Əndamlarım cümlə məcruh, rəngim qatığ,
Salehlərə uş belə iş olmaz layiq,
Uşbu işni işləməzlik yekrək imdi.



Sizlər anı məsləhəti görərirsə,
Bən ölübə murad hasil olurırsa,
Əgər mənim min-min canım bulurırsa,
Cümləsini sizgə fəda qıldım imdi.

Bu sözinə Yəhudənin mehri gəldi,
Rəhim odı qayınadı, bağrı yıldı,
Batil işdən gerü dönüb töbə qıldı,
"Latəqtülü"[1], ol Yusifni deyür imdi.

Qardaşlığın şəfqətini zahir qıldı,
Sevinibən Yusifinin əlin aldı,
Ətəkinin altına uş sığındırdı,
Qardaşları öfkəsindən saqlar imdi.

Yarlı Yusif Yəhudədən müşfiq gördi,
Xaliq anı Yusifəyə mədəd verdi.
Toquz qardaş ol Yusifə dögər idi,
Yəhudəylə birlə dəva qılar imdi.

Ey Yəhudə, əhdimizdən neçük qaldun?
Nə mənidən andımızı saqıt qıldun?
Ol Yusifi əsirgədün, müşviq oldun?
Vədinə xilaf qılursan, derlər imdi.

Yəhudə ayıdur: bu iş rəva olmaz,
Həm qarındaş qarındaşnı heç öldürməz!
Bunı qılan xaliqidən rəhmət bulmaz,
Yekrək oldur, tövbə qılıb dönin imdi!

Ol Tanrıdan qorqın, batil əməl qılmın!
Axirətdə vəbal durur, asi olmın!
Uçmax verüb, tamuğ odın satun almın!
Tamuğ içrə baqi, qalman, sizlər imdi.

Uşbu işni, ey qardaşlar, siz qılusız,
Bu iş ilə atanıza aq olusız,

[1] Öldürməyin.

Bayıq mövla rəhmətindən ayrulusız
Rücu qılıb həm istiğfar, edün imdi.

Bunın uluğ dədəsi ol məruf Xəlil,
Oda atdı anı da ol Namrud – cahil,
Otun içrə saqıladı anı Cəlil,
Xəlil üçün odı bustan qıldı imdi.

Andan sonra vəhy elədi yenə Cəlil,
İbrahimə Cəlil aydı: əya Xəlil!
Bənim üçün oğulunı qurban qılğıl!
Dilədisə sevdigini, deyür imdi.

Yenə bıçaq İsmailə kar qılmadı,
Həm Xəlilə od da yaqın heç gəlmədi,
Yəqub hərgiz ol Tanrıya aq olmadı,
Sizlər doği ol Tanrıdan qorqın imdi!

Yəhudənin sözin anlar anğımazlar,
Həm istiğfar tövbəyə heç bağımazlar.
Axirətin əzabından heç qorğımazlar,
Cümləlori Yusifə qəsd qılur imdi.

Bəs Yəhudə hərgiz dərman olumadı,
Anları həm ögütlüb mən qılmadı,
Həm Yusifi əllərindən alumadı,
Neçar olub ayruqsı rəy qılur imdi.

Ol Yəhudə öldürüben yetirmun, der,
Qardaşınız qanını siz götürmun, der.
Heç yoq irsə, bir quyuya buraqın, der,
Ya ölə, ya qıraqığa düşə imdi.

Bu gəlacı anlarığa səvab gəldi,
Cümləlori bu tədbirə razı oldı.
Qamu anın tədbirini rəva gördi,
Yarlı Yusif, böylə deyü, yalvar imdi.





## YUSİF ƏLEYHİSSƏLAMNI QUYUĞA SALMAĞININ BƏYANI

Ol Yusifin belinə bəs yib tağdılar,
Kəndulərin mehrinə həm ot yaqdılar,
Quyu içrə salmağa həm yıqdılar,
Qanqısına yalvarursa, puşar imdi.

Yusif aydur: Hərgiz sizə suç qılmadım,
Bunın kibi ayruqısı duş bulmadım,
Bundan sonra bən uğultu heç olmadım.
Yarlı Yusif beylə teyü ağlar imdi.

Anlar Yusif zarinə heç uymadılar,
Həsrətilə yalvardığın duymadılar,
Yəhudənin pəndini həm saymadılar,
Cümləlori dura-qıba buşar imdi.

Ol Yusifi soyurayu gətirdilər,
Ad quyusı başağına yetürdilər,
Yarlı Yusif baka qaldı, iltirdülər,
Qardaşları heçnəsinə baqmaz imdi.

Yusif aydur: Ya qardaşlar, buna qıymun!
Şeytan söznə gümrah olub ana uymun!
Bənim üzüm giryan qalıb donım soymun!
Ata həqqin, qardaş mehrin saqlan imdi.

Bu gün öləm, qanı bana kəfən gərək,
Ah dariğa, kəfən olsun uşbu kömlək,
Zəhi, əcəb sovuq bağrı, qatı yürək,
Kömləkini əginindən soylar imdi.

Belinə bir yib tağıyıb kəndürdilər,
Yusifi ol dar quyuya endürdilər,
Şəfqət kesib yüzlərini döndürdilər,
Biri gəlib arqanını kəsər imdi.

Yusif aydur: "İlahünə, kərim, hənnan!"[1]
Biçarələr ümidi həm rəhim, mənnan[2],
Heç ümidim qalmadı ixvanımdan,
Bana mədəd özün qılğıl, deyür imdi!

Anı eşdüb qardaşları ağlaşdılar,
Cümlələri xaliqiğə çuğlaşdılar,
Qamuları cəm oluban dirnəşdilər,
İlahüna, mədəd səndən, derlər imdi.

Oluğ quyu ol Aşnudan qalmış idi,
Anın adı Ad kaburı olmış idi.
Dibi viran, suvu yulaq acış idi,
Anın suyın hеç kimsənə içməz imdi.

Dura-dura anın suvı üstün gəlmiş,
Yılan-çayan cümlə anda məqam qılmış,
Həşəratlar cümləlөri anda olmış,
Telim dürlü həşəratlar anda imdi.

Ol vəqtdə bir peyğəmbər gəlmiş idi,
Kitab içrə Yusif vəsfin bilmiş idi,
Qamulara anı məlum qılmış idi,
Eşidənlər əcayibə qalur imdi.

Ol zahid bu əhvalatı bəyan bıldı,
Həm ol zahid xalıqığa dua qıldı,
Ol Yusifi görümөgə arzıladı,
Mövlasından uzun ömür dilər imdi.

Ol zahidnin duaları qəbul oldı,
Xaliq ana uzun ömür əta qıldı,
Xaliqidən peyğəmbərlıq vəhyi gəldi,
Ol zahidə həm Yəhudə derləm imdi.

Xaliq ana peyğəmbərlıq vergil, dedi:
Varğıl, ol Ad quyusuna girgil, dedi,

---
[1] Ey mənim Tanrım, kərəm sahibi, kömək edən.
[2] Rəhm eləyən, böyük.



Siddiq Yusif cəmalını görgil, dedi,
Yusif anda gələcəkin görtür imdi.

Gəldi girdi həm ol zahid ol quyuya,
Əlәddəvam taət qıldı ol uluya,
Taət içrə dua qıldı həm mövlaya,
Ol Yusifi görmək dilər zahid imdi.

Hər gecədə ana azuq bir nar idi,
Önündə həm nurdan qəndil yanar idi,
Anın, ömri bin iki yüz olar idi,
Aqibət, ol Yusifini gördi imdi.

Dərmandələr dəstkiri Məlik Rəhman,
Fəzli birlə Cəbrailkə qıldı fərman.
Yə Cəbrail, ol Yusifə qılğıl dərman,
Həm risalət, bəşarəti kəltür imdi.

Ol tavus tək Məlaiki peyki-həzrət,
Qadir ana əta qılmış qutlı qüvvət,
Qoşubikən tüşti ora oluq saət,
Yusif suva yetişməzdin tutar imdi.

Bəs Cəbrail aydur ana: Aya, Siddiq,
Mövla sana səlam qıldı bilgil təhqiq,
Muştılarmən, ruzi qıldı peyğəmbərliq,
Həm risılət, məbarək olsun imdi.

Yusif, qaçan Cəbraili gördi isə,
Ol Cəbrail erdügüni bildi isə,
Həqnin səlam dürudini aldı isə,
Məğmum könül şadkam oldı gündi imdi.

Ol quyunın qırağında bir taş vardı,
Cəbrail ol taşnı ora tez apardı,
Suvun üzrə həm ol taşnı möhkəm tardı,
Yusif gəlüb ol taş üzrə olur imdi.

Taş Yusifə həl irdən də yumşaq oldı,
Xəliqidən inayətlə şəfqət buldı,
Həm Yusifin nuri ilə quyu doldı,
Tışqaru həm nur balquya çıqar imdi.

[Ol] Cəlildən Cəbrailə dəstur oldı,
Həm Cəbrail uçmaq taba səfər qıldı,
Uçmaqıdan hillə, təam alıb getdi,
Hillə geyib, Yusif təam yeyor imdi.

Hillə geydi, təam yedi, şükür qıldı,
Cəmalinə həzar çəndən nur da gəldi,
Cəbrailə nurı anın məlhüz oldı,
Yerdən kökə nurı tikrək oldı imdi.

Bəs ol zahid məqamında ura durdı,
Yusifinin cəmalını gözi gördi,
Telim yılğa muradına ol da irdi,
Görüşübən şükr-sana qılır imdi.

Zahid aydur: Aya, Yusif, qayğurmagil,
Qardaşlardan könlini sən ayırmagil.
Anlara həm yavuz dua eyləməgil!
Yusif aydı: Halın elam qılğıl imdi.

Zahid aydur: Kitab içrə vəsfin gördüm,
Görübən də yüzinə bən aşiq oldum.
Bin iki yüz yılda belə taət qıldum,
Muradım bu gün hasil oldı, imdi.

Yusifə ol zahid telim öküt berdi,
Yusif anın ökütüni rəva gördi.
Həman dəmdə ol zahidə əcəl irdi,
Yusif anda uş qayğulu qalur imdi.

Bəs buyurdı Cəbrailə mövla Cəlil!
Sən Yusifə genə varğıl, ya Cəbrail!
Salam dürud yetürəkil, ökütləgil!
Xatırından qəm-qüssəsin yusun imdi.



Ol quyudan çıqaruban satıldacı,
Andan sonra təhmətlər kəb bulıdaçı,
Bəd əz an həm zindanlara salıdacı,
Hər hal içrə bən də belə olam imdi.

Andan sonra şiddətlərdən bən qurtaram,
Atasına özüm bayıq həm göstərəm,
Dövlətini, mülkətini bən arturam,
Həm tac-taxt, həm məmləkət vərəm imdi.

Ol hasidlər xidmətinə gəldəcidür,
Yıvlaq ulu şərmsarlıq qıldacıdur;
Nədamətlə peşman, heyran oldacıdur,
Yusif candan onlar, giryan olur imdi.

Oluq saat Cəbrail hazır gəldi,
Həq səlamın, həm əhvalın zahir qıldı.
Yusif əhvalın bilübən şakir qıldı
Qəzasına riza dəği verdi imdi.

*FƏSL*

## YUSİF ƏLEYHİSSƏLAMNIN QARDAŞLARI ÖVƏ DÖNMƏGİNDƏ

Ol Yusifin qardaşları övə döndi,
Birisi bir oğlaq dutub həm öyündi.
Qanın Yusif kömləginə anın sundı,
Cümləəri ağlaşuban varur imdi.

Yol üzərə qaba yığac olur irdi,
Yəqub anın tibinidə turur irdi.
Xüdanızdan bu dəm ana bir ün gəldi,
Dinlədisə, səbeyini döyür imdi.

Yəqub aydur: Ah bu yetmiş günmi ikən,
Ah ki, yoqsa, yetmiş kimi aymı ikən,
Ah dariğa, yoksa yetmiş yılmı ikən,
Yusifimin gecikməki?! Deyür imdi.

Yəqub baqdı, ol məqamda avaz çıqar,
Bəs Yusifnin fəraq odı bağrın yaqar,
Yarlı Yəqub yığılayu anda baqar,
Yusifimi görsəm deyü, istər imdi.

Könli zari yığılayu evə gəldi,
Bayıqıban, oğlanlarına güman qıldı,
Yusifinin yayduqını bəyan bildi,
Namaz qılsa, ağılayu qalur imdi.

Oğlanları ikiləyü yaqlaşdılar,
Yakın gələ yıvlaq qatı çuğlaşdılar,
Ah dariğa, Yusif deyü ağlaşdılar,
Yusifmizi aludurduq, derlər imdi.

Yəqub yasıq namazını qılur idi,
Oğlanları ağlayuban anda gəldi.
Qulağına ağılamaq üni girdi,
Örə durıb, təcil qarşu varur imdi.

Anı görə nohələri betər oldı,
Cümləleri tonın yırtıb saçın yoldı,
Hər birisi Yusif deyü zarı qıldı,
Yusifi biz alıdurduq, deyür imdi.

Anı eşdüb ol Yəqubın əqli şaşdı,
Bir çağrıdı, həm uqındı, yerə düşdi,
Anı görə oğlanları qızğurışdı,
Ah dariğa, xəta qılduq, derlər imdi.

Ol tün keçdi, yarındası ertə buldı,
Həm Yəqubın genə başna əğli gəldi.
Bu gəz baqa oğlanlarına, genə sordı,
Qanı bənim ol Yusifim? – deyür imdi.

Ol tün üç yüz altımış yol bihuş oldı,
Əqli gedib, gah gəlübən, gedər qaldı,
Atasının oğlanları halın gördi,
“Qətəlna ya əbana”, derlər imdi.



Ol tün keçdi, yarındası ertə buldı,
Həm Yəqubın genə başna əğli gəldi.
Oğlanların ündələdi, genə sordı:
Qanı bənim ol Yusifim? – deyür imdi.

Oğlanları ağlaşuban cavab berdi:
Cümləmiz oq birər-birər atduq idi,
Oqlarımızı alığalı varduq idi,
Yusif netə saqılayu qaldı imdi.

Biz gəlincə bayıq ana qəza irmiş,
Ah, ol yerdə bir yavuz qurt var imiş.
Həqiqətdə Yusifi ol qurt yemiş,
“Fəzkələhü əz-zib”[1] anı, derlər imdi.

Yəqub aydur: Əgər eylə olur irsə,
Yusifi qurt yeyib həlak qılur irsə,
Əzasından bircə nəsnə qalur irsə,
Ol əzanı bana alub gəltür imdi.

Ana kəfən sarıban gor qılısam mən,
Üstünə bir nakışlı dar qılısam mən,
Kənduzimni Yusifə yar qılısam mən,
Baqi ömrüm anın birlə, keçə imdi.

Anlar aydur: Aya baba, çoğ irəduq,
Onulamız ol arada çoq araduq,
Anda-munda heç nəsnəyi bulumaduq,
Qamusını ol qurd yemiş[2], derlər imdi.

Qanlı kömlək həm qoynundan çıqardılar,
Yəqub savçı alıdına gətürdilər,
Qanı birlə İsrailə göstərdilər,
Anı görüb, bixud olub, düşər imdi.

[1] Öldür bizi, ay ata.
[2] Qurd onu yeyib.

Əqli gəldi, kömləkini ələ aldı,
Öpə-quca ağılayu nəzər qıldı,
Kömləki heç yırtılmamış bayıq qaldı,
Nə mehriban qurd imiş ol, deyür imdi.

Yusifinin ətin yemiş, qanun qoymuş,
Yusifimə bəni məhrum, məhzun qoymuş,
Kömləkini beç yırtmamış, bütün qoymuş,
Bu arada bir hikmət var, deyür imdi.

Yəqub aydur: Sizlər bana ilədiniz,
Yusifimi sizlər bəndən dilədiniz,
Alıb, iltib, anda həlak elədiniz,
Yalan yerdə ağlaşursuz sizlər imdi.

Varın siz ol qurta, anı tutın, alın,
Dutuban ol qurtı alıb bura gəlin,
Uşbu sözə cümləniz siz müti olın,
Bu əhvalı biz soralım andın imdi.

Yoqsa ki, bən sücud içrə qılam zarı,
Müstəcab ol qılur qamu duaları,
Sizə əzim afət verə ayzum barı,
Məzlumların duasından qorkun imdi!

Bun eşidib, anlar şüvən qopardılar,
Dağdan ovlub bir günahsız qurt tutdular,
Ol qurtu tez ol Yəquba ilətdilər,
Yusifini yegən bu qurt, derlər imdi.

Qaçan da kim yarlı Yəqub qurtu gördi,
Ağırladı hörmət birlə qurtu durdı,
Ol Yusifim qanı? – Deyü qurtdan sordı,
Netə yedin, yayıtmagil, aydur imdi.

Ya qurt, aydur, Yusif ətin nətək yedin?
Nə mənidə ol xaliqdən sən qorqmadın?
Kömləgini heç yırtmadın, bütün qoydun?
Peyğəmbəri məhrum, məhzun qoydun imdi?



Oşal qurta xaliqidən fərman gəldi,
İsrailə söylə deyü, əmr elədi.
Fəsih dilnən qurt Yəquba bəyan qıldı,
Yalanuban tövazölığ edir imdi.

Ol qurt aydur: Bən Yusifə tuş olmadım,
Qandalığın anın dəği heç bulmadım,
Meazəllah[1], bəq bilür kim, heç bilmədim,
Bəni suçsuz, bayıq bilin, deyür imdi.

Özünüz siz həq peyğəmbər, həm rəsulsız,
Nübüvvətin ayasısız, İsrailsiz,
Xaliq sizə həm bildirir, siz bilirsiz,
Peyğəmbərlər əti bizə haram imdi.

Dilərisən buyurqıl sən bən varalım,
Aləm içrə qurtları həm bən dərəlim,
Qamuların qapunuza gətirəlim,
Heyrətindən inancılıq qalsun imdi.

Anlar dəği Yusifi heç bulmadılar,
"Haşa lillah"[2] Yusifə qəsd qılmadılar,
Tanrısına asi, yağı olmadılar,
Peyğəmbərlər əti bizə haram imdi.

Bən həm özim ol Misirdən yeni gəldim,
Bir qardaşım vardı, anı yıvaq qıldım,
On yedi gün buldu, tam heç yemədim,
Həsrətindən ağzım təam almaz imdi.

Heyran qılıb tağda bəni uş tutdılar,
Kənduları ağzıma ham qan sürtdilər,
Zülm birlə tapuğına gətürdilər,
Bigünaham, siz müəyyən bilin imdi.

[1] And olsun Allaha.
[2] Allah bilir.

Yəqub savçı qurt sözini kərtü bildi,
Kəndü əlilə ol qurta aş yedürdi.
Aydur: Bana bu qəzanı Tanrı verdi,
Düa qılıb qurta dəstur verür imdi.

Bu qəzanı verdi bana Mövla Cəlil,
Səbirsizlik əzizləri qılur zəlil.
Bən həm gərək səbr qılam "səbrən cəmil"[1]
Səbr birlə murad hasil olur imdi.

Yəhudə də ol yazıya hər gün çıqar,
Ol quyuya varıban ol hər gün baqar,
Yusif birlə xəbərləşü sözün oqar,
Hal-əhvalın cümləsini bilür imdi.

*FƏSL*

## YUSİFNİN QUYUDAN ÇIQARIB SATILMAĞINDA

Misir içrə ulu Məlik olar idi,
Anın adı Məlik-bin Doğar idi.
Doğar oğlı ol Məlik həm bir duş gördi.
Müəbbirə təvilini sorar imdi.

Müəbbirə aydur: Bu tün bir duş gördim:
Duşım içrə ol Kənana varar idim,
Ad qoyusı tegrəsində yürər idim,
Gün, həqiqət kökdən yerə enər imdi.

Tolun Ay açılıban gögdən bakdı,
Qoyınımdan girübən yaramdan çıqdı,
Həm gögdə dür, mərcan saqıb yinci yağdı,
Bən də anı ətəgimə dərdim imdi.

[1] Səbr yaxşıdır.



Sevinübən ətəgimə dərər idim,
Cəm qılub sandıqıma qoyar idim.
Uşbu duşnı heç gümansız belə gördim,
Ya müəbbir, bana təvil qılğıl imdi.

Müəbbir aytur: Olturğıl bu yanımda,
Yorayım bən uşbu duşnı bəyanımda.
İki qızıl altun qoyğıl bu yanımda,
Bu duşını bən mübarək yorum imdi.

Əgər kim, sən bundağ duşnı gördün isə,
Duşın içrə ol məqamə girdün isə,
Həqiqət, sən ol dövlətə irdün isə,
Bir şərif qul əlinə girər imdi.

Ol qulı sən ucuz satun aldaçısan.
Anı satub ögüş nemət buldaçısan,
Ol səbəbdən ögüş rahət buldaçısan,
Bu duş içrə ögüş dövlət görnür imdi.

Ol mənidən, uluğlığa digənürsən,
Küfr-şirkət mehnətidən qurtulursən,
Xaliqüni birliginə gərtünürsən,
Dünya-axrət öküş dövlət görünür imdi.

Anı eşdüb Məlik Doğar səfər qıldı,
Ad quyusı tekrəsində yük düşürdi,
Kənan eli tərəfindən çov irədi,
Duşındakı gördügini istər imdi.

Qullarına buyurdı kim dağıldılar,
Ol quyunın çevrəsinə yığıldılar,
Cümləleri istəməgə qəsd qıldılar,
Məlik Doğar anız-anız istər imdi.

İstər ikən enizidən bir ün gəldi,
Ol Məliknin qulağına eşidüldi.
Agdur: Tamam elgil, turqıl getgil, dedi,
Ol oğlanını almağa ir, deyür imdi.

Heç əksiksiz ilik yıl səbir qılğıl,
Andan sonra bu məqama genə gəlgil.
Ol oğlanını kəm bahaya satun alğıl,
Telim malı çoq bahaya satğıl imdi.

Məlik Doğar anı eşdüb, andan köçdi,
Andan sonra eliki yıl taam keçdi.
Doğar oğlı bu mənzilə yenə düşdi,
Vədəsinə yetdi deyib, sevnür imdi.

Bir neçəsi firiştələr, gəlmiş idi,
Quşa bənzəş Yusifə eş olmuş idi,
Ol quyu həm anlar ilə tolmuş idi,
Quşa bənzər ol quyudan çıqar imdi.

Məlik Doğar ol quşlarını anda gördi,
Firiştələr idügini bilümədi,
Zira ol vəqt Məlik Doğar kafir idi,
Oq aluban quş atmağa gəlür imdi.

Məlik yakın gəldi, quşlar oldı pünhan,
Anı gördi Məlik Doğar qaldı heyran,
Baqdı irsə nur çıqardı ol quyudan,
Anı görüb bixud olub düşər imdi.

Oluq saat otağına yenə gəldi,
Ansız degül sızanadı zirək oldı,
Qullarından iki qula əmr qıldı:
Şol quyudan suv götürün, deyür imdi.

Bəşir, Bəşra ikiləsi qova aldı,
Ol quyunın üzərinə hazır gəldi,
Quyu içrə qovaların nüzul qıldı,
Yusif anda baqub anı görər imdi.

Həq Yusifə Cəbraili göndürdilər,
İkiləsi qullarını endürdilər.
Vidalayu qullarını söyndürdilər,
Tışra çıqmaq bəşarətin gətrür imdi.



Aya, Yusif, sən güzgüyə baqdınmu, de,
Güzg içində görkin görüb oqdınmı, de,
Bən satılur qul olısam saqdınmı, de,
Bənim baham kəm yetkürür dedin imdi.

Yusif aydur: Bən güzgiyə baqdım idi,
Güzgüdə öz görükümi oqdım idi.
Bən satılur qul olısam saqdım idi,
Bənim baham kəm yetirür, dedim imdi.

Ol Cəbrail aydur: Yusif, imdi turğıl,
Bu qovağa yabuşuba tışra varğıl,
Nə bahaya satılursan, gözün görgil,
Müştəri həm hazırdurur, alur imdi.

İkiləsi tartıdılar Bəşir, Bəşra,
Əziz Yusif oşal dəmdə çıqdı tışra.
Qadir Mövlam təqdirinə kim şaşıra
Necədi var anın hökmi, olur imdi.

Yusif quyının içindən çıqa gəldi,
Tolun ay tik nurlu yüzi toğa gəldi.
Məlik gördi ol dəmdə bixud oldı,
Friştəmi, ya pərimi? – deyür imdi.

Məlik Doğar anda vədə qılmış idi.
Qullarına buyuruban ismarladı:
Anı hər kim bulur isə gəlin, dedi,
Azad qılıb, qızım ana verəm imdi.

Bəşir gəlib Məlikini muştıladı.
Məlik Doğar sevinübə qarşu vardı.
Varıb yetib, Yusifnin əlin aldı,
Götürübən rəxti içrə gizlər imdi.

Bəs Yusifin qardaşları tağda idi,
Baquban ol yazıda karvan gördi,
Sizinübən qatarlaşu yügrü gəldi,
Quyu içrə Yusifni bulmaz imdi.

Məlik Doğar bu məndən əhval bildi,
Cəhdləyü ol karvana anlar gəldi.
Aydur: bizim bir qulumız qaçmış idi,
Anı bayıq siz alınışsız, derlər imdi.

Ol Rəvayil aydur: Verin minnət ilə!
Yoqsa, bir gəz nərə uram heybət ilə!
Cümlə həlak olasınız seyhət ilə!
Ünüm eşdən canın təslim qılur imdi.

Məlik Doğar ehtiyatlı, aqil idi,
Qorqub, ana Yusifini gerü verdi.
Anlar danışıb məsləhəti eylə gördi.
Bunı, qul deb, biz satalım ana imdi.

Bu tədbiri bular beylə eylədilər,
Ərəbicə Yusifə söz söylədilər:
Öldürərmiz yoqsa, deyü küylədilər.
Qul satalım, müti olğıl, derlər imdi.

Məlik Doğar zirək idi, anı bildi,
Xəfi birlə şadıkamlıq içrə qaldı,
Anlar satar, ol həm anı satun aldı,
Bunı eştib Yusif qanın ağlar imdi.

Yusif aydur: İmdi məni satarmusız?
Həsrət, ğürbət odlarına atarmusız?
Felinizdə məndən güman tutarmusız?
Saqlayalum, and içəlüm, deyür imdi.

Bəni satmın, kafir qulı olmayalum,
Atam Yoqub həsrətinə qalmayalum.
Ğürbət odı həsrətinə varmayalım,
Dədəm Xəlil hörmətin saqlın imdi.

Anlar aydur: Bizlər sana zinharladık,
Atamıza Yusifi qurt yedi dedik,
İsrailə bizlər düşvar söz sözlədik,
Ya Yusif, sən bu sağıncı qoyğıl imdi.



Bu gəz Yəbud ol Yusifi öğütlədi,
Aydur: Sana bu qəzanı Tanrı verdi.
Qardaşların batil işə doğru durdı,
Yoqsa, bayıq öldürərlər, bilgil imdi.

Yekrək oldur, rəva görgil satılmaqı,
Qardaşların cəfasından qurtulmaqı,
İsraildən həsrətilə ayrılmaqı,
Qoşarquçı qoşarmağa gəlgil imdi.

Aydururlar qul satalum bunu sana,
Ol şərtilə satarımız iraq yana,
Nə bəhasən verirüsən imdi buna,
Bizlər yulaq həm satalum, derlər imdi.

Məlik aydur: Bu qulınıdur, bəyan eylən
Nə məndən satarsız anı, söylən!
Nə suç qıldı, nəşə qaçdı, anı saylən!
Əqli, görki sizdən dəxi artuq imdi.

Kiçik irkən də atamız satun aldı,
Dura-dura bizim ilə həmrəh oldı.
Dura-dura bu oğlancıq yavuz quldı,
Qaçıb gəlib bu quyuya girər imdi.

Məlik aydur: Əhvalını eylən əyan!
Neçə dürli eybi vardur, qılın bəyan!
Həm söz ğələt olmasun, anda güman,
Səhih şərtlə dürüst satu qılam imdi.

Anlar aydur: Heç gümansız bayıq quldur,
Qulımıznın həm üç dürlü eybi vardur:
Oğrıdurur, yalançıdur, qaçquçudur.
Bu üç dürlü eybi birlə alğıl imdi.

Məlik aydur: Nə deyirsiz, anlayurbən,
Həqiqəti, bu qulı bən alıyurbən.
Eybi birlə əcəb, qəbul eyləyürbən,
Nə bahaya alursuz aydun imdi.

Və lakin bil, munda heç bir altunum yoq,
Kala birlə qumacım, həm atlasım çoq,
Həm bir qaç yarmağım var, qiyməti yoq,
Satu nəçük qılavuz da, derlər imdi.

Yusif aydur: Eylə satu bulmasaydı,
Qardaşlarım az bahaya salmasaydı,
Müştəridə ögüş baha olmasaydı,
Yarlı özüm, qul olmasam, degil imdi.

Bunlar aydur: Biz ol işi qılmayavuz,
Qulımıza kala, qumaş almayavuz.
Bu satuya hərgiz razı olmayavuz,
Yarmaq vergil, nə verürsən, de gil imdi.

Məlik aydur: Uş on səkiz yarmağım var,
Həqiqətdə altunum yoq, yarmağım var.
Ol on səkiz yarmaqımı alın sizlər,
Qalduğını bana bəxşiş qılın imdi.

Anlar aydur: On səkiz yarmaqı alduq,
Sənin birlə bu satuyı tamam qılduq!
Cümləmiz də bu satuya razı olduq,
Qalanını sana bəxşiş qılduq imdi.

Andan sonra Yusifə bəs Məlik sordı:
Bunlar səni qul deyübən bana verdi,
Uşbu işi anlar nəçük belə irdi?
Həqiqəti sən müəyyən qılğıl imdi.

Anlar aydur: Qulluqğa sən razı olğıl!
Dilin birlə "qulvən" – deyü iqrar, qılğıl!
Yoq deyirsən, öldürürmiz, bayıq bilgil!
Ərəbicə Yusifə sözlərlər imdi.

Bu gəz Yusif qardaşlardan baqıb qorqdı,
Qorqmaqıdan qul olmağa iqrar qıldı,
"Qul mən" – dedi, gözlərindən yaşı aqdı.
Niyyətini Tanrısına qılur imdi.



Munlar aydur: Əya Məlik, bizə inan!
Tilimizə gəl tutmaqıl hərgiz güman.
Bağ-buqağın çeşməgilən ayağından,
Misrədəkin buğavulu varsun imdi.

Yalançıdur, heç sözinə eyləməgil,
Əsirgəbən mehribanlıq eyləməgil,
Heç ana sən edgü sözü söyləməgil,
Təam arpa ətməkini vergil imdi.

Məlik aydur: Bən sizlərə həm inandım,
Razı oldum qulınızı satun aldım.
Ol üç eybi birlə anı qəbul qıldım,
Bu bih[1] üzə həm bir biti gərək imdi.

Anlar cümlə bu sözləri rəva gördi,
Biti yazıb həm verməgə boyun verdi,
Qamuları batil işə doğrı durdı,
Qəbaləsin veriməgə yazar imdi.

Şəmun kəndu əli ilə biti yazdı,
Biti yazub, qamuların möhrin basdı.
Yusifindən yüz döndürib, anlar bezdi.
Peyğəmbəri qul deyübən satar imdi.

"Biz, cümləmiz bu satuya razı olduq.
Doğar oğlı Məlikə həm bir qul satduq,
On qardaşı razı olub biti yazduq,
Qulumızı sana təslim qılduq imdi".

Yusif anı eşidübən qanın ağlar,
Həsrət odı içün yaqar, bağrın dağlar,
Ağlar, yenə gerü dönə dəstur sovlar,
Dəstur versən gerü varsam nola, imdi?

Dəstur vergil, gerü yenə bən varayım,
Soylarımı toyanca bir bən görəyim,

[1] B i h – satış; satqı.

Yazuqlarımı anıların bən diləyim,
Vida qılıb ayrılmayaq bizlər imdi.

Məlik bunı eşidübən özi keynər,
Məlik deği ol Yusifdən artuq yanar,
Yusifini işlərini yulaq tanar,
Bu ibrətli əcayibə qalur imdi.

Məlik Doğar Yusifə həm cavab verdi;
Görmezmüsən, anlar nələr rəva gördi?
Neşə satdı, neşə böylə ucuz verdi?
Nə varursan, anlar seni sevməz imdi?

Anlar səni satıdılar kəm yarmağa,
Diləkləri həm sənidən ayrılmağa,
Layiq degil sən onlara yalvarmağa,
Hörmətin bəs bizdə sənin yekrək imdi.

Oşal yarmaq qiymətini həm ol vəqtin,
Bəndə tört yüz yarmaq idi, həm bir altun.
Məlik aldı şol bahayə qədər satun,
Bəs Yusifə Məlik elanı qılur imdi.

Yusif ana ağlayuban cavab verdi:
Anlar bu iş işləməgə rəva gördi,
Diləkləri, muradları şöylə idi,
Bən şəfaət, ümidimi kəsməm imdi.

Andan Məlik həm Yusifə dəstur verdi,
Yarlı Yusif həsrət ilə gerü vardı,
Bu on qardaş cümləleri örə durdı,
Hər birisi öbə-quca ağlar imdi.

Aydı: Bildüm bəndən bezar oldunız sız,
Uçmax verüb, tamuğ satun aldunız sız,
İsraildən bəni mərhum qıldunız siz,
Qoşulmaqlıq yuvlaq yıraq qıldı imdi!



Ah, dariğa ğərib başım zəlil oldı,
Qardaşlarım bu düşmanlıq bana qıldı,
Atam Yequb bəndən məhrum bayıq qaldı!
Ağlamaqdan iki gözi görməz imdi.

Qayğulı mən, özimə eş kim buldaçı?
Bundan sonra bana timar kim qıldacı?
Ağlar irsəm gözüm yaşın kim sildəçi?
Yenə başım, donımı kim yuvar imdi?

Uzun saçım darayuban kim ördeci?
Məğmumluğım, məhzunluğım kim sordacı?
Bu həsrəti, aqibəti kim untdacı?
Azad özüm, bəndəligə düştüm imdi.

Atam bəni əgni üzə götürürdi,
Uyqum gəlsə, yastuq üzə yaturırdi,
Durquzuban dürlü təam yedürürdi,
Ol rahətdən bu məhnətə düştüm imdi.

Ey dariğa, bən qulluqı neçük qılam?
Müdam kafər qulluğında netə olam?
Ulularım iraq, sizi qılda qalam,
Ayrulmaqtlıq üzə təqdir gəldi imdi.

Bu təqdiri bir Tanrımdan bilmiş gərək,
Həqq hökmünə qulu razı olmuş gərək,
Şiddətinə səbir razı dermiş gərək,
Qəzasına deği təslim oldım imdi.

Yarlı Yusif qızğurıban qanın ağlar,
Ağlar irkən qardaşların öbər, qucar,
Cümləsinə əsənləri vidağ eylar,
Məlik Doğar dəniz-dəniz ağlar imdi!

Qardaşları mun eşitüb ağlaşdılar,
Yulaq qatı həsrət ilə çuğlaşdılar,
Cümləleri, ulu ünü anraşdılar,
İşlərinə yulaq peşman olur imdi.

Aydurlar: Biz səni gerü ala idük,
Əlin alıb, cümlə tövbə qıla idük,
Satumıza həb peşiman ola idük,
Və lakin biz ar qılamız, derlər imdi.

Atamıza yalan dəği olumazüz,
Səni gerü atamıza iletməzüz.
Uşbu işə heç bir tedbir qılumazüz,
Bu möhnətə sən qatlanğıl, derlər imdi.

Yusif aydur: Keçən söz heç gerü gəlməz,
Həq təqdiri belədürür, kimsə bilməz,
Bundan sonra qul tədbiri rəva olmaz,
Həq əmrinə qul səbiri gərək imdi.

Tanrıdandur uşbu təqdir qadir, məlum,
Atam Yəqub həsrətilə qaldı məğmum,
Qardaşım ol Beniyəmin qaldı məhrum,
Bundan sonra bəni qanda görər imdi?

Qardaşları Yusifidən getdi yıraq,
Atasından, qardaşından oldı qıraq,
Baqrı yanar, qanın ağlar ikən fəraq,
Ağlar ikən müdam qıra baqar imdi.

Bəs Yusifi ol dəm yola döndürdilər,
Palas geyrüb bir dəvəyə bindürdilər,
Əlin bağlab qatı yuvlaq göndərdilər,
Poşanuban qaçmasun ol, derlər imdi.

Bir həbəşi qul var idi Qılıc adlu,
Qullarının cümləsindən ol heybətlu,
Yüzi qara yulaq, qatı siyasətlu,
Ol Yusifi ana təslim qıldlar imdi.

Oluq saat olu karvan andan köçdi,
Bir gorıstan qıraqından ötə keçdi,
Yusif nəbi bir kor üzə yüzün düşdi,
Ol anası Rahiləmiş bayıq imdi.



Zarı qalıb aydur: Anam Ümmrahil!
Bənim halım neçük oldı, gözün görgil!
Qardaşlarım satdı bəni, bəyan bilgil,
Azad özüm, bəndəlikkə düştüm imdi.

Həsəd qıluban atamdan ayurdılar,
Firqət odın bu canıma qovırdılar,
Qürbət tonın əkinimə geyürdilər,
Əl-adağım zəncir ilə bağlu imdi.

Qardaşlarım bana qıldı rəncü-zəhmət,
Kiçiklikdən düşdi bana uşbu hikmət,
Fəzli birlə qıla məgər bana rəhmət,
Ümidim ol həqdən bənim, deyür imdi.

Aya, anam, bənim halım görgil zahir,
Bəndəlikkə satın aldı bəni kafir,
Bu təqdiri qıldı mana mövlam qadir,
Məgər yenə uluğ rəhmət qıla imdi.

Ey dariğa, əziz anam bulurmusan?
Bugünkü gün bənim halım bilürmüsən?
Baqıb bəni, bu hal üzə görürmüsən?
Əllərümlə adaqlarım bağlu imdi!

Anasının gorundan bir ünü gəldi:
Sevgil oğlum, halın nədən beylə oldı?
Qardaşların bu işləri nədən qıldı?
Oğlum, sən bu hala netə düşdün imdi?

Canım oğlum! Bu cəfanı netə buldun?
Sana düşman olanlara nə suç qıldın?
Bu hal içrə bənim qəbrim üzə gəldun?
Gorum içrə canım məcruh qıldun imdi.

Atan Yəqub bu əhvalı bilmədimi?
Ol məhzunə halın məlum olmadımi?
Beniyəmin sənin birlə gəlmədimi?
Bu bəlaya netə ğafil düştün imdi?

Sənin atan Yəqub irür, baban İshaq,
Ulu dədən xaliqiğa bulmadı aq,
Sən həm dəği rəhmətinə olğıl müştaq,
Ümid var kim, fərəh təcil irür imdi.

Xudavənda, bu hacətim sana məlum,
Müdam ümid dutar sana cümlə məzlum,
Zalimlərə satılmışdır bənim tiflüm,
Fəzlin birlə yarlıqağıl kərəm imdi.

Yusif anı eşitibən bixud oldı,
Xaliq Rahil münaçatın qəbul qıldı,
Ol münacat Yusifə də qarşu gəldi,
Tac, təxt, həm məmləkət oldı imdi.

İmdi Qılıc ol Yusifi bulumadı,
Cəhd qılıb qandalığın bilümədi,
Köndu yalğuz istəyünə gəlümədi,
Xocasına əhval elam qılur imdi.

Çağıruban aydı Məlik: Dursun karvan,
Ey dariğa, bayıq qaçmış qulum oğlan,
Qafilə həm durı döndi ol aradan,
Cümləlcri Yusifini istər imdi.

Ol Qılıc bir tazı at binər idi
Tərküləyü qamulardan, qılıc oldı.
Dikin-dikin Yusifini çoq aradı,
Bir güz üzrə yüz düşüb ağlar imdi.

Yıraqdan ol Yusifini baqdı gördi,
Yarlı Yusif anı görə örə durdı,
Alın alıb ağlayu yola girdi,
Sönər buşar yer üzərə soyrar imdi.

Yusif aydur: Ya ilahim nə qılayın?
Bu mehnətdən işbu neçük qurtulayın?
Bu zalımdan qurtulmağa nə bulayın?
Xudavənda, fəzlin birlə qurtar imdi!



Bunı aytıb, ah qılıb, ya kərim, der,
Fəzlin birlə yarlıqağıl, ya rəhim, der,
Bənim halım sən bilürsən, ya Əlim, der,
Hər hal içrə sana pənah qıldum imdi.

Ulu dədəm İbrahim Xəlil idi.
Xəlil sənin buyruğını rəva gördi,
Oğlun qurban qılmağa boyun verdi,
Ol Xəlilin hörmətiçün, deyər imdi!

Xudavənda, əgər xəta qıldım isə,
Əmrün qoyub sana asi oldum isə,
Atam Yəqub xidmətindən qaldum isə,
Tövbə qıldım, peşman oldım deyir imdi.

Xudavənda, əgər asi dögül isəm,
Xətalardan, zillətlərdən bərü irsəm,
Xətasızdan bu bəlayə düşmiş olsam,
Bu qövmə bir əlamət göstər imdi.

Bəs ol Qılıc Yusifini alıb gəldi,
Götürübən məlikinə ismarladı,
Məlik buşan biri neçə yana qaldı,
Dəvə üzrə möhkəm dutub bağlar imdi.

Anicədən Tanrıdan həm fərman aldı,
Qudrət birlə kökdə qara bulut buldı,
Yel əsdi, həm qara yağmur qatı gəldi,
Yuvlaq qatı heybət birlə yağar imdi.

Başlarına toqunursa yarar idi,
Tənlərinə toqunursa məcruh oldı,
Cümlələri çağrışuba fəryad qıldı,
Heç bir yerdən məded, fəryad olmaz imdi.

Heç kimsənə biri-birin görmez oldı,
Qamuları zülmət içrə heyran qaldı.
Gög kükrəyib, yıldırım həm heybət qıldı,
Anı görüb Məlik yuvlaq qorqar imdi.

Məlik aydı: Ah, halımız oldı yaman,
Yarəb, nedən oldı uşbu qatı tufan?
Ey dariğa, bardur bəndə bir əziz can,
Gəlin, barca istiğfarı qılaq imdi.

Məlik aydı: Əzab irdi, bayıq bilin,
Aza etmiş kimsənəniz safi olın,
Yazuq qılan kimsənəniz tövbə qılın,
Yoqsa, həlak olduq qamu bizlər imdi.

Hər kim irsə həm bizlərdən zülm gördi,
Ol məzlumının münacatı gögə bardı,
Ərş Tanrısı bizlərə uş bəla verdi,
Tövbə qılnız, yoqsa həlak olduq imdi.

Qılınc anı eşitübən hazır gəldi,
Günahına, xətasına tövbə qıldı,
Bayıq bilin, uşbu günah bəndən oldı,
Şol ərəbi oğlancığı urdum imdi.

Andan Məlik buyurdı ol qara qula,
Bar Yusifin, ayağın öb, üzür tilə,
Başdağ iki günümizi rövşən qıla,
Məgər bizə edkü dua qıla imdi.

Bəs Yusifin tapusına Qılıc vardı,
Yuvlaq qatı yalvarıdı, zarı qaldı,
Xəta, günah qıldığını bayıq bildi,
Barıb Yusif ayağını öbər imdi.

Məlik dəği ol Yusifə çoq yalvardı,
Dizin çöküb xidmətinə əl qoşurdı,
Məlik dəği anınilə belə vardı,
Xətamızı keçürdilən, deyür imdi.

Bunı görüb ol Yusifin mehri gəldi,
Yusif nəbi əl qaldırdı, dua qıldı,
Duaları həm müstəcab qəbul oldı,
Mehnət getib, qara yağmur soldı imdi.



Oluq saat qar souldı, səlim öndi,
Yağaturğan qar yağmurı hala döndi,
Buz əruban, su oluban yerə sindi,
Gün açılıb cəhan xürrəm olur imdi.

Anı görə, Məlik ibrət alıb düşdi,
Bağ-buğavun ayağında cümlə şeşdi,
Məlik, məmlük cümləlari yalvarışdı,
Qamulardan Məlik artuq yalvar imdi.

Palasını çıqaruban ton geyürdi,
Həm dəvədən endürübən at bindürdi,
Ulu, kiçi qamusuna həm bildürdi,
Xudavənda, karvan, Yusif derlər imdi.

Cümləniz ol Yusifinə müti olın,
Uluğ, kiçük cümlə ana xidmət qılın.
Bəd əz an padşah deyib, anı bilin,
Müdam anın buyruğından çıqman imdi.

Andan sonra Yusif hökmi oldı rəvan,
Uluğ hörmət verdi ana Məlik Sübhan,
Heç kimsənə çıqmaz anın buyrığından,
Məlik dəği ana dönşüb işlər imdi.

Sözlədikcə Yusifinin fəzli artar,
Sözi tatlu, ləfzi şirin, əqli artar,
Dönüb həqqə cahanını növrəq dutar,
Baqan hərgiz cəmalına doymaz imdi.

*FƏSL*

## YUSİF ƏLEYHİSSƏLAMNIN ƏLUS ŞƏHƏRİNƏ GİRMƏGİNDƏ

Andın yetdi Bəlus şəhrinə anlar girdi,
Ol şəhərin əhli cümlə kafir idi,
Ol şəhərin əhli Yusif körkün gördi,
Qamuları əcayibə qalur imdi.

Cümləleri Yusif qatna dirnəşdilər,
Xaliq sənin, Yusif görkün dənləşdilər,
Yusif birlə telim sözlər sözləşdilər,
Yusifidən hal, həm əbval sorar imdi.

Bizə anğıl, səni böylə kim yaratdı?
Bunun kibi görklük, cəmal kim düzətdi?
Bu surəti sənin üzə kim yürütdi?
Bizlər dəği ana bəndə olayım imdi.

Yusif aydur: Yaratqanım xalıqdurur,
Yerdə-gögdə qullar üzə raziqdurur,
Yaratıban rizq verməkə layıqdurur,
Səni, bəni ol yaratdı bilgil imdi!

Anlar dəği uşbu sözə inandılar,
Həm ol Yusif peyğəmbərə inandılar,
Cümləleri bir Tanrıya göründilər,
Mömin, Muxlis olubdılar anlar imdi.

*FƏSL*

## KARVANIN NİYAN ŞƏHƏRİNƏ GƏLMƏGİNDƏ

Andan keçdi Niyan şəhrə anlar girdi,
Ol şəhr əbli Yusifin görkin gördi,
Yusifini hacibidən anlar sordı,
Cümləleri ol bacə tapnırlar imdi.

Andan keçdi Qüds şəhrinə anlar girdi,
Qüds Məliki duşunda həm görmüş idi.
Cümlə şəhrə Məlik xəbər vermiş idi,
Kərvan gəlür, qarşu çıqın deyür imdi.

Qüds Məliki ol Yusifə qarşu gərdi,
Bəgləriniz kimdür, deyü xəbər sordı,
Kərvan əhli cümləleri xəbər verdi,
Bəgimiz ol Məlik Doğar, derlər imdi.



Qüds Məliki bu ibrəti yulaq duyar,
Aydur: İldə bu məlikə bundan uyar,
İman bildim bu arada nə hikmət bar?
Buna qarşu varmaq dəği gərək imdi.

Həq əmrilə çox firiştə gəlmiş idi,
Bu hal içrə Yusifə eş olmış idi,
Həmişəlik Yusif ilə olmış idi,
Dildən, gözdən Yusifini saqlar imdi.

Adəm oğlı birlə pəri olur imiş,
Yusif ilə ol pəri bir gündə, doğmış,
Kim doğsa, bir pəri oğlan doğar imiş,
Olar irsə, həm birgəli olar imdi.

Firiştələr ol məlikkə cəvab eylər,
Bu oldur kim bayıq sana, buyurdılar.
Ləşkərinən birlə vargıl, ayurdılar,
Gördügün ol duş da budur, bilgil imdi.

Ol oğlanı Məlik baqar, görüb dinlər,
Firiştələr bildürirsə, bilüb anlar,
Qamulanız bu oğlanna hörmət yanlar,
Ana hörmət qamulardan artuq imdi.

Qüds Məliki oşal saət hazır gəldi,
Ol Yusifə salam verüb, xidmət qıldı,
Ədəb birlə ol Yusifə xəbər sordı,
Kim idügin bizə məlum qılğıl imdi.

Andan Yusif həm məlikkə cavab eylər:
Bəni əvvəl duşda sana bildürdilər,
Qarşu çıqıb xidmətinə buyurdılar,
Heç gümansız anı bayıq bilgil imdi.

Məlik bunu eşitibən bayıqladı,
Yusifini gətürübən qonaqladı.
Yoldaşları birlə cümlə ağırladı,
Həm möhtərəm, həm mükərrəm tutar imdi.

Qüds Məliki aydur: Bana nə deyürsən?
Bən bəndəyə nəsihəti nə buyursan?
Əya Yusif, sən bana nə ayıtursan?
Nə buyursan sən, bən anı qılam imdi.

Yusif aydur: Bəndən eşit, aya Məlik!
Eşitdügün dutubanı, olğıl salik!
Sənin kibi Məlik oda tapınmaqlıq,
Bunı eşit, otdan, bütdən döngil imdi.

Məlik aydur: Uşbu sözin, qəbul qıldım,
Sən dedigin ol Tanrıya müti oldım,
Həqiqətdə peyğəmbərsən, səni bildüm,
Vəlakin bu bütxanəyə girək imdi.

Qaçan sənəm dönüm sana sözlər desə,
Qarşu sana qaç cavabı eylər irsə,
Həqiqətdə peyğəmbərsən, deyər irsə,
Heç gümansızın mömin, müxlis oldum imdi.

Yusif aydur: Razı oldum, gəl varalım,
İkiləmiz bütxanəyə biz girəlim,
Sənəm halın-əhvalını biz soralım,
Biz görəlim, neçük cavab eylər imdi?

Yusif ilə bütxanəyə məlik girdi,
Qaçanda ki, ol Yusifi sənəm gördi,
Bir andıca bəs Yusifə salam verdi,
Həqiqətdə peyğəmbərsən, deyür imdi.

Təği sənəm ol Yusifə səcdə qıldı,
Qüds Məliki anı görüb, əhval bildi,
Bir Tanrının birlikinə müqir gəldi,
Mömin olub beldən zünnar şeşər imdi.

Yusifə ol dürlü təam aş götürdi,
Yusif əlin sunuban bir löqmə yedi,
Üç yüz toqsan kişi yedi, cümlə toydı,
Neməti heç əksilməyin qalur imdi.



Qüds Məliki andan aydur bu məlikə:
Uşbu oğlan layiq durur, sərvərlikə,
Qul deməgə layiq degül, bu hörmətgə.
Seydi anın bundan artıq olur imdi.

Məlik Doğar bu məlikə cavab verdi,
Aydı: Bizim seyidimiz Yusif idi.
Seyidligə Yusif layiq bizdən, dedi,
Bən Yusifin həm qulumən, deyür imdi.

Qüds Məliki Yusifinin qatna gəldi,
Məlik Doğar ol məlikdən dəstur aldı,
Bu urundan keçiməgə niyyət aldı,
Edgü sözün Yusifinə göndür imdi.

Ol qafilə dəbrənübən yola girdi,
Qüds Məliki sonra səvab elə gördi,
Oşal oğlan munda dursa, layiq irdi,
Gəlin, yetib əllərindən alaq imdi.

On iki bin əsgər ilə atlandılar,
Yusifni alımağa niyyətləndilər,
Məlik aydur: Əya Yusif, uş yetdilər,
Yusif aydur: heç qorqmayın, gəlsün imdi.

Qaçan ləşgər ol Yusifə yaqın gəldi,
Yusif dönüb ol ləşkərə nəzər qıldı.
Anı görüb cümləəri şöylə oldı;
Bihuş olub cümlə atdan düşər imdi.

On iki bin ərlər cümlə atdan düşdi.
Qamusının ısı getib, əqli şaşdı.
Karvan keçdi, əl arada üç gün keçdi,
Anlar dəği bixud olub yatur imdi.

Anı görə, qamuları heyran qaldı,
Yusifinin görkün görüb əcəblədi,
Yusif ucub meydanına cövlan qıldı.
Bana bənzəş heç kimsənə yoqdur imdi.

Heç doğmadı, həm doğmaya bəntək bəşər,
Hər kim indi bana baqsa əqli şaşər,
Görüməgə müştaq olub uğnub düşər,
Didarıma canın fəda qılur imdi.

Oluq saat Cəbrail gəldi hazır,
Veribdi ol Yusifinə Məlik qadir,
Həqiqəti, bana Yusif, nə dedün, dir,
Əcəb qıldun xaliq sənin görgil imdi.

Üçüncü gün Ərus şəhrinə anlar girdi,
Ol şəherin əhli-ünsü cinü pəri.
Qaçan da kim, ol Yusifi anlar gördi,
Hər birisi həm Yusifdən görklü imdi.

Qulınının sağınduğı rəva olmaz,
Ol şəhərdə Yusifi heç kişi bulmaz,
Cəmalını kimsə görüb qəbul qılmaz,
Cümləbri Yusifidən görklü imdi.

Hər birinin Yusifidən yüzi nurlu,
Surətləri münəvvərdür dürlü-dürlü,
Cümləsinin əqli tamam, özi arlu,
Anı görüb Yusif məğmum olur imdi.

Xaliqidən ol Yusifə vehy gəldi,
Əya Yusif, qüdrətimi görgil, dedi.
Sən kəndunin əhvalını bilgil, dedi,
Gör ki, bir kuç həqiqəti bənvən imdi.

Qaçan Yusif bu əhvalı bayıq bildi,
Həm əcəb ol nə qılduğın müqir gəldi.
Aciz olub mövlasına səcdə qıldı,
Tövbə qılıb, yarəb deyib, ağlar imdi.

Həmən dəmdə xaliqidən məded irdi,
Ol Yusifnin cəmalını gerü verdi,
Zahir batin görkini həm qarşu gördi,
Əya Yusif, başın qaldur, deyür imdi.



Bəs anların şəhəridən ötə keçdi,
Ol qafilə gəlib Misrə yaqınlaşdı.
Karvan gəlib Nil bəhrinə youq düşdi,
Məlik Doğar Yusifə yalvarar imdi.

Məlik aydur: Aya, Yusif imdi bar sən,
Nil irmağı uş budur, ol əzin gör sən,
Məsləhətim sana budur suva var sən,
Boyunızdan tozan-topraq getsün imdi.

Yusif Məlkin ol sözinə müti oldı,
Durubanı Nil irmağna yaqın gəldi,
Əl qaldurdı, xalıqına dua qıldı:
Fəzlin birlə bana pərdə vergil imdi.

Yusifinin ol duası qəbul oldı,
Oluq saat Yusifə bir cübbə gəldi
Yusif oşal cübbə içrə güsl qıldı
Əndamını heç kimsənə görməz imdi.

Ol su içrə birər balıq olur idi.
Sudağı ol balıqlara həm buyurdı:
Xaliğinin ol sədiqi suğa girdi,
Ədəb saqlan, heç kimsənə baqman imdi.

Anı eştib balıqlar həm cümlə çıqdı,
Məqamılı məqamına həm bayıqdı,
Heç kimsənə ol Yusifə qaçan baqdı,
Cümlə Yusif hörmətini saqlar imdi.

Ulu balıq yenə anda hazır gəldi,
Kənduzini ol Yusifə zahir qıldı,
Yusif anın üzəsində sabit oldı,
Arqasına basıbanı binər imdi.

Yusif oşal balıq üzə qüsl qıldı,
Nuri dəği həzar çəndən artuq oldı.
Oluq saat Cəbraili hazır gəldi,
Həq səlamın, hillə tozın götrür imdi.

Əya Yusif, xaliq sana qıldı salam,
Həm peyvəstə anın ilə bilə olam,
Aqibəti, anı ulu məlik qılam,
Vəlakin ol səbr qılsun, deyür imdi.

Yusif nəbi təmam ğüslun qılduğından,
Arıǧ yuvnub sudan tışra gəldükindən,
Hillə geyib könli şad-kam olduğından,
Yusifidən balıq hacət dilər imdi.

Yusif aydur: Ulu sərvər, əya balıq,
Bana dövlət ruzi qıldı cabbar xaliq,
Fəzli birlə ruzi qıldı padişahlıq,
Balıqlara sultan bənə deyür imdi.

Cümlə balıq sultanı bən, dövlətlivən,
Vəlakin bir əyal üçün hacətlivən,
Əyal üçün əya Yusif, həsrətlivən,
Bənim üçün sən bir dua qılğıl imdi.

Ulu xaliq sənin duan qəbul qıla,
Fəzli birlə bana ruzi oğul qıla,
Oğul bana bundan sonra məqbul qıla,
Olar irsəm sonımıdan, deyür imdi.

Yusif nəbi əl qaldurdı dua qıldı,
Xaliq anın duasını duya qıldı,
Ol balıqğa iki oğul əta qıldı,
İkiləsi dövlət yəsi olur imdi.

Ol ikisi kəramətə yetmiş idi,
Birisi ol Yunis nəbni tutmış idi,
Birisi ol yüzügini yutmış idi,
Süleymanın ol yüzügin deyər imdi.

Yusif oşal balıq birlə isanlaşdı,
İkiləsi alqışlaşu ayrulaşdı.
Balıq vida qılubanı suğa düşdi,
Yusif geri[illegible]lik taba gəlür imdi.



Yusif nəbi yenə gəldi şadu xəndan,
Nuri dəği artuq oldı həzar çəndan,
Nuri balğır əknindəki hillə təndan,
Yerdən gögə nurdan tirək olur imdi.

Yusif gerü gəldügini Məlik bildi,
Oluq saat qullarına əmr qıldı;
Sanduqıdan yetmiş dürlü ton çıqardı,
Yusif geysün deyü hazır qıldı imdi.

Məlik Doğar Yusifinə qarşu vardı,
Ol Yusifin əgnində həm hillə gördi.
Sorar: Sana bu tonları kim geyürdi?!
Baqar, dalar, əcayibə qalur imdi?

Yusif aydur: Eyzim berdi bu xələti,
Mövlam bana ruzi qıldı bu dövləti.
Ol xaliqdən buldım bən bu reynəti!
Bənim sirrim ol kəs əyan bilür imdi.

Məlik Doğar ol mənzildən rihlət qıldı,
Yenə də bir mənzil Misrə ancaq qaldı,
Misir içrə həvadan bir ün gəldi:
Bir əziz şəxs Misrə gəlür, deyər imdi.

Məlik tacir sarayına hazır gəlin,
Ol oğlanını görüməgə həvəs qılın,
Adamiyə bənzəməzdür, bayıq bilin,
Ol müqərrəb friştəyə bənzər imdi.

Ol gəlməgi yulaq sizə qutludurur,
Əqli tamam, sözi yulaq datludurur,
Özi arlu, kəndi yulaq mürvətlüdür!
Görüməggə yulaq müştaq olın imdi.

Misir əhli bunı eştib sevnişdilər,
Cümlə ana varımaqğa girnəşdilər,
Ulu, kiçi əgər, övrət dirnəşdilər,
Hər birisi qarşu çıqıb baqar imdi.

Arada bir neçə atlu oğlıq idi,
Ol cümləsi friştələr bayıq idi,
Yusifə eş bulın deyü həq buyurdı,
Yusif birlə Misirə girür imdi.

Arasında Yusif aşar hillə geyib,
Zərif, lətif şofəğindən nurı balqıb,
Qadir Tanrı ol Yusifə ağırlayub,
Yusif aşar qamulardan artuq imdi.

Misir əhli anı görüb qaldı heyran,
Ayıdur lar: Bəs bu degül adəmidən!
Müqərrəbi firiştədür endi gögdən!
Cümləəri ana səcdə qılur imdi.

## YUSİF ƏLEYHİSSƏLAMNIN ŞƏHƏRYƏ GƏLİB GİRMƏGİNDƏ

Qaçan Yusif Misirə yaqın gəldi,
Dürlü-dürlü təam, şərab aldı,
Yusif yeyə nəbatını eyş qıldı,
Dürlü nəbat ənbər kibi qokur imdi.

Məlik qaçan Misir içrə gəldi irsə,
Saray içrə Yusif müqim oldı irsə,
Niqab soyıb yüzin açıq qıldı irsə,
Saraydan nur balqıb tışra çıqar imdi.

Anı görə Misir əhli məcmu oldı,
Məlik tacir sarayına hazır gəldi,
Arzuların ol məlikgə zahir qıldı,
Qulunı bir görəlim, biz derlər idi.

Məlik aydı: On murada irmiyəsiz,
Hərgiz bənim sarayıma girmiyosiz,
Heç Yusifin cəmalını görmiyəsiz,
Birər dinar verməyincə sizlər imdi.



Razı olub birər dinar gətürdilər,
Dəstur alıb sarayına həm girdilər,
Yusif sədiq cəmalını həm gördilər,
Baqan hərgiz cəmalına doymaz imdi.

İkinci gün Misir əhli cümlə gəldi,
İkşər altun həm əlində gülə gəldi,
Yusif yüzin görüməgi arzuladı,
Görən heyran, həm sərgərdan qalur imdi.

Üçüncü gün, törtüncü gün, beşinci gün,
Arturdılar dikməgün birər altun,
Arzuları Yusifini görmək üçün.
Görən hərgiz cəmalını doymaz imdi.

Andan sonra təği ol gün tamam oldı,
Onunçı gün onar altun tamam oldı,
Ulu, kiçi cümləəri gözi gördi,
Hər kim görər bixud olub düşər imdi.

Bir neçələr surət cəmalını gördi,
Bir neçələr surət kəmalını gördi,
Bir neçələr risalətdən halın gördi,
Hər taifə birər dürlü görür imdi.

Surətini görən malın əta qıldı,
Surətini görən canın fida qıldı,
Yigirmi beş min kişilər şahid oldı,
Risalətin görən iman göltür imdi.

Bəs qadirdən hökm təqdir eylə oldı,
Məlik Doğar Yusifini alıb gəldi,
Nühas içrə altun kürsi hazır qıldı,
Yusif ol kürsi üzə oltur imdi.

Münadilər çevrə durub çağırdılar,
Bu oğlanı kim satuba alur derlər,
Qanqı kişi qiymətini bilür, derlər,
Hər kim baha yetikürsə alur imdi.

Munı eştib Misir əhli cümlə bildi,
Ulu, kiçi, bay, fəqiri cümlə gəldi,
Halvaçı, ətməkçi, əttər təmə qıldı,
Hər birisi – "bən alsam", deyür imdi.

Bir qıracıq, bir kələb yib alıb gəldi,
Yusifini almağa ol hazır oldı,
Yusifini görmək üçün hiylə qıldı,
Ol səbəbdən Yusifini görər imdi,

Ravilərdən, rəvayətdə öylə idi,
Qarğa İbni-Talut ana derlər idi.
Ana dəği bu əhvaldan xəbər oldı,
Yusifi ol alımağa gəlür imdi.

Bir dəbəyə mal xəzinə yüküntürdi,
Hər dəbəyə bir qaravaş həm bindürdi,
Cümləsinə birər ziba geyündürdi,
Başlarına mülevvən tac urar imdi.

Bu sifətlə birlə kim ki, hazır gəldi,
Yusifinin cəmalına nəzər qıldı,
Risalətin nurın görib heyran qaldı,
Xaliq sənin, Yusif görkin dinlər imdi.

Yusifə ol sorar: aydur, nə oğulsan?
Bən bilürəm, həqiqəti, qul degülsən?
Ayıtgil, sən kimsən, kimin nəsilisən?
Qanğı sultan oğlanısan? – deyür imdi.

Uşbu hallar hərgiz sana şaiq degül,
Sənə hərgiz qul dedigün bayıq degül,
Hər kim sana söz deməgə layiq degül,
Qanqı kişi sana baha yetkür imdi?

Nə üçündür qayğun, ögüş hazırı bar,
Ğəm-ğüssəyə könlin tülu verür, ey yar!
Ayıtgil bu arada bir nə hikmət var?
Əhvalını başla, bəyan qılğıl imdi.



Cəhan içrə səntək bəşər olmış degül,
Sana bənzər kimsə səfa qılmış degül,
Heç kimsənə sən sifətlu bulmış degül,
Məgər ki, sən fəzl gəldün! – deyür imdi.

Səni eştib cümlə malım fida qıldım,
Səni satın almağa mən hazır gəldim,
Sansız tümən mal, xəzinə yüklətürdim,
Lakin bahan bən yetürə bilməm imdi!

Yusif anın bu sözinə cavab aldı,
Sözin eştib xasü-amlar heyran qaldı,
Gözlərindən göhər kibi yaşlar saldı,
Fəsih dilnən, səhih söznən sözlər imdi.

Aydur: Bənim halımı ol xalıq bilür,
Anın hökmi qullar üzə layıqdurur,
Hər nə qılur irsə ana şaiqdurur,
Bana böylə təqdiri ol qıldı imdi.

Süni birlə bayıq bəni ol yaratdı,
Bunun kibi görklü cəmal ol düzətdi,
Bu qəzanı üstümə həm ol yürütdi,
Anın hökmin heç kimsənə bilməz imdi.

Əgər sana qul görməksə, ala qılğıl,
Hər necə kim layıqdurur bəha qılğıl,
Əgər malın yetməz irsə, səfa qılğıl,
Ayru-ayru əhval sorma bəndən imdi.

Bunı eştib Yusifinin əlin aldı,
Ol Qarğa bin-Talut dərhal mömin oldı,
Yusif ana müsəlmanlıq elam qıldı,
Fəsih dilnən səhih iman götrür imdi.

Mövla Cəlil məğfirəti layıq bildi,
Cümlə malın fəqirlərə ulaş qıldı,
Kəndu özi bir səməğə içrə oldı,
Baqi ömrin anın içrə keçrür imdi.

Xaliqidən məğfirət həm rəhmət oldı,
Andın sonra ələddəvam taət qıldı,
Günahların cümləsünin əfvin qıldı,
Ol günki gün cümlə bəndə qaldı imdi.

*FƏSL*

## TEYMUS QIZI ZÜLEYXANIN YATUBA DUŞUNDA YUSİF ƏLEYHÜSSƏLAMNI GÖRMƏSİ

Qulaq dutub dinləyiniz uşbu sözi,
Ol Züleyxa Məlikzadə Teymus qızı,
Tolun ay tək balqır idi anın yüzi,
Uçmax içrə hüril eynə bənzər imdi.

Ol Teymus idi Məliki məğrib iyəsi,
Yüz bin ərdən artuq idi anın sözi,
Anı yüvlaq artıq etmiş ərş izsi,
Dünya içrə ulu məlik olur imdi.

Dünya içrə ancaq dölət bilür imiş,
Şöylə ikən butə tapu qılur imiş,
Ol Züleyxa anın qızı olur imiş,
Bu əhvalnın əslini həm anlan imdi.

Züleyxa ol Məlik Teymus qızı imiş,
Yastuğı ol atasının dizi imiş,
Duşda görmiş, Yusifinin yüzi imiş,
Anlayuban həm həqiqət bilmiş imdi.

Netə Yəqub ol Yusifi sevər idi,
Yusif Yəqub uyluqında birər idi!
Həm Züleyxa atasına ilər idi!
Bəlkə dəği artuğraq da sevər imdi.

Həm Züleyxa bir gün yatıb uyar idi,
Duşda Yusif surətini görər idi,
Görübəni Yusifi ol sevər idi,
Ağlayuban oyanuban gülür imdi.



Bəs atası sorar, aydur: Nə gülərsən?
Könülindən nə keçürib, nə tilərsən?
Duşın içrə nə görübən nə bilərsən!
Muradını bana elam qılgil imdi.

Züleyxa der: Yatuban bən uyar idim,
Duşım içrə bir ziba yüz görər idim,
Oyağandım ol surəti bən itirdim,
Ol mənidə ağlayuban durdım imdi.

Həm ol surət gözlərimə görnü gəldi,
Xatirimi şeşdi dəği fəhmim aldı,
Əqlim alub səbrimi həm qarət qıldı,
Ələddəvam nəfsim anı onar imdi.

Atası der: Bən həm anı görsə idim,
Bən də anın qandalığın bilsə idim.
Malım, mülkim cümlə fida qılsa idim,
Anı sana qoşurmağa, deyür imdi.

Ol Züleyxa uyqusından məhrum qaldı,
Bir ay kibi görklü yüzi, bənzi soldı,
Yeməkidin, içməkidin məhrum oldı,
Düni-güni Yusif deyə, ağlar imdi.

Bu hal içrə bir yıl dəği tamam oldı,
Bəs Yusifi ol Züleyxa genə gördi,
Öğütləyüb Züleyxaya aydur idi:
Öğütimi eşidübən utğıl imdi.

Bəyan bilgil, bən səninəm sən bənimsən!
Bəndən artuq heç kimsənə bəs bulum sən.
Bən könlümdən öz eşqinə sən salasən,
Bəndən özgə kimsələrə baqman imdi.

Züleyxa həm belə qövlə razı oldı,
Uyusundan oyanıban durı gəldi,
Ol surətin qandalıqın anıb bildi,
Oluq saat bixəd olub düşər imdi.

Atası bu əhval içrə qaldı heyran,
Aşıqlıqa kar qıldığın bildi əyan,
Yemə-bostan içrə qılur dürlü dərman,
Əqli gəlməz, heç darı kar qılmaz imdi.

Əqli şaşdı, yatıb uyqu heç uyumaz,
Təam ərzi qılurlarsa hərgiz yeməz,
Heç kim ilə birlə kəlam söz söyləməz,
Heç təbiblər buna dərman qılmaz imdi.

Üçünci yıl ol surəti genə gördi,
Yulaq olu anıt verib bu gəz sordı,
Ayış bana həq məqamın, qanda dedi?
Həqiqəti, bəni məhrum qoydun imdi.

Yenə bin qul-qaravaşlar verəm belə,
Ələddəvam anın ilə belə ola,
Daim vəqtə anlar sizə xidmət qıla,
Kim Xətai, kimi Rumi ola imdi.

Ol vəqt Mbsir məliki ol Qənzəfr idi.
Yılavçılar biti alıb ana gəldi.
Biti oqıb rəva gördi, riza verdi,
Cavab yazıb rəsul irsal qılur imdi.

Hər kim bəni dilərisə diləyühbən,
Həzar çəndan arzulayub söyləyürbən,
Cümlə malım, mülkim fəda eyləyürbən,
Biyarladım qəbul qıldum, deyür imdi.

Qənzəfrünün yalavaçı gəldi irsə,
Telimusa cavabnamə aldı irsə,
Biti oqub halın zahir qıldı irsə,
Züleyxanı yırağə qalıb göndər imdi.

Bin qatarlı dəvəyə mal yüklətdürdi,
Dəği bin qul-qaravaşı atlandurdı,
Züleyxanı Misir içrə gəlidirdi,
Saray içrə təxt üzərə otrur imdi.



Hərir geydi, tac urındı təxtə aqdı,
Könli açlıb xatirinə işıq yaqdı.
Həman dəmdə on dörtinci bir ay doğdı.
Bənzi nuri, köşki röşən qılur imdi.

Sundı imdi muradıma irdim deyür,
Misr Əzizi cəmalını gördim deyür,
Cümlə malım dərvişlərə verdim deyür,
Muradımın şükranəsin qılam imdi.

Oluq saat bəglər birlə Məlik gəldi,
Bəglər getdi Məlik anda yalğuz qaldı,
Anı görüb ol Züleyxa fəryad qıldı,
Bu nə ərdür, neşə qaldı deyür imdi.

Qardaşları Züleyxaya əhval aydur,
Bayıq Misir əzizi ol Sultan budur,
Həqiqətdə sənin arzun Qənzəfrdür,
Ədəbsizlik qılmağıl sən, derlər imdi.

Munı eştib Züleyxanın əqli şaşdı,
Fəryad qılıb ağınuban yerə düşdi.
Qardaşları anı görə qayğulaşdı,
Anı görə Qənzəfr həm qaçar imdi.

Qaçan da kim, əqli başna gəldi irsə,
Anın halı netəligin bildi irsə,
Qəm-qüssəylə birlə bənzi soldı irsə,
Qardaşları bu əhvalı *sorar* imdi.

Qardaşları aydur: Aya, şahi-cahan!
Sənsiz bizə olmasun heç uşbu cahan!
Məlik görüb uğunuban düşdi heyran,
Uşbu işi bizə elam qılğıl imdi.

Züleyxa der: Yıraq qaldı bənim elim,
Ay vay bəndən ğələt çıqdı bənim halım,
Ey dariğa, ögüş rəncim, uzaq yolım!
Altı aylıq iləmək zay oldı imdi.

Bən duşımda gördugim ol bayıq dögül
Bayıq bilin, bu ər bana layiq dögül.
Bu iraqdı, hərgiz ana yarlıq dögül,
Ağlı, görki anın belə degül imdi.

Dolun ay tək balqır idi anın yüzi,
Bal, şəkərdin datlu idi anın sözi,
Məhzunlara rahət idi iki gözi,
Ansız bana bu cahan xoş dögül imdi.

Bənim ilə ol həm belə vədə qıldı,
Nə mənidən ol vədəyə xilaf gəldi?
Altı aylıq qamu rəncim zaye oldı,
Elim-şəhrim bəndən ayruq qaldı imdi.

Dımaşdılar cümlə ulu qaravaşlar,
Egü söznən Züleyxanı ögütdilər,
Aya, xatun, sən səbr qıl, qatlan, derlər,
Səbr birlə murad hasil olur imdi.

Nə bilürsən, xaliq səbəb qılur irsə,
Ol duşının təvili xoş gəlür irsə,
Muradını mundan hasil olur irsə,
Hacət rəva qılmaq ana qansı imdi?

Züleyxa bu ögütləri rəva gördi,
Ol Misirdə durmaqlığa boyun verdi,
Heç kimsənə bu sirrini bilməz idi,
Qənzənfr həm bu əhvaldan ğafil imdi.

Təlim müddət ilib keçdi, anda güzin,
Ol Züleyxa Qənzəfrdən saqlar özin,
Arzulayı solduradı görklü yüzin,
Əlәddəvam, ol Yusifi anar imdi.

Xaliq saqlar Qənzəfrdən Züleyxanı,
Yusif üçün saqlar idi xaliq anı,
Həm dəği ol Qənzəfr anıb bilməz anı,
Hacət irsə bir Çin qızı gəlür imdi.



Ol Züleyxa heç Qənzəfrə müti olmaz,
Özin saqlar hərgiz ana yaqın gəlməz,
Həm ol Qənzəfr bu əhvalın əslin bilməz,
Çin qızını Züleyxa deb, sevər imdi.

Andan sonra yedi il tam dəği keçdi,
Hallar döndi, təlim illər yortdı keçdi,
Aqibəti Yusif dəği Misrə düşdi,
Misir içrə qul oluban satlur imdi.

Münadilər ol nas içrə yükürdilər,
Bu oğlanı kimlər satun alur derlər,
Görklü yüzdən niqabını götürdilər,
Benzi nuri gün yəqtüsin dutar imdi.

Heç kimsənə anı satun alımadı,
Bəha tikrüb kimsə yaqın gəlümədi,
Misir malı muna bəha olumadı,
Aləm malı ana bəha yetməz imdi.

Ol vəqt Misir məliki həm ol Qənzəfr,
Ol əzizə məlum idi uşbu xəbər,
Doğar oğlun xidmətinə təcil ündər
Qulın gətür biz görəlim, deyür imdi.

Oluq saat əmr qıldı həm ol Qənzəfr,
Köşk önündə eyü meydan bezədilər,
Hərir-ziba döşəkləri döşədilər,
Çevrəsinə təlim kürsi qurlar imdi.

Ol xəlayıq anda cümlə oturdılar,
Oluq saat Yusifini gətürdilər,
Ulu, kiçi ana nəzər yetirdilər,
Meydan içrə kürsi üzrə otrur imdi.

Oşal dəmdə Yusif ana hazır gəldi,
Bənizinin nurı anı rövşən qıldı,
Ol Züleyxa baqıb köşkdən anı gördi,
Həmin dəmdə bixud olub düşər imdi.

Qaravaşlar cümləleri ana uşdı,
Əqli gedib düşdiginə əcəbləşdi.
Aydur: Xatun, nə mənidən əqlin şaşdı?!
Qamuları dirnəşübən sorar imdi.

Züleyxa der: Tutman, qoyun bəni düşəm,
Telim yılğı həsrətimə bən qovuşam,
Fəraq halı-əhvalın da bən sorışam,
Həqiqətdə vüsal güni doğdı imdi.

Oldur, bənim hacətimi yəqin bilin,
Sizlər anı bənim üçün satun alın,
Cümlə malım anın üçün fida qılın.
Neçə bəha dilər isə verin imdi.

Ol firiştə var idi kim, Yusif eşi,
Aydur: Bunu qaçan alur fikmə kişi,
Məgər əziz ola bunun təkin duşı,
Əzizi kim, şahlar ala, bilgil imdi.

Münadilər uluğ ünlə qağırdılar,
Bu oğlanı kimdür satun alur, derlər,
Bunun dürlü hünərləri vardur, derlər,
Hünərlərin birin-birin aydur imdi.

Əvvəl, oldur qəddi yaxşı, zərif üzlü,
Həm ikinci, bənzi yaxtu, görklü yüzlü,
Üçüncisi, fəsih dilli, səhih sözlü,
Yetmiş iki dili tamam bilür imdi.

Dörtincisi, şəfaətlü, mürüvətlü,
Beşincisi, alb yürəklü, həm heybətlü,
Altıncısı, qamulardan qatı qutlu!
Qırq ərdən də həm qüvvəti artuq imdi.

Yeddincisi, dini doğrı, dəyanətlu,
Səkkizinci, xayin degül, əmanətlu,
Toquzıncı, xülqi lətif, ləfzi datlu,
Onuncısı, peyqəmbərlər nəsli imdi.



Əziz anı eşidübən heyran qaldı,
Yusifinin cəmalına nəzər qıldı,
Görücəyi səbri getdi, bixud oldı,
Mütəhəyyir oluban da düşər imdi.

Əziz aydur: Bu oğlanı bana satğıl,
Altun, gümüş gərək isə bəndən alğıl,
Neçə bəha gərək irsə bəyan qılğıl,
Qiymətini müəyyən sən ayğıl imdi.

Ol firiştə, Yusif eşi hazır gəldi,
Xəfyə birlə ol tacirə elam qıldı,
Yusifnin öz ağrı altun dilə, dedi,
Hər mətadan Yusif ağır olsun imdi.

Tacir aydur: Tərazuya altun qoygil,
Uşbu oğlan ağırınca altun saygil,
Hər cinsdən birər dürlü mallar aygil,
Hər birisi oğlan ağrı olsun imdi.

Ol əziz də oşal qovla razı oldı,
Oluq saat xəzinəçi hazır gəldi,
Tərazuya ol beş yüz bin altun saldı,
Altun barı Yusif ağrı olmaz imdi.

Tərazuya telim altun ta olmadı,
Qurtuladı Yusif birlə tən gəlmədi,
Xəzinədə altun, gümüş heç qalmadı,
Mütləqa, mal Yusif ağrı olmaz imdi.

Ağ atlası, müşkü ənbər üzə qoydu,
Yaqut, yincü, mərcan, göhər üzə qoydı.
Bu bəhadan əziz özün aciz duydı.
Tügəl malı Yusif ağrı olmaz imdi.

Əziz aydur: Satumumuz olmaz imiş,
Bəha yetib, şərt yerinə gəlməz imiş,
Aləm malı buna bəha bulmaz imiş,
Qalanını bana bəxşiş qılın imdi.

Tacir aydur: Bu satuya razı oldum,
Tinənincə bu malını bəha aldum,
Qalanını bən sana həm bəxşiş qıldım,
Bu oğlanı minnət ilə verdüm imdi.

Oşal dəmdə ol Yusifi Əziz aldı,
Məlik Doğar Yusif üzə nəzər qıldı.
Alınında nübuvvətin nurın gərdi,
Satuğına peşman oluh sorar imdi.

Ey dariğa, qanı bənim ol dövlətim,
Nəbi, səni bundan əngin biləmədim.
Uşbu nuri alınında mən görmədim
Bu günkü gün işi anda keçdi imdi.

Məlik aydur: Aya Yusif, yüzin örtlü,
Firiştələr sifatılu, sözin dadlu,
Adəmidə göromədim sən sifatlu!
Ayın bana, kimsən, deyib sorar imdi.

Yusif aydur: sana əhval söyləyəlim,
Kim idugim sana məlum eyləyəlim.
Və lakin ol şürutını bildürəlim,
Qamulardan ol sirrini saqla imdi.

Kim idügim bənim dəği bilgil bayıq,
Bən irürvən Yəqub oğlı Yusif sədiq
Ulu dədəm həq Xəlili dürur təhqiq,
Atam Yəqub İshaq oğlı, deyür imdi.

Məlik anı eşitübən oldı məğmum,
Bu əhvalı bundan öndün bilümədüm,
Sədiqidən ayruluban qaldum məhrum,
Peyğəmbəri bəndəlikkə satdum imdi.

Ey dariğa, əgər əvvəl bilsə idim,
Qaçan səni bən kişiyə satsa idim,
Azad eylib atana bən iltsə idim,
Ələddəvam, qul olaydım sana imdi.



Yusif aydur: Bu gəz işi andan keçdi,
Ol Tanrıdan təqdir oldı, tədbir şaşdı,
Bəsarətlər aciz qaldı bilü uçdı,
Həq əmrinə qulu razı görək imdi.

Andan Məlik aydı ana: Aya sədiq!
Qızım vardur, oğlum yoqdur, bilgil bayıq.
Bənim üçün sən bir düa qılgil təhqiq,
Heç gümansız sənin düan qəbul imdi.

Yusif nəbi əl qaldurdı, dua qıldı,
Xaliq anın duasını saya qıldı,
İkirmi dört oğul ana əta qıldı,
Hər birisi dölət yəsi olur imdi.

Məlik bu gəz ol Yusifə genə sordı:
Səni bana o satanlar kimlər irdi?
Neçə satdı, neçə böylə ucuz verdi?
Bu əhvalı bəyan qılsan, bilsəm imdi.

Yusif aydur: Anı bana ayıtma sən,
Həqqi qoyıb batil işə qayıtma sən,
Qammaz olıb şeytan könlin bayıtma sən!
Bu pərdəni açmayalım, örtəm imdi.

Ayrulmaqlıq vəqti gəldi, bəyan bilgil,
Könlin ilə bu iş üzrə safi olgil,
Yusifini gördim deyü yaddan salgil,
Əmanətdür bu razimi saqla imdi.

Andan sonra ol Qənzəfr fikir qıldı,
Yusifini alduğına peşman oldı,
Xəzinədə altun, gümüş yeri qaldı.
Məgər Yusif xeyir qıla, deyür imdi.

Yusif aydur: Şah buyursa, əmir qılsa,
Xəzinədar xəzinəyə nəzər qılsa,
Nə qalmışdur xəzinədə varıb görsə,
Gəlib şaha xəbər versə, deyür imdi.

Andan Əziz xəznədara əmr qıldı:
Xəzinədə nə qalmuşdur, görgil dedi,
Xəzinədar xəzinəyə təcil gəldi,
Xəzinəni dolu malla görər imdi.

Xəzinədar sevinübən gerü gəldi,
Bu əhvalı muştıladı, bəyan qıldı.
Əziz anı eşitübən heyran qaldı,
Bu əhvalı əcəb ilə danlar imdi.

Andan Əziz xəznədardan xəbər aldı:
Bu arada nə məniyi səbəb oldı?
Xali olmış xəzinəmiz nətə doldı?
Bu kəramət, bu bərəkət qandan imdi?!

Xəzinədar aydur: Bu sir bilüməsəm,
Heç mənidən bir əndişə qılumasəm,
Bu əhvalı heç kimsədən bollüməsəm,
Bu oğlan bu sirri yekrək bilür imdi.

Yusif aydur ol Əzizə: Aya sultan!
Bənim mövlam vardurur ol uluq Sübhan!
Həm andandur ol cümləsi uşbu ehsan,
Yoqları var qılmaq ana, anlan imdi.

Bayıq bilin, andandurur bu inayət,
Fəzli birlə əşal qılur bu kəramət,
Bayıq ana telim qıldum, şükür minnət,
Sana zərrə heç minnətim yoqdur imdi.

Xəzinədar aydurur: Bən durur idim,
Ol Yusifnin bəs qatında varur idim,
Kökdən quşlar endigini görür idim,
Adam kibi Yusif ilə sözlər imdi.

Aydururlar: Əya Yusif, bu gəz görgil,
Qiymətinni, neçə olur bu gəz irgil,
Ol xaliqin hikmətinə riza vergil,
Müdam ana sığınğıl sən, derlər imdi.



Bundan-ondan bir güzgiyə baqdunmu, de!?
Güzgü içrə görkin görib ögdünmü, de!?
Az bəhaya, qiymətini begdinmi, de!?
Mənim bəham kim, yekdürür deyün imdi.

Bu gəz görgil qiymətinni neçə buldı?
Xaliq sana inayəti neçük qıldı?
Tükənmiş mal xəzinəyə necə doldı?
Ol xaliqğa şükr-süpas qılgil imdi.

Andan sonra ol Yusifə Əziz oldı,
Hörmətinin qədri necə bayıq bildi.
Əlin alıb Züleyxaya təslim qıldı,
Bu mübarək oğlancığı saqla imdi.

Ya Züleyxa, bu oğlana hörmət qılğıl,
Qədri uluğ ana layiq izzət qılğıl,
Bəndən ana, artuqraq hörmət qılğıl,
Bizim uluğ oğlanımız olsun imdi.

Əziz sözni ol Züleyxa rəva bildi,
Yusifini ağırladı, hörmət qıldı,
Üç yüz altmış dürlü rişdən don eylədi,
Hər gündə bir dürlüsini geyrür imdi.

Yusif aydı: Bu iş neçük rəva ola?
Uşbu tonlar rəvamıdur, yəni qula?
Uşbu işi qamulardan məyub qıla,
Bu tonları Əziz dağı geyməz imdi?!

Ol Züleyxa, bu tonları geygil, deyür,
Geydügini Əziz dəği rəva görür,
Uşbu tonnı bəqiqətdə ol buyurur,
Geysən nurən-əla-nurun olur imdi.

Kəndu əlin Yusifinin başın tarar,
Yincu, mərcan birlə bağlab saçın örər,
Lakin kəndi nəfisindən getdi qərar,
Eşqi endi, heç səbiri qalmaz imdi.

Ol Züleyxa Yusif görkin qiyas qıldı,
Biqərar, həm aciz olub miskin qaldı,
Aqibət ol Yusifinə aşiq oldı,
Gün gəldükcə hər dəm eşqi artar imdi.

Ol Züleyxa haldan düşdi, anda küzin,
Birər saat görməz irsə Yusif yüzin,
Səbri qalmaz anlamaz həm kimsə sözin
Nə sözləsə "Yusif" deyü, sözlər imdi.

*FƏSL*

## YUSİF ƏLEYHİSSƏLAMNINDAN QAN ALDIRMAQ BƏYANINDA

Bədəzanı tənindən qan aldur olsa,
Höccam anın tamarına neştər salsa,
Ələlhal qan aqubanı yerə dolsa,
Yer üzərə "Yusif" adı yazlur imdi.

Müdam əgər köklər bütə nəzər qılsa,
Kök yüzündə yulduzları görər olsa,
Haman dəmdə Yusif anı bayıq bulsa,
Ol yulduzlar "Yusif" deyü, sözlər imdi.

Uşbu halda ol biqərar bixud oldı,
Əhvalını həb Yusifnə zahir qıldı,
Savqınüban Yusifinin əlin aldı,
Əlin tutıb bütxanayə girər imdi.

Aydur: Sənəm, hacətməndə oldum sana,
Uşbu oğlan layişdurur yulağ bana,
Ricam səndin dürür məded qılğıl mana,
Bu oğlanı bana müti qılğıl imdi.

Yalbaruban Sənəmə kob zarı qılur,
Zira mehri ğalib olub səbrin alur,
Xatirindən qalımadı əqli varur,
Ol Sənəmə yalvarur ol, naçar imdi.



Anı görə Yusif nəbi dua qıldı,
Sənəm sındı, uşandı on parə oldı,
Xaliqidən ol Sənəmə əmr gəldi,
Yusif Mürsəl nəbi, deyü, sözlər imdi.

Ol Züleyxa xaliq sünin gördi isə,
Həm Sənəmə uşbu xəbər gəldi isə,
Sənəm sözləb bu xəbəri berdi isə,
Bu əhvalı ol Yusifə sorar imdi.

Aydur: Yusif, uş belə hal nedən buldı?
Bütün ikən Sənəm para nedən oldı?
Yusif aydur: Bunı xaliq belə qıldı,
Bu əməli diləmədi səndin imdi.

Züleyxa der: Uşbu işi əcəbdurur,
Uşbu süni ulu xaliq netə görür?
Həm Sənəmə hurilıqa netə irür?
Sənəm evdə örtüklüdür deyü imdi.

Yusif aydur: Ol subhanım qadirdurur!
Barça halda qullar üzə hazırdurur,
Batin işlər cümlə ana zahirdurur,
Hər kim qanda nə qıldıqın görür imdi.

Ol Züleyxa aydur: İmdi eylə olsa,
Həq xaliqdən bizə gerü məded gəlsə,
Bayağıdək Sənəm dəği bütün olsa,
Aya, Yusif, sən diləsən olur imdi.

Qorquram bən bütxanəyə Əziz girər,
Bu Sənəmi, uş on para olmış görər,
Və əhvalın nətəligin bizdən sorər,
Görəkməz kim, səni suçlu bilə imdi!

Oluq saat Yusif nəbi düa qıldı,
Həm mücibdən icabəti qəbul oldı,
Sənəm ol dəm bayağıtək bütün oldı,
Ol Züleyxa əcayibə qalur imdi.

Andan sonra aşiqlığı əsər qıldı,
Gün gəldikcə eşqi dəği betər oldı,
Bənzi soldı uyqusundan məhrum qaldı,
Yemək–içmək qayığusı getdi imdi.

Məgər bir gün Əziz anda hazır gəldi,
Bu əhvalı təbiblərdən zahir qıldı,
Saqınuban xatununun əlin aldı,
Tamarını tutub rəncin sorar imdi.

Aydur: Bundan sayrulığı bulumazam,
Uşbu rəncə dərman nədür bilumazam,
Uşbu rəncin hərgiz zahir qılumazam,
Həqiqəti aşiqlik kar qılınış imdi.

Ol Züleyxa Əzizə keyd qılur idi,
Əziz anın nə etdigin bilür idi,
Təbiblərə rəncin bəyan qılur idi,
Rəmzi birlə təbibiğa bildur imdi.

*FƏSL*

## ZÜLEYXANIN UYQUSUNUN BƏYANINDA

Ol Züleyxa bir gün yatub uyğu gördi,
Bir dayəsi vardı, andan əhval sordı,
Aydur: Xatun, sana bu hal nədən vardı?
Nə mənidən bu halətə düşdün imdi?

Ya Züleyxa, nə səbəbdən xatirin tar?
Camalını sırğamışdur, nə ğüssən var?
Rəncin bəndən yayutmagıl, qılğıl izhar,
Halın zəif bənzin isə solub imdi?

Ol Züleyxa dayəsinə cavab söylər,
Sirrin cəmin dayəsinə izhar eylər,
Qamulardan bu razını yulaq dilər,
Bu razimi söyləməgin, deyür imdi.



Aydur: Oşal Kənanlı qul oğlanını,
Aya dayə, bilürmisən sən də anı?
Bu əhvalə ol düşürdi bilgil bəni,
Anın eşqi böylə qıldı bəni imdi.

Dayə aydur: Yetikmədən bu hal sana,
Nətə halın demədin sən öndən bana?
Məsləhətlü iş eyüdür inan buna,
Murad bundan həm müyəssər ola imdi.

Bu aşiqlıq aşiqinə bela durur,
Daim məşuq arızısı belə durur.
Aşiq bənzi gündin günə sola durur,
Taqət getib qüvvət isə qalmaz imdi.

Ya kədbanu, aşiqliqə qankəs olmaz,
Heç təbiblər oşal dərdə dərman bulmaz,
Aləm xürrəm olur irsə, aşiq gülməz,
Hər dəm məşuq qayığusı artar imdi.

Züleyxa der: Aya dayə, rast aydursan,
Məsləhətlü bana sözlər sözləyürsən,
Bu günkü gün bənim üçün nə eylərsən?
Yoqsa bu rənc öltürədir bəni imdi?

Hər nə işi buyurusan, anı qılam,
Bən uş sənin əmirinən dəstur alam,
Məgər kim, bu rəncidən bən rahət olam,
Başındağı muradıma irəm imdi.

Dayə aydur: Telimi mal, almaq gərək,
Aşıq kişi malın fəda qılmaq gərək,
Aşıq malı kökdən nisar olmaq gərək,
Aşiq kişi, xəzinə, mal dögkil imdi.

Xatun aydur: Ayə dayə, razı oldum,
Bən sənin bu ögütini rəva bildim,
Malım, mülküm cümləsini fəda qıldım,
Bənim üçün nə qılursan, qılgil imdi.

Dayə aydur: Bənnaları hazır gəlsin,
Sana layiq bir sarayı hazır qılsın,
Elə qılsın, görən ana heyran qalsın
İci əcəb dürlü naxış olsun imdi.

İçinə dürr, mərcan, həm fərş döşərülsün.
Yığacları anda diksün qızıl altun,
Butaqları hər biri bir dürr olsun,
Yemişləri əlvan-əlvan olsun imdi.

Dürlü-dürlü dirəkləri dikək olsun,
Neçə-neçə dirəkləri əqiq olsun,
Yəni anda inci bülül dirək olsun,
Tər qönçəsi dürr, mərcan olsun, imdi.

Ol dirəklər arasına çıbıq salsun,
Ol çıbıqlar cümləəri altun olsun,
Dirəklərnin arasında öküz qılsun,
Ol öküzlər gümüşüdən olsun imdi.

Saf qızılı altundan at qoyulasun,
Göhər, yaqut birlə atı bəzək qılsun,
Çörəsində təlim dürlü yığac olsün
Yemişləri həm altundan olsun imdi.

Ol yığaclar üzəsində quş qondursun,
Ol quşların tikməsi bir dürlü olsun,
Ol sarayın içi, vəsfi belə bulsun,
Qamuları səndəl kökdən olsun imdi.

Ol sarayı bu sifətlü eləsünlər,
Tümən dürlü naqışlarla boyasunlar,
Duvarların sirçə birlə bəzəsünlər,
Müşabeyi altun, gümüş olsun imdi.

Anın için yanar birlə döşətsünlər,
Göhərlərdən qəndilləri dikətsünlər,
Ud, ənbər, müşk, zəfranı doqatsunlar,
Həm münəqqəş, həm müəttər olsun imdi.



Surət yazsun anın səqfi-çörəsinə,
Eylə qılsun dört duvarı arasına,
Bənzəsün ol cümlə Yusif çöhrəsinə,
Yenə sana bənzətüri yazsun imdi.

Ol köşkdə müəyyən təxt oturıqıl,
Əginine dürlü əlvan tonlar geygil,
Təxt üzərə bəzənübən sən oturğıl,
Ol təxt üzrə sən münəvvər olgil imdi.

Qaravaşlar xidmətində ura dursun,
Qızıl – altun məşrəbələr duta dursun,
Müşk – yapar, ud, ənbəri dura dursun,
Səqfi qızıl-altunıdan olsun imdi.

Yusif anda gəlübəni hazır olsun,
Gəlibən bu əcayibə nəzər qılsun,
Anı görüb biqərar, həm bixud bulsun,
Nəcə səbri vardır isə getsün imdi.

Baqıbanı ol təxt üzrə səni görə,
Ümid var kim, boyun verə, müti ola,
Başındağı ol dərdinə dərman qıla,
Muradınız məgər hasil ola imdi.

Züleyxa həm bu sözləri rəva gördi,
Bu hal içrə halı qatı zəif oldı,
Bir gün Əziz gəlibəni ana sordı:
Rəncin nöçük, halın nədür, deyür imdi.

Xatun aydur: Saneilər hazır gəlsün,
Bana layiq bir sarayı bina qılsun.
Saray içrə əcəb dürlü naqış olsun,
Həm içində dürlü suvlar aqsun imdi.

Həman dəmdə Qənzəfr Məlik əmr qıldı,
Ustadları cümləəri hazır gəldi,
Münəqqəş köşk, möhkəm saray bina qıldı,
Ustadları cümlə anda olur imdi.

Züleyxa der: Mərcan birlə zolaq urdı,
Yincü birlə mürəssəyi qılmış idi,
Ərusanə qılıbanı köşkgə girdi,
Bənzi nuri köşki röşən qılur imdi.

Müləvvən ton tonanıdı hərir, diba,
Münəqqəş tac urunıdı oldı hüba,
Münəvvər tac, təxtə ağdı oldı xoca,
Həm münəvvər yəxtü, yüzi balqır imdi.

Əmir qıldı, Yusifini ündədilər,
Səni Xatun oquyın, gəl dedilər.
Ansız Əziz aqil ikən aldadılar,
Əziz bizə dəstur verdi, derlər imdi.

Qaturlayu ol saraya Yusif girdi,
Təxt üzərə xatunını oltur gördi,
Ehtiyatı qılıbanı gerü döndi,
Sızınuban qıya dönüb qaçar imdi.

Ol Züleyxa bu əhvalı bildi isə,
Həm ol Yusif ehtiyatın qıldı isə,
Gəldügînə həm peşiman oldı isə,
Yeti qapuğ bağlayuban yalar imdi.

Tacı geyər, qaş oynatur, gözün süzər,
Sözlədikcə nəfəsindən ənbər tozar,
Həman dəmdə firdövs içrə hurlar gəzər,
Ayağından mərcan qalı qoşar imdi.

Yusif aydur: Xudavəndə, xudavəndə!
Sənin hökmin gəlitürdi bəni bunda,
Bu fitnəyə düşən qula səbir qanda?!
Fəzlin birlə səbri-cəmil vergil imdi.

Bəs Züleyxa ol Yusifə dəlil oldı,
Aşiqanə dəlil ilə həmlə qıldı,
Sıqınuban ol Yusifin əlin aldı,
Oxşayuban kəndu-taba dartar imdi.



Bən uş səni kiçik ikən duşda gördim,
Andan bəri cəmalına aşiq oldum,
Neçə ildir hacətimə bu gün irdim,
Muradımı bu gün hasil qılam imdi.

Bərk-bərk tutdı ol Züleyxa Yusif əlin,
Tolun ay tik balqır idi yeniligin,
Şöylə ikən Yusif dilər ismət yolın,
Qurtar deyü təzərrölıq qılur imdi.

Yusif aydur: Xəlvət saray bizə bənddür,
Huri kibi bu Züleyxa düzə bənddür,
Rəcim şeytan azdurmağa özə bənddür,
Keydilərdən saqla bəni, deyür imdi.

Xudavəndə, əgər eylə bulmaz isə,
İblisləyin görüb peşman olmaz isə,
Murad, ismət, nicat səndən gəlməz isə,
İbn-Yəqub zillət içrə qaldı imdi.

Sədiq Yusif xaliqini daim ögdi,
Həm sədiqlıq, həm sadiqlıq ana dəgdi,
Tonı bağın yedi yerdən möhkəm dutdı,
"Məazəllah"[1] deyüb, həqğə sığnur imdi.

Xalıq aydur: İstianət bana qıldun,
Əvvəl-axır dəstigirin bəni bildün,
Heç qorqıma, məhnətlərdən nicat aldun,
Həm qurtaram, həm mükərrəm qılam imdi.

Yusif aydur: Aya, xatun bulmayalım,
Batil işləb həqğə asi olmayalım,
Fəsad işlə bu günahı qılmayalım,
Səbr qılğıl şeytan məqhur olsun imdi.

Bəs Züleyxa ol Yusifə qarşu durdı,
Cəmalına mədhü səna etü gördi,

[1] Allah, özün saxla!

Cəmalını birin-birin aydur idi,
Gündigicə ögüməgi artar imdi.

Züleyxa der: Ya mehriban mürüvətlu,
Xülqin lətif, yüzün yaxtu, sözin datlu,
Bən bu köşki bəzədüldim sən sifətlu,
Bu saraynın bir nəqşinə baqğıl imdi.

Yusif baqdı saray nəqşin əcəblədi,
Bəgənildi, Yulaq ziba saray dedi,
Aydur: Xatun, bunda Əziz görünmədi,
Əziz dəğı xatun ilə gərək imdi.

Ol Züleyxa bəs Yusifə cavab söylər,
Ol Əzizin bu sarayda nə işi var?
Bu saraynın cümlə nəqşi sana bənzər,
Uşbu köşki sənin üçün yapduq imdi.

Uşbu saray andan sana layiq durur,
Bu kəlaçı məcaz degül, bayıq durur,
Qövlin, felin eşqin datlu yulaq durur,
Sənin eşqin bana əsər qıldı imdi.

Yusif aydur: Bəni Əziz satun aldı,
Suyum, xulqum ol Əzizə lətif gəldi,
Bəgənübən oğulluqğa qəbul qıldı,
Oğul ataya netə xain olur imdi?

Xain əhlin uluq xaliq hərgiz sevməz,
Düşmanlardan əzabını heç göyürməz,
Dərğahinə gələnləri gerü qovmaz,
Səbir qılğıl, həqqə rica olğıl imdi.

Ol Züleyxa Yusif sözni heç anlamaz,
Yusif pəndin heç eşitməz, rəva görməz,
Ana layiq gəlacı heç söz sözləməz,
Nə sözləsə, kəndi sözin sözlər imdi.



Sözlədikcə Yusifini ana söylər,
Kəndusinə razı bulmaz, vüsal boylar,
Yalvarıban təvazölıq telim eylər,
Cəmalının vəsfin tamam aydur imdi.

Aydur: Yusif, sənin sözin necə datli!
Usanmadan dinləməğə nə rahatlu!
Yüzin lətif, kəlaçın xoş mürüvətlu!
Eşitisəm bən, rahətim artar imdi.

Vüsalını dilərim bən can rahəti,
Cəmalın həm quyaş kibi, eşqin qatı,
Ol surətin əcəb türfə, ləfzin yiti,
Xəncər kibi bu canımdan keçər imdi.

Sana bənzər heç kimsənə bulumasvən,
Bir ləhzə sən səzavarım olumasvən,
Səndin ayru bir dəm qərar qılumasvən,
Fəraqın həb qərarımı qomaz imdi.

Ol hilalə bənzər sənin qaşların var,
Saf yincüyə bənzər sənin dişlərin var,
Əcəb ziba, müşk-yapar saçların var,
Kəndu əlin ovumağa layiq imdi.

Əcəb türfə əzim nəhan zülflərin var,
Həlavətlü, mürüvətlü sözlərin var,
Qəmzə qılsa, dilovsunu gözlərin var,
Kirpiklərin, bu canımdan, keçər imdi.

Kəlacın xoş, dilin ziba, kəlamın öz,
Boyın lətif, qədin yaxşı, qamətin düz,
Zəhi dövlət, əcəb baş, ol münəvvər yüz,
Ərz izisi sana ruzi qılmış imdi.

Həm yaquta bənzər sənin yanaqların,
Yaş almadan lətifraqdır sağaqların,
Bal-şəkərdən datluraqdur dodaqların,
Ayaqların könlimizi ötər imdi.

Yeni bitmiş tal çubuqdan barmaqların,
Lölö, mərcan düzülmüşdür dırnaqların,
Kafuridən dəği ağraq saqraqların,
Ol əllərin həm hərirdən yumşaq imdi.

Həqiqətdə sən biqərar qıldun bəni,
Ey dariğa, qaçan ola vüsal güni?
Ələddəvam, görə dursam Yusif, səni,
Görməz irsəm hərgiz səbrim qalmaz imdi.

Əya Yusif, kəlacın xoş, üzin arlu,
Heç kimsənə görmiş degül sən didarlu,
Adəmidən doğmış degül sən tək nurlu,
Analardan sənin kibi doğmaz imdi.

Uşbu sözi eşitdisə Yusif sədiq,
Züleyxanın əzimini bildi təhqiq,
Cavab verdi mürüvətlu, yumşaq, rəqiq,
Pənd-nəsihət verübən nəhy qılur imdi.

Yusif aydur: Ya Züleyxa, pəndim dinlə,
Nə deyürvən fəhm qılıb eşit anla,
Surətindən can ayrılsa şunı dünlə,
Görklü yüzdə hərgiz nuri qalmaz imdi.

Görklü yüzlər kəfən sarıb görükərsə,
Öküş degül gor içində üç gün dursa,
Qanğı dostı gor içərə anı görsə,
Görklü yüzdən yüz döndərüb qaçar imdi.

Gor içində görklü yüzlər görki şeşər,
Yılan-çayan qurt qımırsaq anı aşar.
Qorığ kibi uzun saçlar üzlüb düşər,
Deyimədik bulub surət yatur imdi.

Yiti gözlər görməz olub həm soldacı,
İnci kibi uşaq dişlər töküldəci,
On iki suv cümləsi həm yoq buldacı,
Ət çürüyüb qaqsayuban yatur imdi.



Gor içində təlim görklər pozulıban,
Əti əndam bəndlərindən üzülübən.
Yılan-çayan, qurt qarınca düzülübən,
Ağız-burun, dil tamağdan yüzlür imdi.

Görklü yüzlər gora girsə nurı gedər,
Aldacı qol batil işə dəği nedər?
Təhqiqdürür borclu borcun anda ödər,
Bundan anda borclu varmaq düşvar imdi.

Görklü-görksüz cümləsi yoq oldacıdır,
Gor içərə griftarı qaldacıdır,
Kim nə qılsa, qılduğını buldacıdır,
Sağdan-soldan firiştələr yazır imdi.

Çünki bildün hallar belə olur imiş,
Qullarına mövla hesab qılur imiş,
Qılnan əməl cümlə andan gəlür imiş,
Fəsad işdən yıraq olmaq gərək imdi.

Züleyxa der: Yusif bənim dərdim ayruq,
Durub rücu qılmaqlığa dərmanım yoq,
Fəraq dərdi təlim yutdım, həsrətim çoq,
Vüsal şövqi səbrim ğarət qıldı imdi.

Təlim müddət bən ki, sana söz söylədüm,
Sana layiq bu sifətlu köşk elədüm,
Səni sövdim həqiqətə can eylədim,
Malım, mülküm sana fida qıldım imdi.

Yusif aydur: Bana köşkün heç gərəkməz,
Uçmağ köşki sarayında hərgiz yaqmaz,
Ələddəvam, nemətləri heç əksülməz,
Dünya fani, baqi saray anda imdi?

Züleyxa der: Əya, Yusif, nə sanursan?
Könülündən nə keçürər, nə umarsan?
Ayıt bana sən kimidən qorqarısan?
Yigitlikdən hərgiz zövqin yoqtur imdi.

Yusif aydur: Xaliqidən bən qorqarvən,
Kənduzimi günah işdən bən saqlarvən,
Axirətə ögünübən saqlanurvən,
Anın üçün müti olmaz, bilgil imdi.

Züleyxa der: Sən gəl müti olğıl bana,
Neçə cəfa qılurisən bəndən yana,
Bən mürüvvət qıldım təlim səndən yenə,
Sən xudavənd ən xidmətkar olam imdi.

Bəs Züleyxa Yusifinin əlin aldı,
Yusif dəği bir təbəssüm ana qıldı,
Oluq saət xaliqidən mədət gəldi,
Yazlu-biti gözlərinə gömür imdi.

Oluq saat təhdid üzrə ayət endi,
"Vəlatəqər bilzina"[1], deyür indi.
Həm atası Yoqub nəbi görnügündi.
Barmaq urub ana təhdid qılur imdi.

Çün atası Yusifinə zahir oldı,
Müfsididən ol nəfsini məni qıldı,
Anı görüb ol dəm Yusif səbir buldı,
Ol Züleyxa Yusif üzə yürür imdi.

Həman dəmdə bir firiştə gəldi hazır,
Veribidi ol Yusifə məlik qadir.
Var, Yusifin arqasını sığa deyir,
Sakın olub nədamətin olsun imdi.

"Mən yəməl yöcüz bihi"[2] oldı əyan,
Cəzasını buldacıdur suçı qılan.
Yusif nəbi bu əhvalı bildi bəyan,
Allahından ismət, nəcat umar imdi.

[1] Zinaya boyun qoyma!
[2] Kim nə etsə, ona cavabdehdir.



Uşbu ayət Yusif üzrə məlum oldı,
Hər birisi xof-təhdid elam qıldı,
Müfsididən qurtulmağa mədəd irdi,
Həqğə uyub batil işdən dönər imdi.

Ol Züleyxa tacın soydı, təxtdən endi,
Yusifinin boynun arşu əlin sundı.
Yusif sadiq fəsad, işdən gerü döndi,
Bu büdətni Tanrı görər, deyür imdi.

Ol köşk içrə bir Sənəmi olur idi,
Həm Züleyxa anı məbud bilür idi.
Tonın alıb Sənəmini örtə qoydı,
Aydur: Mənim məbudimi örtdim imdi.

Xaliqidən Yusifinə oldı bürhan,
Xaliq qılur Yusifinə fəzl-ehsan,
Oldur bürhan, oldur ehsan, oldur quran,
Cümlə "lola əmi bürhan"[1], deyür imdi.

Bu əhvalı Züleyxadan Yusif sordı,
Ol sənəmi nə mənidən örtdin dedi.
Ol Züleyxa Yusifinə cavab verdi,
Məbudımdan utanuban örtdüm imdi.

Yusif aydur: Ya Züleyxa, nə iş qıldun?
Bunun kibi aciz məbud netə oldun?
Sən Sənəmi çadirilə örtə qoydun,
Bən Səmədim netə örtsəm olur imdi?

Sənəm məxluq, Səməd xaliq, qadir-sübhan,
Zahir durur ol Səmədə cümlə nihan,
Qurtulmaya kimsə qaçıb hərgiz andan,
Sənəm aciz görməz, dutmaz, bilməz imdi.

Aciz Sənəm möhtac nədür anı yapmaq,
Zəlalətdür Səməd qoyub ana baqmaq,

[1] Görünən bürhanı – dəlili gizlətmək olmaz.

Xəlilüllah fərmanına büdət qatmaq,
Məazallah, ol iş rəva olmaz imdi.

Səməd görər, gördigini heç yanılmaz,
Səməd puşub yazduğını qul anlamaz,
Səməd oqı toqunursa heç ünləməz,
Anı qəti oqı derlər, bilgil imdi.

Bunı eşdüb ol Züleyxa keyd qıldı,
Yusif üzə anın keydi ğalib oldı,
Qaçar deyü Yusifinə güman buldı,
Qəsd qıldı möhkəm dutdı, qoymaz imdi.

Nə qaçarsan, saray şərif degilmidür?
Qəddi cövhər şərifi saf degilmidür?
Şərif özim, sana hərif degilmidür?
Yigitlikdən heç nəsibin yoqmu imdi?

Yusif aydur: Xudavənda, ğəfur ğufran,
Qurtulmağa bulumadı hərgiz dərman,
Fəzlin birlə sən qurtalğıl bəni bundan!
Bunun keydi səbrim ğarət qıldı imdi.

Ol ərhəmərrahimindür məbud Səməd,
Həm dəstigir, həm abid, həm ğofur, əhəd,
Fəzli birlə ol Yusifə qıldı mədəd,
Cəbraili ana irsal qıldı imdi.

Cəlil aydur Cəbrailə: ya Cəbrail!
Təcil varğıl, sədiqimi ögütləgil.
Ol ki, sana layiq degül, qılma degil,
Fəsad işdən nəfsini mən qılsun imdi.

Həman dəmdə qavışdı ol Pühüləmin,
Ol gəlicək pirnur oldı ruyi-zəmin.
Yetikürdi Yusifinə həq səlamin,
Ögütləyib arqasını sığar imdi.



Aydur: Yəqub nəbi oğlı, aya sədiq!
Mövla sana salam-dürud aydı təhqiq!
Bu iş sana layiq degül, yüz döndürcüq,
Fəsad işə bulunmağıl, deyür imdi.

Bir müfəssir böylə aydur: Oldur bürhan.
İlham berdi ol Yusifə qadir olan,
Aydur ana möhnətidən qərib oğlan,
Bu hal içrə bir təfəkkür qılğıl imdi.

Darülməhzun məqamından ibn-İshaq,
Binyəmin didarına yulaq müştaq,
Fəhminən der, əndişə qıl, anlara baq,
Anlar vüsal ümidlərin kəsməz imdi.

Bən qadirdən nübüvvətə çıqnuşduram,
Mədəd birlə sizləri bən savuşduram,
Həsrətləri bir-birinə qovuşduram,
Dostları şad, düşmanı kor qılam imdi.

Qüdrət birlə bən Əziznin canın alam,
Gor içində giriftarı anı qılam,
Bən qadirdən təqdir ilə beylə olam,
Züleyxaya iman əta qılam imdi.

Misr içində ulu məlik olubanın
Züleyxaya əqd-nigah qılubanın,
Züleyxa sən, sən anın olubanın,
Züleyxa xan, sən padşah olun imdi.

Yusif nəbi haqdan ilham buldı isə,
Mövlasından bu işarət gəldi isə,
Xaliq ana lütf ehsan qıldı isə,
Qurtar deyü təvazölıq qılur imdi.

Xaliq aydur: Yüz döndürüb qaçmaq səndən,
Qüdrət birlə yeti qapuğ açmaq bəndən,
Bən qurtaram Züleyxanın möhnətindən,
Dərmandələr dəstgiri bənvən imdi.

Xaliqiğa sığınadı Yusif qaçdı,
Qüdrət birlə yeti qapuğ xaliq açdı,
Səlamət şad olıb Yusif andan keçdi,
Ol Züleyxa uzanuba qovar imdi.

Bəs Züleyxa ol Yusifi qovub yetdi,
Yetibəni ard ətəgin möhkəm dutdı.
Art ətəgi yırtıluban Yusif getdi,
Qatılaşuatış qapuya çıqar imdi.

Əziz anda hazır idi, anı gördi.
Züleyxanın bənzi yavuz düşmiş idi,
Sözinədi, anlara tez əhval sordı.
Sorar aydur, həm təhdidi qılur imdi.

Yügərədi, Əzizə keyd gəldi qıldı,
Aydur: uşbu oğlan bizgə yavuz sindi,
Macaə cəzaən mən ərədə suən[1] – dedi,
"İlla ən yüsənə ov əzabün əlim"[2] imdi.

Züleyxa der: Bu oğlanı zindanlağıl,
Təhdid qılğıl, qorğutqılğıl, öğütləgil,
Əgər yoqsa, bəni qoyub bəniklәgil,
Ədəbsizlik qılumasın, deyür imdi.

Əziz aydur: Aya sədiq, nə iş qıldun?
Uşbu işi bizə netə rəva gördün?
Bivəfalıq qıldun bizə, suçlu oldun?
Bizni xalğa bədnam, rüsvay qıldun, imdi?

Yusif aydur: Aya Əziz, oldur suçlu,
Həqiqət bən arığıvən, ol yazıqlu,
Züleyxanın tanuqı yoq, bən tanuqlı,
Oşal kiçik oğlan tanuq verür imdi.

[1] Pis iş görsəm cəzalanaram.
[2] Yoxsa bəd əməl üçün ömürlük əzaba düçar olaram.



Əziz aydur: Ol kiçik bir tifil oğlan,
On yeti həm gündən bəri yeni toğan,
Sözləmədi ol oğlanı, hərgiz lisan,
Netə sözləb tanuqlığı verür imdi?!

Yusif sədiq aydur: Aya, Əziz sultan!
Qəvidürür, qadirdürür izim sübhan,
Ol sözlətsə, sözləyir ol tifil oğlan,
Toğrılığa tanuqlığı verür imdi.

Bəs ol dəmdə Əziz Sultan əmir qıldı,
Oşal oğlan anasını alıb gəldi.
Həm ol Əziz bu oğlanı əlnə aldı,
Həm oxşayu, həm dinləyü sorar imdi.

Oğlancığa sorar, aydur: Aya tifil,
Aləm içrə hərgiz sənə yoqdır misal.
Uşbu halda nə bilürsən, nədür degil,
Gördügini bizə elam qılğıl imdi.

Fəsih dilin, səhih sözin oğlan sözlər,
Oğlan netə sözlər dügin Əziz dinlər,
Ol oğlanın sözlədigin aləm ünlər,
Oğlan sözləb nə gördigin aydur imdi.

Oğlan der: Bən qəmmazılıq qılamazvən,
Böhtan qılıb həqğə asi olumazvən,
Hərgiz yalğan tanuqlığı bülümazvən,
Xəfyə birlə izim yarı versə imdi.

Aya Əziz, sən bu sözi eşit bəndən,
Ki, anlagil bu övrətnin əsli qandan?
Məlum oldı bu iş Yusif kömləgindən,
Art ətəgi yırtıq, Yusif suçsuz imdi.

Əziz əhval netəkligin bilü bildi,
Yusifinin art ətəgin yırtıq gördi,
Ol oğlanın tanuqlıqın qəbul qıldı,
Züleyxaya, suç səndən, deb buşar imdi.

Əziz aydur: Ya Züleyxa sənsən yalan,
Bəlli oldı, sən idigün suçı qılan,
Suclu oldun, bar Yusifdən üzür dilən,
Töbə qılğıl bu işindin döngil imdi.

Andan Əziz Yusifini ögütlədi,
Bu əhvalı Yusifə həm ismarladı,
Eykü sözin Yusifinə çoq yalvardı,
Züleyxanın razın zinhar saxlar imdi.

Andan sonra sultan Əziz tışra çıqdı,
Ol Züleyxa Yusifinə əhval sordı,
Tifil oğlan mundağ cavab neto verdi?
Bu ibrətə əcayibə qalur imdi.

Yusif aydur: Ya Züleyxa görüdünmü?
Qadir Tanrım qüdrətinə iridünmü?
İbrət görüb fəsad işdən arıldunmı?
Süni birlə tifil oğlan sözlər imdi.

*FƏSL*

## MİSİR XATUNLARI ZÜLEYXAYA GÜLMƏKLİYİNDƏ

Misir içrə bir neçəsi, urağutlar,
Bunı eşdüb bir-birinə dizindilər,
Ol xatunlar Züleyxadan gülündülər,
Hər birisi bir dürlü söz sözlər imdi.

"Ol Züleyxa öz qulına aşiq olmış,
Qulı müti olmamış, xəcil qalmış,
Əziz dəği bu hal üzə hazır gəlmiş,
Həm qulının qaçduğını görmiş imdi".

Züleyxanı eyibləşü, urağutlar,
Hər birisi bir dürlü söz sözləşdilər.
Məlik xatun mundağ eşi qıla derlər,
Dügəl, xalqa rüsvay, bədnam oldı imdi.



Ol Züleyxa bu əhvalı bəyan bildi,
Yuvlaq ulu dilək eləb dəvət qıldı,
Andan-mundan dört yüz övrət hazır gəldi,
Ol övrətlər dəmə keçib oltur imdi.

Ol Züleyxa Yusifini ögütlədi,
Bu gəz bənim bu sözümi tutğıl dedi.
Ündər irsəm, cəhd hazır gölgil dedi,
Cəmalını bu xatunlar görsün imdi.

Kəndi əlin Yusifinin saçın ördi,
Əgininə dürlü əlvan ton geyürdi,
Qızıl-altun tas-aftaba əlnə verdi,
Götürübən ol məclisə iltər imdi.

Urağutlar kürsi üzə olturdılar,
Birər turunc, birər pıçaq gətürdilər,
Əlnə verüb kəskil, deyü buyurdılar,
Ol hal üzə Yusif dəği gəlür imdi.

Yusifinə anlar gözi düşmiş oldı,
Anlar Yusif cəmalına cilvə qıldı,
Ol övrətlər baqıbanı anı gördi,
Turunc sanıb barmaqların kəsər imdi.

Ol Yusifə baqmağa uğradılar,
Əllərini kəsibəni doğradılar.
Əllərini kəsdügini duymadılar,
Ol övrətlər cümlə heyran qalur imdi.

"Və qulna haşa lillah, hazəl bəşər"[1]
Bunun kibi qul kiminin əlnə düşər?
Bunı görən adəminin əqli şaşar!
"İnnə hazəl mələkün kərim"[2] – derlər imdi.

[1] Dedilər ki, bu əsla bəşər deyil.
[2] Bu gözəl bir mələkdir

Züleyxa der: Sizlər əyan gördinizmü?
Bənim bənzim soldığını bildinizmü?
Bir baqmaqdın əllərnizi kəsdünüzmü?
Baykud olıb düşdünüzmü sizlər imdi?

Bən Yusifi görüdigüm yeti yıldır,
Anın üzə aşiqlıqım hər dəm artır,
Miskin özim, eşq odını hər dəm tutur,
Şöylə ikən səbrim sizdən artıq imdi.

Gördünüzmü bənim rəncim əsli qandan?
Bu oğlanın bənzi nuri doğar gündən.
Üzi zərif, görki şirin həzar çəndan,
Yüzin görən canın fida qılur imdi.

Züleyxa der: Ya əmrimə müti ola,
Ya bənim uş rəncimə ol məlhəm bula,
Yaxud məhbus qılam, zindan içrə qala
Tükəl ömri zindən içrə keçsün imdi.

Yusif, hərdəm yalvaruban sübhanına,
Bəni salğıl Qənzəfrinin zindanına,
Düşürməgil batil işin üsyanına,
Batil işdən zindan bana yekrək imdi.

Züleyxanın keyidindən alğıl bəni,
Sığınuram sana yarəb, bulğıl ğəni,
"Yarəb, iscən hübbi ilə tədünəni"[1].
Zindanını bən ixtiyar qıldım imdi.

Cabbar xaliq muradını hasil qıldı,
Rəcim şeytan keyidini batil qıldı,
Züleyxanın möhnətindən ol qurtuldı,
"Müfsidən nəfsin"[2] mane qılur imdi.

[1] Yarəb, məni pis əməldən qoru.
[2] Fəsad nəfsdən.



Xatun aydur: Aya Yusif, bilürmüsən?
Mənə yatrub söylə, müti olurmusan?
Yoqsa, bayıq zindən içrə qalurmusan?
Bu arada nə ixtiyar qıldun imdi?

Yusif aydur: Tanrısına aq olmaqdan,
Asi olub tamuğ içrə kim, qalmaqdan,
Yarınğı gün həzrətində oylamaqdan,
Bugünki gün zindan bana yekrək imdi.

Bunı eştib ol Züleyxa yulaq puşdı,
Arı gəlib xatirinə keydi düşdi.
Yusifinin kəmərini beldən şeşdi,
Hərir, diba tonlarını soyar imdi.

Məlik Rəyyan qapusına hazır gəldi,
Yusifdən Rəyyanına keyd qıldı,
Aydur: Bizim bu oğlancıq asi oldı,
Buyursanız anı məhbus qılam imdi.

Anı ağır bəhayə bən satun aldım,
Cümlə malım bahasına fida qıldım,
Ədəbsizlik ol oğlandın telim buldım,
Bivəfadur hərgiz vəfa qılmaz imdi.

Əmir qıldı Züleyxaya Məlik Rəyyan,
Əgər müti olmaz irsə ol qul oğlan,
Səzavardır ol oğlana səcin zindan,
Dəstur verdim anı məhbus qılğıl imdi.

Bəs Züleyxa oşal dəmdə gerü döndi,
Nacar olub bir sanduğı kim, yondurdı,
Yusifini sanduq içrə məlum qıldı,
Həmmal gətrüb zindanına iltər imdi.

Bu əhvalı Qənzəfr dəği məlum buldı,
Züleyxaya puşunuban keyd qıldı,
Yusif suçsuz, tükəl suçlar səndən, dedi,
Yusifini ol sanduqdan çıqar imdi.

Bağ-buğavın şaşıdurdı, bəm göndürdi,
Hərir diba döşəklər həm döşəndürdi.
Çərisinə xadimləri belə verdi,
Tez çıqarram, heç qorquma, deyür imdi.

Andan sonra ögüş degül bir qaç gündən,
Ol Əzizin canın aldı Məlik Rəhman,
Bir qardaşı vardı anın Məlik Rəyyan,
Sultanlığa Məlik Rəyyan qalur imdi.

Qurtarıdı zindan əhlin Məlik Rəyyan,
Bəs Yusifi çıqarmadı ol zindandan.
Cəbraili verib idi Məlik Rəhman,
Ögütləyib bəq səlamın yetrür imdi.

Bir aq yinci Cəbraili duta gəldi,
Yusifinin ağızına gətrüb saldı.
Təbir elmin hikmətini cümlə bildi,
Həm möcizat, həm risalət oldı imdi.

Yəmənidən Misirə də casus gəldi,
Telim mallar götürübən rişvət verdi,
Xəbbaz ilə ol saqini antlaşdurdı,
Ol Rəyyana ağu verün, deyür imdi.

Məlik Rəyyan bu əhvalı zahir bildi,
Saqi birlə xəbbazını məhbus qıldı,
Telim müddət zindan içrə anlar qaldı,
Əsir olub qayığulu olur imdi.

Ol saqi həm zindan içrə bur duş gördi,
Təbir elmin kimsə bilür barmu, sordı?
Yusif sədiq ol saqiyə cavab verdi:
Duşnın ayıt, bən yorayım, deyür imdi.

Saqi aydur: Bən duşımı eylə gördim,
Üç salqım saf üzümü bən üzüb yedim.
Qızıl altun qədəh içrə dutar idim
Ol Rəyyana sunı verdim, içməz imdi.



Xəbbaz aydı: Bən bəm dəği bir duş gördim,
Başıma çoq ətməkləri götürürdim.
Ol ətməki Rəyyanaya iltərirdim,
İlətmədən quşlar gəlüb qapar imdi.

Yusif bəm ol ikisinin duşın yordı,
Şərabdara eyki təvil ayıdurdı.
Muştularvən bayıq sana nəcat irdi,
Rəyyan səni uluğ qılur, deyür imdi.

Xəbbaza der: Qoruqulu sənin duşın,
Ey dariğa, yulaq düşvar sənin işin,
Həqiqətdə batar bilgil sənin başın,
Heç gümansız, Rəyyan səni asar imdi.

Xəbbaz anı eşidübən qılur fəğan,
Ayduruban görümədim hərgiz əyan,
"Qəza əmr-rəlləzi təsdəqyan"[1]
Yusif aydı: Həq qəzası dönməz imdi.

Ol şərabdır Yusif sözin bavər qıldı,
Cümləleri inanuban mömin oldı.
Zindan əhli Yusifi həb görtü, bildi,
Xəbbaz ol dəm anda kafir qalur imdi.

Andan sonra ol arada üç gün keçdi,
Məlik Rəyyan ol Xəbbazı qıydı asdı,
Anın gəlib göz narından quşlar yedi,
Qamuları əcayibə qalur imdi.

Andın Məlik ol saqiyə xələt dərdi,
Oluq saat əlvan-əlvan ton geyürdi,
Saqiliqə hörmətini gerü verdi,
Yusif ana amanət söz deyür imdi.

[1] Qəza təsdiq edilmiş əmrdir.

Adur: Məni Məlikə bir öldürügil,
Əhvalımı ol Məlikə buldurıgil,
Mən bigünah ayduqımı bildürigil,
"Əcrikə ində rəbbikə"[1] deyür imdi.

Oluq saat ərş izisi uluğ sübhan,
Padişahlar padişahı qadir sultan,
Cəbraili varıbıdı endi gögdən,
Salam yetrüb Yusifinə sözlər imdi.

Aydur: Səni Yəqubuna kim sövdürdi?
Qardaşların bəlasından kim qurtardı?
Darcıq çuqur şol quyudan kim çıqardı?
Rahət-nəcat kim ruzını qıldı imdi?

Ol Züleyxa keyidündən kim qurtardı?
Qüdrət birlə tifi oğlanı kim sözlətdi?
Yeti bağlu qabuğları kim açdurdı?
Müfsididən kim həm xilas qıldı imdi?

Yusif aydur: Bu nemətlər ol Tanrımdan,
Uşbu qamu lütf görəm sübhanımdan,
Uş həmişə bu ehsan ol ğüfranımdan,
Mehnətlərdən ol qurtardı, deyür imdi.

Bəs nə üçün sığınmadun ol xaliqqa?
Xaliqinin hökmün Rəyyan nətə baqa?
Nə kim xaliq hökmü olsa, kimdür yığa?
Uluğlıqu ana layıq, deyür imdi!

Bəs ol Yusif kəndi suçun məlum bildi,
Bu məniden yuvlaq qatı məğbun oldı,
Dedügina peşman olıb töbə qıldı,
Sücud qılıb Tanrısına yalvar imdi.

[1] Mükafatın Tanrının yanındadır.



Oluq saat Cəbraili yenə gəldi,
Xaliqidən Yusifinə salam qıldı,
Tövbən ilə hacətlərin rəva oldı,
Sucudıdan ol başını qaldur imdi.

Bir neçə il zindan içrə qaldığısan,
Aqibəti rahət nicat oldacısan,
Misirinin məlikligin qıldacısan,
Bu möhnətə səbir qılğıl, deyür imdi.

*FƏSL*

## ƏRƏB TURASI YƏQUBNIN HALIN YUSİFƏ SÖYLƏDİ

Ol zamanda Yusif zindan içrə qaldı,
Kənanıdan bəs bir ərəb Misrə gəldi.
Dəriçədən baqıb Yusif anı gördi,
Dava sürüb təcil birlə keçər imdi.

Qaçan ərəb zindanına yaqın gəldi,
Yusif anda idügini Dava bildi,
Yusif, deyü bozıladı, zarı qıldı,
Bən Kənandan gəlürübən, deyür imdi.

Atan Yəqub Kənanıdan görüb gəldim,
Anın halı qürbətinə durub gəldim,
Həsrət-zarı qılduğını görüb gəldim,
Ol məhzunın hər dəm hüzni artar imdi.

Müdam sənin həsrətinni dütar Yəqub,
Aləm içrə heç bulunmas səndən məhbub,
Səni anıb, ağlar düşər yerə uğnub,
Bir neçə vəqt bixud olıb yatur imdi.

Ağlamaqdan iki gözi görməz oldı,
Zəiflıqdan sünikləri durmaz oldı,
Heç qanıca işə-gücə varmaz oldı,
Hər dəmdə ol Yusif deyü ağlar imdi.

Hər dəmdə ol, Yusif deyü ağladuqdan,
Ağlamaqdan qəsdi-hümmət bağladuqdan,
Vüsal anıb fəraq odı çığladuqdan,
Yaş yerinə gözündən qan aqar imdi!

Müdam məğmum olubanı dün gün ağlar,
Anın zarı qulduğını aləm daqlar,
Rəhim mövla rəhmətinə belin bağlar,
Vüsal umar, hərgiz ümid kəsməz imdi.

Yarlı Dava Yusif taba yaqın gəldi,
Yəqub halın Yusifinə zahir qıldı,
Yusif ünn qulağına eşitildi,
Ol qabudan gerü çıqub durmaz imdi.

Yusif üzə xəbər məlum oldı isə,
Dava bozlab əhval elam qıldı isə,
Yəqub halın netəkligin bildi isə,
Ağlab-uğnub yer üzərə düşər imdi.

Oluq saat ərəb tura hazır gəldi,
Dəvəsini ol qapuda çökmüş gördi,
Ağac dutıb urmaqlığa həmlə qıldı,
Ərəbinin adaqın yer dutar imdi.

Ol ərəbi nə qılasın bilümədi,
Adaqını yerdən tartıb alumadı,
Barımağa dəği dərman bulumadı,
Tutuluban heyran olıb durur imdi.

Yusif aydur: Ya ərəbi, nə deyürsən?
Qanca vardun, nə işin var, nə ayürsən?
Bu günahsız dəvəni sən nə döyürsən!
Qandan gəldun, xəbərini vergil imdi!

Ərəb baqıb Yusifini gördi isə,
Ol Yusifə hal-əhval sordı isə,
İnayəti ana osər irdi isə,
Ayağını yer dutdı deb yalvar imdi.



Yusif aydur: Ya ərəbi, məqsəd nədür?
Ayaqların dutulmağı felindəndir!
Ol dəvəni urmağa niyyət nədir?
Xatirindən bu əndişə çıqar imdi.

Ol ərəbi öz suçını tövbə qıldı,
Adaqların yerə qoydı, nicat oldı,
Oluq saat Yusifinin qatna gəldi,
Əlin öpüb, salam, xidmət qılur imdi.

Andan Yusif ərəbiyə xəbər sordı,
Ol ərəbi bəs Yusifə cavab verdi,
Cümlə balın birin-birin ayıturdı,
Ərəb aydır, Yusif dinlər, ağlar imdi.

Ərəb aydur: Bən Kənandan yeni gəldim,
Yük götürdüm bu şəhərə satu qıldım,
Misri qızıl bir altunu ası buldım,
Yüküm satdum uş Kənana döndüm imdi.

Yusif aydur: Uş Kənandan gəlürmüsən?
Kənanda bir qaba yığac bilürmüsən?
On ikidür butaqları görürmüsən?
Ol butaqlar on ikimi tamam imdi?

Ey dariğa, nə yıraqdur Kənan eli!
Firqət əhli kimsələrə düşər yolı!
Əleddəvam əsidükcə Kənan yeli!
Ol yığacdan həsrət qoqsı gəlür imdi.

Ərəb aydur: Anıladım bu sözüni,
Fəhm elədim bildim sənin bu razını,
Amalakin danlayurmən bu rəmzini,
Bu iş içrə nə hikmət var deyür imdi.

Qaba yığac dedügin ol Yəqub durur,
On bir oğlı xidmətinə varub durur,
On ikinci ol Yusifi ğaib durur,
Həqiqəti, qurt yeyibdür, deyür imdi.

Andan bəri yarlı Yəqub oldı heyran,
Gözü yaşı hərgiz donmaz müdam giryan,
Yusifinə qoşulmağa istər dərman!
Müdam həqğə təzərrülər qılur imdi!

Darülməhzun məqamından hərgiz çıqmaz,
Könli məğmum, ağızına təam yıqmaz,
Gözün açıb bu cəhanə hərgiz baqmaz,
Ağlamaqdan iki gözi görməz imdi?

Yusif ğəmi xatirindən heç an getməz,
Ələddəvam ol Yusifi heç unıtmaz,
Ögütləyib heç kimsənin ögtin tutmaz,
Yusif deyib, tağ-taş ilə ağlar imdi.

Yusif anı eşitübən qan ağladı,
Ərəbinin əlin dutıb ismarladı,
Əmanətdür Yəquba sən varğıl dedi,
Ol məhzunə bəndən salam qılğıl imdi.

Ayğıl nəbi, ərəblərin rəsulı mən,
Məhzunların, ğalibinin zəlili mən,
Məcruhların, taliblərin bəşiri mən,
Məhbuslardan xəbər vergil, deyir imdi.

Ol dəm Yusif bəs göndürdi ol ərəbi,
Umızından çıqardı bir biləzini,
Ol ərəbə bağışladı Yusif nəbi,
Bu biləzik bəndən yadgar olsun imdi.

Əmanətdür, ya ərəbi, unutmağıl,
Bu salamı bəcid olğıl, tez yetgürgil,
Bənim halım Yəqubuma ismarlağıl,
Bənim üçün edkü dua qılsun imdi.

Məgər, anın duaları qəbul ola,
Xaliq bana qutlı nicat ruzi qıla,



İnşaallah, mehnətlərdən rahət bula,
Peyğəmbərlər düasını qəbul imdi.

Ərəb aydur: Kim idügin bilsəm deyür,
Görklü yüzin bu gəz sənin görsəm deyür,
Yüzin görüb gümanıdan irsəm deyür,
Yəquba, kim durur deyü, aytım imdi.

Yusif nəbi aydur: Sana aymaqlıqğa,
Həm yüzimdən niqabını soymaqlıqğa,
Dəstur yoqdur uşbu işi qoymaqlıqğa,
Dəstursız iş həm mübarək olmaz imdi.

Yenə aydur: Sana sundum ərməğanı,
Qızıl, yaqut biləzikdən, bilgil anı,
Əya ərəb, zinhar, saqla qiymətini,
Yigirmi min Misri qızla dəgər imdi.

Dünyada bu biləziki sana yetər,
Yigirmi min Misri qızıl qiymət dutar,
Bu dünyanın vəfası yoq, gəlür getər,
Axirətçün duruşmaqlıq gərək imdi.

Həman saat rəva gördi ura durdı,
İcazəti diləyübən yola girdi,
Dünü-güni bu xəbərlə gəldügirdi,
Bu xəbəri yetgürməgə irər imdi.

Aqibəti ol Kənanə tünnən gəldi,
Ertəki gün evdə dəği dolanmadı,
Heç evində soylanmadı, əglənmədi,
Ələlhalı Yəqub üzrə gəlür imdi.

Ol ərəbi Yəqub evnə dünnən gəldi,
Çağıruban tışqarudan salam qıldı,
Dünya çıqub ol əpəbə cavab verdi,
Xəbərin nə? Dünnən gəldin, deyür imdi.

Xəbər verdi Dünyayə həm ol ərəbi,
Aydur: qanda ol qayğulu Yəqub nəbi?
Görüb gəldim Misirdə bən bir ərəbi,
Ol məhzunə salam qılur, sorar imdi.

Dünya bunı eşitibən evə girdi,
Yəqub suçı namaz qılıb durur idi,
Qaçanı kim, sağı-sola salam verdi,
Əhval nədür, kim gəlimiş sorar imdi.

Ol ərəbi ündədilər, hazır gəldi,
Yəqub üzə ol əhvalı zahir qıldı.
Bəs Misirdə bir ərəbi səni sordı,
Zindan içrə məhbus məhcur olmış imdi.

Arzun ana əsər qılmış, taqəti taq,
Sənin yüzin gərməgə yulaq müştaq,
Zindan içrə səndən dua umar yulağ,
Dua qılsın ana nicat olsa imdi.

Yəqub aydı: Heç yüzini görmədünmü?
Adı nədür, qandansan deb sormadunmu?
Nə monidən məhbus olmış bilmədünmü?
Nəşə belə sormadınmı, deyür imdi?

Ərəb aydı: Adın sordım buldurmadı,
Əhvalını hərgiz bana bildürmədi,
Görklü yüzdən niqabın heç göltürmədi,
Elə ikən nurı tıtqa balqır imdi.

Yəqub suçı ol ərəbə dua qıldı,
Aydur: Sənin sözin bana datlu gəldi,
Məhzun könlüm bu dəm içrə rahət oldı,
Bu beşarət şükranəsin qılam imdi.

Ərəb aydur: Ol şükranə bana dəkdi,
Bu dünyada həm muradım hasil oldı,
Bir biləzik həm ol bana bağışladı,
Yigirmi bin Misr qızlına dəgər imdi.



Ərəb aydur ol Yəquba: Ya İsrail!
Bənim üçün axirətlik dua qılğıl,
Məgər bəni yarlıqlaya Mövla Cəlil,
Dünya fani, axrət baqi, deyür imdi.

Yəqub aydur: Ümid dutam mən həbibə,
Fəzlin birlə ruzi qılğıl bu ərəbə,
Qoşdur olsan anı cənnət ol turabə,
Cənnət içrə bana qonşı qılğıl imdi!

Andın fəsih dili birlə dua elər,
Ol duaçı Yəqubıdan hacət dilər,
Həqiqəti Yəqubıdan dua umar,
Axirətin rahətini dilər imdi.

Yəqub nəbi əl qaldırdı dua qıldı,
Xaliqidən icabəti qəbul oldı,
Uçmaq içrə bir zərifcə təxt qoyuldı,
Xaliq ana ol kəramət qılur imdi.

Andan ərəb ayıdur ol İsrailə,
Yalvar deyür ol qəribçün sən Cəlilə,
Bir dua qıl nicat versün ol zəlilə,
Ya İsrail, sən diləyən olur imdi.

Yəqub yenə əl qaldurdı dua qıldı,
Bu duası ol həzrətdə qəbul oldı.
Ol Cəbrail Yusifinə zahir gəldi,
Yusifinə xoş bəşarət gətrür imdi.

Ol Cəbrail gəlüb aydur: Aya, sədiq,
Sana atan duasını irdi təhqiq,
Xaliq sana rahətlikin verdi bayıq,
Şiddətlərdən rahətlığa çıqdın imdi.

*FƏSL*

## YUSİF ƏLEYHİSSƏLAMNIN ON İKİ YIL ZİNDAN İÇRƏ MƏHBUS QALMAĞININ BƏYANI

On iki yıl Yusif zindan içrə idi,
Bəs, Yəqubın duaları ana irdi.
Andan əvvəl anı kim, yad qılduq idi,
Ol mənidən qolay nicat oldı imdi.

Həman dəmdə Cəbrail pək gəldi töcil,
Verib idi Yusifinə mövla Cəlil.
Duşdan idi sana rəhmət rənci, bilgil,
Rahət dəği sana duşdan olur imdi.

Hökm birlə təqdir qıldı qadir dəyyan,
Bir duş gördi Misir şahı Məlik Rəyyan,
Müəbbirlər bu duş içrə qaldı heyran,
Heç kimsənə ana təvil qılmaz imdi.

Rəyyan aydur: yeti simiz sığar gördim,
Cümləsinin arqasına binər irdim,
Birüsindən birüsinə keçər irdim,
Bu duş içrə əcayibə qaldum imdi.

Yenə gördim yeti sığır yulaq zəif,
Yetiləsi yulaq aruq olmış nəhif,
Acılıqdan olmışlar yulaq xərif,
Oşal semiz sığırlarnı yerlər imdi.

Yenə yeti sünbül dəği buğday gördim,
Yenə dəği yeti sünbül quray gördim,
Dəği buğday köggə çıqğay gördüm,
Üç baş buğday girü yerə qalur imdi.

Müəbbirlər buna təbir qılumadı,
Bu duşını anlar təvil bilümədi,
Heç kimsənə uşbu duşu bulumadı,
Heyran qalıb nədamətdə olur imdi.



Bəs anlara Məlik buşüb genə sordı,
Oluq zaman məzkur saqi hazır irdi.
Yusifini anıb öndə baş qaldırdı,
Heyran qalıb nədamətdə olur imdi.

Ol saqinin uşbu halın məlik gördi,
Bu hal içrə nə əndişə qıldun? – sordı,
Bu arada nə hikmət var, ayğıl, dedi.
Nə səbəbdən təfəkkürə qaldın imdi!

Saqi aydur: anlağıl ey şahi cahan
Zindan içrə var idi bir ərəb oğlan;
Elmi-hikmət ruzi qılmış ona sübhan,
Bu duşının təvilin ol bilür imdi.

Məlik aydur: ol oğlannı qanda buldın?
Sən müəbbir iridügin nədə bildün?
Təbir elmin bilidügin nətə bildün?
Nə duş gördün, nə qılıba bildin imdi?

Saqi aydur: Bən zindana vardım idi,
Zindan içrə bir duşu bən gördim idi,
Təvilini ol oğlandan sordım idi,
Anın ləfzi bana qutlu gəldi imdi.

Əqli tamam, elmi kamal, özi arlu,
Yüzü görkli, xülqi yaxşı, həzar dürlu,
Dini islam, işi taət, yüzi nurlu,
Niqab soysa nurı gögə balqır imdi.

Məlik aydur: Ol zindana neşə girmiş?
Nə suç qılmış ol oğlanı, nə işləmiş?
Saqi aydur: İzzi ana qəza vermiş,
On iki yıl zindan içrə qalmış imdi.

Rəyyan aydur ol saqiyə: Yürü, varğıl,
Bən gördigim duş təbirin andan sorğıl,
Xidmətinə ayağını ura durğıl,
Həm rahətlik, həm bəşarət olsun imdi.

Saqi aydur: Bu iş içrə heyran qaldum,
Zira bən ol oğlanıdan uğtlu oldum.
Anı sana andurmaqğa vədə qıldım,
Yeti yıldan uşbu gündə andım imdi.

Ögütlədi ol saqini məlik Rəyyan,
Anın izsi vardurur ol qadir dəyyan,
Cümlə qəza verən oldur, qəza andan,
Heç qayğurma, səni maaf qıla imdi.

Həm ol saqi zindanıya yaqın gəldi,
Zindan içrə Yusifi ol görüb bildi.
Ədəb birlə salam verüb yetü qıldı,
Utanuban yengin yüznə tutar imdi.

Yusif sədiq ol saqiyə ikram qıldı,
Aydur: Bana bu qəzanı Tanrı verdi.
Ləin şeytan bu arada həsəd qıldı,
Utanmagil xətasından döngil imdi.

Bəs anıdan Yusifinə saqi sordı,
Məlik Rəyyan bir əcayib duşı gördi.
Müəbbirlər xatirindən çıqmış idi,
Yulaq buşar, heç kimsənə bilməz imdi.

Yusif sədiq ol saqiyə cavab berdi,
Rəyyan duşnın təvilini aytur idi.
Saqi təcil ol Rəyyana gerü vardı,
Xidmətinə bu əhvalı sözlər imdi.

Məlik Rəyyan bunı eşdüb həm sevindi,
Oluq saət saqiyə əmr qıldı.
Ol, Yusifin qapuğına gerü gəldi,
Rəyyan duşnın təvilini aytur imdi.

Saqi Yusif həzrətinə əl qoşurdı,
Xidmətinə ayağını ura durdı,
Məlik Rəyyan duşını ol Yusif yordı,
Bu təvilin təvilini aydur imdi.



Yusif aydur: Yeti yıl həm bolluq ola,
Əlvan-əlvan nemət ilə aləm dola.
Andan sonra qıtlıq ola, aləm bula,
Yeti yıl həm əzim varlıq ola imdi.

Andan sonra rəhim rəhmət qıldacıdır,
Məxluq ara rahət şadlıq oldacıdır.
Dürlü nemət firavanlıq buldaçıdır,
Əlvan-əlvan dürlü nemət artar imdi.

Məlik Rəyyan xidmətinə gerü gəldi,
Uşbu halı ol Rəyyana bəyan buldı.
Yusif dua həmdü səna telim qıldı,
Saqi elan qılur, Məlik dinlər imdi.

Şərabdara aydur Rəyyan: Görü varğıl,
Yusifini ol zindandan sən çıqarğıl,
Ağır xələt geyürigil, alıb gəlgil,
Zindan ona rəva degil, deyür imdi.

Ol kimsənə bu sifətlu fazil ola,
Elmi-hikmət üzərə ol kamil ola,
Dini dürüst, bənzi yoxtu aqil ola,
Ana izzət ehtiramlar gərək imdi.

Ana ağır xələtlər həm geyürəlim,
Mərtəbələr atına həm bindürəlim,
Qamulara anın fəzlin bildürəlim,
Aləm içrə xaslar xası olsun imdi.

Saqi təcil Yusifinə genə vardı,
Salam verüb, əlin öpüb xidmət qıldı.
Aydı: Ğüssə, möhnət səndən iraq qaldı,
Rahətlıgə muştularvən, deyür imdi.

Yusif aydı ol saqiyə gerü varğıl,
Əlin kəsən övrətləri cümlə dərgil.
Bu işi sən yulaq becid olığılğıl,
Məlik Rəyyan nətəligin bilsün imdi.

Saqi gəlib ol Rəyyana xəbər verdi,
Məlik Rəyyan bu xəbəri səvab gördi,
Əlin kəsən övrətləri cümlə dərdi,
Həm Züleyxa anda dəği gəldi imdi.

Məlik aydır: Məlum qılın halınızı,
Nə mənidən kəsdüniz siz əlinizi,
Züleyxa der: Əfv qılın, oşal bizi
Yusif suçlı degil, suçı bizdən imdi.

Məlik Rəyyan oluq saət əmir qıldı,
Yusif üçün mürəssə köşk hazır qıldı,
Döşəklərin diba, atlas, hərir qıldı,
Bu sifətlü bəzəklə rast qılur imdi.

Şəhər birlə ol zindanın aralığı,
Dört fərsəngi yer idi bəs iraqlığı,
Uşbu qədər iraq idi barmaqlığı,
Məlik aydı: Cümlə ləşkər varur imdi.

Rəyyanının ləşkərləri atğa bindi,
Gəlib zindan önünidə atdan endi.
Yusifini çıqaruban alıb gəldi,
Xələt geyrüb cümlə şadlıq qılur imdi.

Yusif sədiq zindanıdan xilas oldı,
Zindan əhli yığlaşuban anda qaldı,
Bəs anlara Yusif sədiq dua qıldı,
Duasını mücib qəbul qıldı imdi.

Zindan əhli Yusifini dilər andan,
Təqdir birlə qurtardı qadir dəyyan,
Azad qıldı zindan əhlin məlik Rəyyan,
Yusifinə bağışladım deyür imdi.

Misir əhli cümlələri qarşu gəldi,
Yusifinin yüzin görib rahət oldı,
Altun, gümüş, yincü, mərcan nisar qıldı,
Xasü amı şad oluban yükrür imdi.



Yusif telim şükür qıldı Sübhaninə,
Şükür sipas telim qıldı ğüfraninə,
Andan sonra salam verdi Rəyyaninə,
Yetmiş iki lüğət birlə sözlər imdi.

Dürlü-dürlü ol Rəyyanə mədh qılur,
Sözin eşdən əcəbləyü beyran qalur,
Yüzin görən adəmilər rahət olur,
İçlər duyub susamışlar qanda imdi.

Rəyyan gördi ol Yusifin cəmalını,
Əcəblədi xilqətini, kəmalını,
Fida qıldı ol süninə həm malını,
Mülkəti sən buyuruq ol, deyür imdi.

Mövla verdi ol Yusifə dövlətü təxt,
Fəzli birlə ruzi qıldı məmləkət, bəxt.
Məlik Rəyyan Yusifini bəgəndi səxt,
Məmləkətim sana layiq, deyir imdi.

Tac örəndi, təxtə ağdı Yusif nəbi,
Otuzyaşar yigit buldı həq həbibi.
Bənzi nurı rövşən oldı günəş kibi,
Ona baxan gün əksini görər imdi.

Əqli kamil, elmi-hikmət tamam bilür,
Müddəilər dəvalaşu ana gəlür,
Xasü amə səhih dürüst hökm qılur,
Heç kimsəyə cövr-sitəm qılmaz imdi.

Andan sordı ol Yusifə Məlik Rəyyan,
Nə mənidən elmin öğüş, edkü oğlan?
Yusif aydı: Əta qıldı qadir Sübhan,
Bu xüdayə ruzi qıldı, deyür imdi.

Məlik Rəyyan bu əhvalı bəyan bildi,
Bəs Yusifə gerü döndi, mömin oldı,
İslam dinin bəgənibən rəva gördi,
Anı dutıb, məmin-müxlis oldı imdi.

Bildim sənin dinin təhqiq bayıq durur,
Sana munı ruzi qılan xaliq durur,
Badişahlıq bəndən sana layiq durur,
An əmrinə boyın vermək görək imdi.

Həman dəmdə ol Cəbrail hazır gəldi,
Xaliqidən Yusifinə salam qıldı.
Ol Yusifə xoş bəşarət muştuladı,
Rəyyan sana səbəb durur, deyür imdi.

Yusif nəbi Cəbraildən xəbər bildi,
Xaliqiğə şükür-minnət telim qıldı,
Cəmalindən hur ərşidən aciz qıldı,
İşlər üzrə tədbir, hiylə qılur imdi.

Ədlü-dadi xəlayiqə qılı gördi,
Buyurıdı aşılığı eyndürdi,
Cəhd qılıb yetimləri geyüdürdi,
Ögüş anbar aşılıqnı yığar imdi.

Misir içrə yeti yıllıq genlik oldı,
Dürlü-dürlü nemət ilə aləm doldı,
Ol hal keçdi, yeti yıl də darlıq buldı,
Qayğuruban əkin əkmək deyür imdi.

Yeti yıl da kökdən yağmur heç yasmadı,
Yenə değı yerdə nəbat heç usmadı,
Yenə də həm uslı yeli heç əsmədi,
Yulaq məhzun darlıq qarşu gəlür imdi.

Əziz Yusif ol şəhərə çəri böldi,
Misir əhli cümlə anda hazır gəldi.
Altun, gümüş berübəni aşlıq aldı,
Qızıl altun təngə yetib satar imdi.

İkinci yıl at-qatırın anlar sürdi,
Üçünci yıl gələ-qumaş həm götürdi,
Dörtinci yıl mülketini tamam verdi,
Beşinci yıl oğul, qız həm verür imdi.



Kənduları qul oldular altıncı yıl,
Həm Yusifə satınırlar bayıq bilgil,
Oğul, qızla Yusifinə buldılar qul,
Şəhər əhli cümləsi qul olur imdi.

Xaliq ana Cəbraili varıb idi,
Aya Yusif, şükür sipas qılğıl, dedi,
Misir əhli cümlə sənin qulun oldi,
Səni satan həm sana qul olur imdi.

Darlıq içrə altıncı yıl tamam oldı,
Heç anbarda tamam aşlıq həm qalmadı,
Yusif nəbi bu hal üzrə fikir qıldı,
"İlahüna məded səndən"[1], deyür imdi.

Həman dəmdə ol Cəbrail gəldi bazır,
Varib dedi, ol Yusifə, Məlik qadir,
Hər ayda bir surətinni qılğıl zahir,
Aya Yusif, qüdrətimi görgil imdi.

Yusif nəbi el, şəhərə xəbər verdi,
Ertə qamu meydana həm varın, dedi,
Bənim görklü cəmalımı görün, dedi,
Acılıqdan hər kim baqsa doyar imdi.

Uluğ, kiçik, xas-amlar hazır gəldi,
Ol Yusifin cəmalına nəzər qıldı,
Yemək-içmək qayıqusı cümlə qaldı,
Bakan hərgiz cəmalına doymaz imdi.

Ayda bir göz Yusif nəbi çıqar idi,
Görklü yüzdən niqabını soyar idi,
Uluğ, kiçik, bay-fəqir baqar idi,
Bir ayğaca kimsə tamam yeməz imdi.

Həqiqətdə heç gümansız bayıq bilgil,
Hər kiminə sataşa sən alıb gəlgil,
Konduzinə bəs sən anı vəzir qılğıl,
Xaliq əmri bəylə durur bilgil imdi.

## YUSİFİN VƏZİRİ BƏYANIDIR

Peyki-həzrət Cəbraili gəldi hazır,
Verib idi Yusif üzə Məlik qadir,
Aya Yusif, Cəlil Əmri eylə durır,
Ertə çeşmin birlə seyran qılğıl imdi.

Yusifin bir tazı atı olur idi,
Ol tazinin adəti həm şöylə idi,
Hər qaçan kim, əyərlənsə kişnər idi,
Misir əhli cümlə anı eşdür imdi.

Əziz Yusif ayda bir gəz çıqar idi,
Tazi öndən cümlə ləşkər dirlər idi,
Yusif dedi qulları at gətür idi,
Tazi kişnəb ol dəm ləşkər gəldi imdi.

Əziz Yusif qullarına əmr qıldı,
Ol tazini əyərlədi, hazır gəldi,
Tazı kişnəb binəsini hazır qıldı,
Barı ləşkər ol dəm təcil gəldi imdi.

Oşal dəmdə hacib əskər cümlə gəldi.
Bəg qaanlar cümlə şaha xidmət qıldı,
Padişahi Məğrib suçı hazır oldı,
Şah binubən tamaşaya çıqar imdi.

İki yüz bin irəşərdür sağ yanında,
İki yüz bin dəği aşar sol yanında,
İki yüz bin irəşərdür ön yanında,
Şol qədəri artınıdan aşar imdi.

Altun, gümüş yaşıl ələm götürdilər,
Artunıdan yüz bin kişi hərir atar,
İki yüz bin çövrəsində qılıc dutar,
Bu heybətlə sarayından çıqar imdi.



Ol sultanı görənlər də dinləşürlər,
Qamuları xası amlar sözləşürlər,
Heybətindən düşmənləri titrəşürlər,
Vəsfin eşdən cümlə heyran qalur imdi.

Əziz Yusif bu sifatlu üşar idi,
Bir ğəribə sataşıdı baqdı gördi,
Ol ğəribin tanı yulaq eski idi,
Yusif aydur: Bana layiq dögül imdi.

Bu günki gün Misir şahı olur irsəm,
Xaliqimdən sifatılu dövlət görsəm,
Kənduzimə uş bunı bən vəzir qılsam,
Bənim qədrim layiq dögül, deyür imdi.

Oluq saat ol Cəbrail hazır gəldi,
Xaliqidən Yusifinə salam qıldı,
Xatirindən bu əndişə çıqar, dedi,
Bu saqıncı sana layiq degül imdi.

Züleyxayi səni fisqğə tartduğından,
Anın keydi sənin üzrə artdığından,
Sən qaçıban art ətəgin yırtduğından,
Ol əhvalı, əya Yusifə, anla imdi!

Oşal halda ol bir aylıq oğlan idi,
Sənin halın beşigindən baqdı gördi,
Gör tanuqlıq sənin üçün nətə verdi,
Nə mənidən sana layiq dögül imdi?

Yusif sədiq bu əhvalı bəyan bildi,
Ağır xələt geyüridi alıb gəldi,
Bəgənübən kənduzinə vəzir qıldı,
Həm ol dəğı mömin, müxlis oldı imdi.

Yusif savçı oğlan ikən bir duş gördi,
Netək kimi anda elam qıldı imdi.
Bəd ezanı ğəm ğüssələr telim büldi,
Telim dürlü şiddətləri artdı imdi.

*FƏSL*

## TƏZVİCİ-YUSİF ƏLEYHİSSƏLAM

Andan sonra ol Cəlildən rahət irdi,
Cəbrail gəlübəni xəbər verdi,
Aya Yusif, ol şiddətlər nədən idi?
Cəlil sana elam qılur bilgil imdi.

Heç gümansız şəfaətin döndürməgil,
Məhrumları dar quyuya endürməgil,
Böhtan qılıb bəla odın yandurmagil,
Məhbuslara sən mehriban olğıl imdi.

Şiddət keçdi mövla sənə rahət verdi,
Yulaq ulu hörmət qılıb dölət verdi,
Padişahlıq qılasan sən görgil dedi,
Əmanətdür nəhy işdən saqlan imdi.

İmdi bu dəm şiddət getdi, rahət oldı,
Misir içrə yulaq uluğ mülkət oldı,
İzi səni ulu Məlik ruzi qıldı,
Tükəl işni əhsan birlə işlən imdi.

Hər ayının yenikisi olduğından,
Ləşkər dərib cümlə hazır gəldığından,
Əziz Yusif bilib seyran qılduğından,
On səkkiz bin qulam birlə çıkar imdi.

Fəzli birlə xaliq anı qıldu yarlu,
Hökmi rəvan, əqli təmam, özi arlu,
Dini bütün, elm təmam yüzi nurlu,
Yüzin görən canın fida qılur imdi.

Ol Züleyxa zəif oldı, gözi görməz,
Təam, libas alımağa əli irməz,
Qarı oldı, Yusif anı görüb bilməz,
Ol Yusifi heç unutmaz, bayıq imdi.



Yusifinin yolı üzrə müqim oldı,
Ömrin anda keçirməgə niyyət qıldı,
Ol biçarə Züleyxaya bu xoş gəldi,
Şol yol üzə hərdəm eşqi artar imdi.

Əlddəvam ay yenisi olduğundan,
Tazi kişnəb, ləşkər dərlib, gəlduğından,
Əziz Yusif binib seyran qılduğından,
Ol Züleyxa yolda fəryad qılur imdi.

Uşbu halın Züleyxanın Yusif bilməz,
Zira Yusif heç an ana yaqın gəlməz,
Anın üni qulağına eşidülməz,
Zərb-nağara, burğu ögüş çalnur imdi.

Həm Züleyxa müdam məğbun gerü dönər,
Göyüdürü, həsrət odı bağrın yaqar,
Ağılayu Yusif sarı daim baqar,
Əlddəvam ümidini kəsməz imdi.

Ol Züleyxa telim yillər belə qaldı,
Bu hal içrə həm sərkərdən, aciz oldı,
Tapunduğı sənəminden yüz döndürdi,
Bənim halım belə imiş bildüm imdi.

Əziz idim, bən dul, ğərib, aciz qaldım,
Yusif eşqi səbəbindən zəlil oldım.
Əhvalımı bu gün sana zahir qıldım,
Səndən məqəd yoqmış deyü bildim imdi.

Misir içrə uluğ xatun olur idim,
Aləminin sərvərligin qılur idim,
Andan bərü məbud səni bilür idim,
Heç mənidən rahətligim tikməz imdi!

Bayıq Yusif bənim qulım olur idi,
Übudiyyət, həm din bənə qılur idi,
Müdam həm də xidmətimə gəlür idi,
Hər də ana ulu Məlik olur imdi.

Ol Züleyxa ol Sənəmə güman qıldı,
Sənəmidən gerü döndi, mömin oldı.
Sənəmini soyıb uştıb həlak buldı,
Çıqaruban bazarıda satar imdi.

Bəd əzanı yenə də ay tamam oldı,
Yusif yenə atlanuba hazır gəldi,
Ol Züleyxa çaqıruban fəryad qıldı,
Aya Yusif, bundan bana baqğıl imdi.

Qadir Səməd Züleyxaya mədəd verdi,
Anın ünün Yusifinə eşütdirdi,
Ünün eşdüb Züleyxanı Yusif gördi,
Gözün sezməz doğrı durıb baqar imdi.

Ol arada tazi başın Yusif tartdı,
Həm qatına gəlübəni əhval sordı,
Nə kişisən, nə hacətin gərək? Dedi,
Ayıt bana hacətini verim imdi!

Ol Züleyxa aydur: Aya, şahi-cahan,
Halım zəif, gözim görməz, bilgil əyan,
Misr ayası əziz cüfti Züleyxavən,
Bən ol haldan belə hala düşdüm imdi.

Əvvəldə bən səni satun aldum idi,
Cümlə *malım sana fida* qıldım idi,
Sən eşqinin bən heyranı oldum idi,
Bu günki gün uşbu halə düşdüm imdi.

Cümlə çıqdı uş əlimdən ögüş nemət,
Heç qalmadı soulıdı mal-mülkət,
Vəlakin heç soulmaz bu eşq-həsrət,
Əlddəvam, qalib olıb artar imdi.

İqrar qılıb inanıdım bir cəbbarə,
Həm inandum sən Yusifi-peyğəmbərə,
Heç gümanım qalımadı möbidlərə,
Behəmdüllah mömin-müxlis oldım imdi.



Yusif gördi Züleyxanı əsrükədi,
Şol hal içrə arzu, eşqə əcəb gəldi.
Şol sözinə inanmadı həqiqəti,
Azımayış qılıb bayıq sorar imdi.

Ya Züleyxa qanı sənin gəncü malın?
Ziba boyın, uzın saçın, incə belin?
Dolun ay tək balqır idi xub cəmalın,
Sən ol haldan beylə hala düşdün imdi?

Züleyxa der: Cəmalın, həm malım verdim,
Sənin üçün cümləsini fida qıldım,
Ol bəxtimdən, həm təxdimdən gerü qaldum,
Sənin eşqin bana əsər qıldı imdi.

Yusif aydur: Bilür bən gər aşiq irsən,
Eşq üzərə əgər gerçək sadiq irsən,
Aşiqliqin dəvisini qıluq irsən,
Bu dəviyə uş bir bürhan gərək imdi.

Ol Züleyxa aydur: İmdi yaqın gəlgil,
Kərəm qılub qamısını bana vergil,
Aşiqlığa irsəm bəni bəllü bılğıl,
Degul irsəm uşbu dəvım batım imdi.

Yusif ana qamçısınu sunı irdi,
Bir ah qılub qamçısını gerü verdi,
Qamıçısı oda düşdi yanar idi,
Həman dəmdə Yusif əlin dutar imdi.

Qamıçını buraqıdı Yusif sədiq,
Züleyxanın ol eşqini bildi təhqiq,
Heç gümanı qalımadı qıldı təsdiq,
Əcəbləyüb at inanın dartar imdi.

Züleyxa der: Aya Yusif, inandunmu?
Qamıçunın tutaşduğın anladınmu?
Kəndu əlün yandığını duymadunmu,
Qırq yıldur ol odı bəni yakar imdi.

Yusif sədiq bu ibrəti əcəblədi,
Züleyxaya nəsihətlə ögüt verdi.
Ya Züleyxa, ümid var kim, vədə irdi,
Şiddət keçdi, rahət gəldi, bilgil imdi.

Həman dəmdə pək Cəbrail hazır gəldi,
Həq səlamın Yusifinə həm yetkürdi,
Oşal xatun oğul-qızdan üzülüşdi.
Həqqə yetüb təzərrölıq qılır imdi.

Əya Yusif, mövla sənə salam dedi.
Həqiqəti, bəni sənə verib idi.
Züleyxaya əqdi-nigah qılsun dedi,
Sən padişah, ol xatunın olsun imdi.

Cəbraildən Yusif nəbi bunı bildi.
Züleyxaya məqamına gerü irdi,
Bu əhvalı muştıladı həyan qıldı,
Ya Züleyxa, rahət irdi, deyür imdi.

Anı eştib əl Züleyxa əldı məğmum!
Xudavəndə, bənim sirrim sana məlum!
Cəmalımdan, həm malımdan qaldım məhrum!
Özüm qarı, iki gözüm görməz imdi.

Sən qadirdən əmr təqdir belə olsa,
Gözlərimin nurı getdi, yenə gəlsə,
Həm cəmalım Yusifinə layiq olsa!
Mövladan bu inayəti umar imdi.

Oluq saat ol Cəbrail hazır gəldi,
Qanatilə sığayıban dua qıldı.
Züleyxanın gözi gördi, yigit oldı,
Bənzi nurı dolun ay tək balqır imdi.

Yusif nəbi ol dəm uluğ dəvət qıldı,
Züleyxaya ol dəm əqdi-nigah buldı.



Böyüklərni ündədilər hazır gəldi,
Yulaq uluğ bəşarətlər olur imdi.

Andan anlar ikiləsi xəlvət oldı,
Yusif nəbi Züleyxanı bikr qıldı.
Züleyxanın əlin dutdı Yusif sordı:
Xaliq səni bənim üçün saqlar imdi.

Ol Züleyxa Yusifinə cavab verdi:
Xaliq bəni sənin üçün saqlar idi.
Bana bənzəş bir div qızı gəlür idi,
Ol Qənzəfr anı bən deb sevər imdi.

Yusif aydur: Anlarmusan oşal güni,
Batil işə ündər idün kim, sən bəni.
Məazəllah, qılsa idük biz kim, anı,
Bu murada yetməz idük, deyür imdi.

Ol Züleyxa aydur: Əya sədiq nəbi!
Urma bənim yüzimə sən ol eyibi.
Fəzli birlə saqladı ol mövla bəni,
Səni bəni ol bəladın, deyür imdi.

Dolun ay tək balqur idi bənzin nəqşi,
Söylər irsən sözləməkə sözün yaxşı,
Xaliq sana əta qılmış uşbu bəqşi,
Səni görüb kimin səbri qalur imdi?!

Züleyxa der: Şükür minnət əzi qıldı,
Həm hacətim, həm muradım hasil oldı.
Həm cəmalım, həm dölətim gerü gəldi,
Şükür minnət ol mövlayə qıldım imdi.

Andan sonra həqdən təqdir eylə gəldi,
Ol ikinin baqi ömri bəylə oldı.
On iki həq oğul ana ruzi qıldı,
Ulusuna Məsalimi derlər imdi.

## KƏNAN ŞƏHƏRİNDƏ ACLIQ BULUB MİSİR ŞƏHƏRİNƏ YƏQUB ƏLEYHİSSƏLAMNIN OĞLANLARININ BARIB GƏLMƏ BƏYANI

Kənan eli yulaq qatı qıtlıq idi,
Yəqub savçı oğlanların həm buyurdı.
Aydur: Darlıq bizə yulaq əsər qıldı,
Aşlıq alun, Misrə varun, deyür imdi.

Bizim eldə xeyir işi heç qalmadı,
Əlimizdən xeyirli iş heç gəlmədi.
Darluq bizi munkuladı, heç ögmədi,
Ya oğlanlar, Misrə varın, deyür imdi.

Aşlıq imiş Misiridə bulnur satun,
Padşahı mömin imiş, dini bütün.
Yükı ilə satuqlanız, yoqdur altun,
Ol Əzizə bizdən səlam qılın imdi.

Bu on qardaş dovə binüb yola girdi,
Onulası barımağa əzim qıldı,
Beniyəmin varmadı, evdə qaldı,
Kənanidən Misrə varur olar imdi.

Yolda barub bir kərvana sataşdılar,
Əslin-nəslin bir-birinə soraşdılar,
İsmayılın nəslindənmiş bilişdilər,
Biz İshaq nəsiliyüz, derlər imdi.

Yəqub savçı əhvalını anlar sordı;
Məhzun Yəqub Yusifisiz nelər, dedi,
Bəs Yəhudə anılara cavab verdi,
Yəqub halı düşvar olmuş deyür imdi.

Bunlar dəği anılara əhval sordı,
Ol Misirdən gələnlərə cavab verdi.
Aşlıq anın netəligin, anlar bildi,
Alqışlaşu Misrə taba barur imdi.



Mövla Cəlil Cəbrailə həm buyurdı,
Yusifinə qardaşların muştuladı,
Bəs anılar ol dəm Misrə əzm qıldı,
On üç gündən sonra Misrə yetər imdi.

Əziz Yusif Cəbraildən xəbər bildi;
Qardaşları gəldiginə şad-kam oldı,
İzisinə həmdü sena telim qıldı,
Gəldüklərün yuvlaq rəva görür imdi.

Qaçan yetib, qardaşları gəldi isə,
Cəbraili gəlib xəbər berdi isə,
Qardaşları yüzün Yusif gördi isə,
Oğunuban taxtdan yerə düşər imdi.

Bəd əz an Yusifinin əqli gəldi,
Vəzirləri bu işinə heyran qaldı,
Aydur: Şahim, bu hal sana nətək dəkdi?
Əqlin şaşıb bixud olıb düşdün imdi?

Yusif nəbi vəzirinə əhval sordı:
Bilümüsən qandan gəlür şunlar, dedi,
Vəzir aydur: Bəs beş gündür bular gəldi,
Ərəbidür, anlar barıb, deyür imdi.

Yusif aydur: Ol irənlər qandan gəlür,
Sordunızmu anlar bəndən nə istəyür?
Vəzir aydur: Ol irənlər bunlar dürür.
Aşlıq üçün Kənanidən gəlmiş imdi.

Yusif aydı: Bir sarayı qılın xəlvət,
Anın içrə hazır qılın dürlü nemət,
Ol qovmi sən hazır qılğıl uşdu saat,
Kəndu başın ana xidmət qılğıl imdi.

Vəzir əvvəl irənləri alıb gəldi,
Dürlü nemət, əlvan təam hazır gəldi,
Önlərində ayağına ura durdı,
Təvazölıq birlə hizmət qılur imdi.

Qaçan anlar göridilər bu neməti,
Vəziridən bulıdılar bu xidməti,
Ol təşrifi, ol izzəti, ol hörməti,
Cümləleri əcayibə qalur imdi.

Bu əhvalı telim dürlü sözləşdilər,
Məlik bizdən məgər ögüş altun dilər?
Anın üçün bizlərə ol əhsan eylər?
Altunımız yoq idügin bilməz imdi?

Şəmun aydı: Atamızı Məlik bilür,
Atamızı ağırlayub hörmət qılur,
Yəqub rəsul idüginə müqir gəlür,
Ol mənidən bizə müştaq olur imdi.

Andan aydur: Ol Yəhuda bilin əyan,
Cümləmiz biz yoqsuzlarız qamulardan,
Əziz bizim halımızı bilür bəyan,
Ol səbəbdən bizə təklif qılur imdi.

Bəs Rəvail aydur: Bu şah adildürür,
Bizim zəif halımızı gözi görür.
Əsirgəbən bizlərə həm ehsan qılur,
Adil kişi ğəribləri sövər imdi.

Yusif anı eşidübən zarı qıldı,
Qardaşların cümləsini görtü, bildi.
Yəhudanı Şəmun ilə ayırmadı,
Ol Cəbrail gəlüb elam qılur imdi.

Andan Yusif buyurdı ol Məsalimə,
Su qoyığıl, bənim ol xas məşrəbəmə,
İlətgil ol ğərib, əziz əşal qövmə,
Cümləsinə saqilıq sən qılğıl imdi.

Su içirüb cümləsinə xidmət qılğıl,
Əmanətdür qamulara hörmət qılğıl,
Andan-mundan gəldüklərin məlum bilgil,
Sorar irsə, kim aydügin demə imdi.



Ol Məsalim məşrəbəyə su doldurdı,
Qamuları xidmətinə hazır gəldi.
Önlərində ayağına ura durdı,
Əllərində məşrəbəyi dutar imdi.

Hər qanqısı su dilərsə sunu verdi,
Mütabiət qalmaqlığa təşrif gördi,
Xidmət qılub məşrəbəyi gerü aldı,
Bu sifətlü lütfü əhsan qılar imdi.

Əqli səhih, dili fəsih xoş mürvətlu,
Könlü müşfiq, bənzi görklü, yüzi nurlu,
Komalı rast, irür sözi, yulaq datlu,
Ol cəmalı Yusifinə bənzər imdi.

Anlar sorar, aydur: Aya, bənzi görklü,
Cəmalın xoş, mürüvətli, özün arlu
Bizə ehsan qılırsan həzar dürlü,
Kimsən, kimin oğılısan, derlər imdi.

Ol Məsalim anlar üzə cavab eylər,
Anlar ilə ərəbicə sözlər söylər,
Bən sizlərə xidmətçivən, əya öğlər,
Nə sözlərsə, saqi sözi sözlər imdi.

Misir şahı sizi, bilin yalaq sevər,
Yüzünüzü görümegə yulaq əvər,
Sizni görmək xatirində ğüssəsi var
Bəni sizin xidmətkarı verdi imdi.

Bən sizlərə müdam xidmət qıldaçıvən,
Siz gedincə tapunızda oldaçıvən,
Sizi görsən ögüş təşrif buldaçıvən,
Vüsalınız bana rahət olur imdi.

Bunlar gördi anlarının ehsanını,
Ağırlayub hörmət edib sevənini,
Hər birinə bir ətmegi verdigini,
Bu iş üzə əcayibə qalur imdi.

Bu Məlik nə yulaq comərd, dedişdilər,
Neməti çoq, deyübən söz sözləşdilər,
Aşlıq daği nə deyüsiz sözişdilər,
Bir yük aşlıq, bin iki yüz altun imdi.

Andan Yusif bəzətidi təxti-bəxti,
Rast eylədi həm ol anda sazı səxti,
Qul-qaravaş çoq düzdürdi həm ol vəqti,
Kənanilər gəlsün deyüb ündər imdi.

Ol aradan üç gün tamam keçmiş idi,
Məsalimə anlar elam qılmış idi.
Cümləsinə ağ atlas ton geyüdürdi,
Dörtinci gün tapuyına varur imdi.

Qaçan anlar ol saraya girdi isə,
Yusifnin heybətini gördi isə,
Səltənətlik məqamına irdi isə,
Ün eyləsi ana səcdə qılur imdi.

Yusif aydur: Qaldurınız başınızı,
Cəm eləin, aya, sizlər uşınızı,
Məlum qılın sizlər bana halınızı,
Nə hacətə gəlidüniz aydun imdi.

Bu on qardaş sücudidən baş qaldurdı,
Cümlələri gözin açdı, əqlin dərdi,
Ünilosi ayağına ura durdı.
Təxt önində qol qoşurub durar imdi.

Yusif baqdı, qardaşların cümlə bildi,
Hər birini ayru-ayru fəhm qıldı,
Pərdə içrə pünhan olub zarı qıldı,
Anlar daği Yusif zarın bilməz imdi.

Buyurdu: Ol sandıqını gətürdilər,
Dəstur verdi on qardaşı olturdılar,



Qorqı, saqınc əndişəyə yey durdilər,
"Əlxainü xaif"[1] – anlar derlər imdi.

Yusif sorar bunlara, siz kimlərsiniz?
Qanqı eldən gəlürsiz, nə istərsiniz?
Əvvəl-axır sizlər bir qaç toğmasiniz?
Atanız kim, deyübəni sorar imdi.

Anlar aydur: Kənanıdan gəlürimiz,
Dədəmiz həm İshaq suçı şərifimiz,
Həqiqətdə biz on iki qardaşımız,
Atamıza Yəqub suçı derlər imdi.

O birimiz gəlimədi evdə qaldı,
Kiçimizi həm qurt yedi, görklü idi,
Atamız da anı yulaq sevər idi,
Həsrətindən iki gözi kormış imdi.

Yusif aydı: Ya şəriflər, nə deyürsiz,
Siz aydursız, atamızı nəbi dersiz,
Kiçimizi bizdən yekrək sevər dersiz,
Peyğəmbərə bu iş rəva olmaz imdi.

Anlar aydur: Əya əziz, eşit bizdən,
Görsəydiniz kiçimizi sən bir gözdən,
Siz həm anı sevər idiz həzar çəndən
Sən görmədun vəsfün nəçük qılam imdi.

Bizlər daği anı yulaq sevər idük,
Görməsəmiz görüməgə uvar idük,
Bir yalan duş görmiş idi, anda bildük,
Həm atamız duşnı nəçük yormış imdi.

Yusif aydı: Ol duşını neçük görmiş?
Həm atanız anın duşnı neçük yormış?
Anlar aydur: Ol duşnı eylə yormış,
Misir şahı olsun təvil qalmış imdi.

[1] Xain qorxaq olur.

Anın duşnı ol atamız görti, bildi.
Misir şahı olasını təvil qıldı,
Ol vəqt bizə anın duşı düşvar oldı,
Anı bizlər unamaduq, derlər imdi.

Yusif aydur: Ol iş elə olımamış,
Yenə ol duş təvilini gəliməmiş,
Ol Misirin padişahı bulımamış,
Ol əhvaldan nə bilürsiz sizlər imdi.

Anlar aydur: Əya əziz, oğlan qanı?
Həqiqətdə qurt yedi kim, ol oğlanı,
Uçmaq içrə dizmiş oldı anın canı,
Ol dünyadan intiqalı qıldı imdi.

Aya əziz, halınızı bilgil təbqiq,
Atamız həm sana salam qıldı təsdiq.
Qat yincütti bizləri həm uşbu darlıq,
Sizdən təam istəyübən gəldük imdi.

Möhtac olub gəldük sizin qapunıza,
Az büzaət gətürüdük tapunıza,
Sizdən ögüş ikram gərək indi bizə,
Ehsanınız aləm içrə məşhur imdi.

Yusif aydur: Bes söziniz qəbul olsun,
Sizilərdən birinizi mundi olsun,
İkinizi gəlməginiz təcil olsun,
Beniyəmin sizin ilə gəlsün imdi.

Əgər sizdə doğınlıq olur isə,
Beniyəmin sizin ilə gəlür isə,
Ataz sizə anı yoldaş qılur isə,
Heç bəhasız telim aşlıq verəm imdi.

Aşlıq verəm, telim dürlü nemət verəm,
Cümlenizə ağır xələt həm geyürəm,
Bən sizlərə ulu hörmət həm göstərəm,
Atanıza həm hədiyyə verəm imdi.



On qarındaş belə qəvlə razı oldı,
Şəmun anda qalmaqlığa boyun verdi,
Yusif aydı: Anbardan yük hazır gəldi,
Büzaətsiz telim aşlıq yüklər imdi.

Bəs göndürdi anları ol Yusif sədiq,
Qaldı ehsan həm tənəyüm, təvazölıq,
Atanıza bəndən salam qılun tohqiq,
Təcil birlə gerü yönüb gəlün imdi.

Həqiqətdə bən sizləri sevərvəndir,
İkiləyin görməkligə üvərvəndir,
Gəldüknizi yulaq həm xoş görərvəndir,
Sizi qayət sevərivən deyür imdi.

Qaçan anlar Misiridən vardı isə,
Qanqı mənzil, yola bunlar girdi isə,
Kim sataşıb həm anları gördi isə,
Ağırlayub həm möhtərəm dutar imdi.

Anlar aydur: Bizlər hərdəm gəlür idük,
Bu yerlərdə bu mənzildə qalur idük,
Bunın kibi qanda hörmət olur idük,
Bu gəz bunda bir hikət var deyür imdi.

Anlar yayınıb Misiridən gəlür idi,
Yusif issi anlar bilə gəlür idi.
Artlarından iblis ləin yetib gəldi,
Yusif issin anlarından alur imdi.

Qaçan Yəqub oğlanları evə gəldi,
Yəqub suçı görübəni xoş sevindi,
Ağlar ikən yenə Yequb bir göz güldi,
Genə dönib bixud olub düşər imdi.

Oğlanları, Yəqub ilə görüşdilər,
Bu gülməgin əsli nədi sorışdılar,
Aya, baba, nətə güldün dirləşdilər,
Dönib nedən ağladun sən, derlər imdi.

Yəqub aydı: İlk söziniz datlu gəldi,
Ol səbəbdən müfərrəhi oldum idi.
Aranızdan birinizi eksük oldı,
Ol mənidən bixud olub düşdüm imdi.

Misr ayası aşlıq sizə nətə verdi?
Bildinüzmi qanqı millət dutar idi?
Anlar durdı Yəqub üzə cavab verdi:
Ol sizlərə çoq mürüvvət qıldı imdi.

Anlar aydı: Anın dini pak müsəlman,
Ol bizləri ağırladı qıldı ehsan,
Benyəmini ol dilədi həm bizlərdən,
Şəmun anda biz qaldurduq derlər imdi.

Eşidikəc fəryad qıldı Yəqub nəbi,
Netə anda qoydunuz siz Şəmunnını,
Qaçan verəm bən sizlərə Benyəmini,
Birin verdüm, Yusifsiz qaldım imdi.

Oğlanları ol Yəquba cavab verdi,
Oşal əziz səni bizdən ögüş sordı,
Sənin üçün çoq ağladı, zarı qıldı,
Çoq-çoq salam qıldı sana, derlər imdi.

Andan Yəqub ol tədbiri rəva gördi,
Oğlanların cümləsini antlaş durdı,
Benyəmini bunılara dəği verdi,
Hər birisi inamılıq qılur imdi.

Andan sonra açıdılar çuvalların,
Çuval içrə bulıdılar mətaların,
İnandurdı dəği anlar ataların
"Haza büzaotna"[1], derlər imdi.

Yəqub nəbi anlar üzə dəstur verdi,
Beniyəmin anlar ilə belə vardı.

[1] Budur bizim malımız-varımız.



On qarındaş əzm qıldı yola girdi,
Bu gəz əziz xidmətinə varur imdi.

Yəqub aydı: Qaçan qanda siz varsanız,
Kəndinizi dildən, gözdən saqlamız,
Cümləniz həm bir qapudan siz girməniz,
İkin-ikin hər qapudan girin imdi.

Oğlanları ol Misirə yetib gəldi,
İkin-ikin bir qapudan anlar girdi.
Beniyəmin qardaşısız yalquz qaldı,
Qançaruya varasını bilməz imdi.

Şamdan yana qapuğda ol gəldi durdı,
Ötənidən-gələnidən əhval sordı,
Heç kimsənə anın dilin bilməz idi,
Heyran olub oyan-bu yan gəzər imdi.

Həman dəm ol hazır gəldi Ruhiləmin,
Yetkürdi Yusif üzə həq səlamın,
Aydı: Gəldi ol qardaşın Beyniyəmin,
Muştularvən, anın üçün gəldim imdi.

Aya Yusif, durğul zərif tonlar geygil,
Tonlarının üstündən bir ipək engil,
Pünhan olub bir dəvəyə becid mingül,
Qardaşınnı görüməgə varğul imdi.

Şamdan yana qapuğda ol gəlib durur,
Kimi görsə, xəbər sorur, həm yalvarur,
Kimsə bilməz ərəbicə xəbər verür,
Aciz olub heyran qalub ağlar imdi.

Yusif nəbi bu sifətlü hazır gəldi,
Şamdan yana qapuğda bəs anı buldı.
Beniyəmin olduğunu biluməd̄i,
Yüz örtülü onda xəbər sorar imdi.

Yusif aydur: Aya, əziz nə sorarsan?
Qanqı eldən gəlürisən, qança varsan,
Nə ağlarsan, nə işin var, nə istərsən?
Əhvalını bana elan qılğıl imdi.

Bənim dəği var idi bir qarındaşım,
Bir anadan doğmış idük söyükdaşım,
Anı anıb aqar bənim gözdən yaşım,
Mütəhəyyir bən biqərar oldum imdi.

Aydı: Kimin nəslisən sən mürvətlü,
Vüsalına qayqulara həm rahətlu,
Ərəbicə xoş sözlərsən, sözin datlu,
Nətə öğrəndün uşb dili, deyür imdi.

Yusif aydur: Bən Kənana varmışıdım,
Ay saatda ol məqamı görmişidim,
Kiçi ikən anda təlim durmışıdım,
Uşbu dili bən öğrəndim deyür imdi.

Beniyəmin aydur: Aya, mürüvvətvar!
Sənin yüzün görümədə muradım var.
Bana həsrət əsər qılmış taqətim tar!
Niqabın soy, camalinni görsəm imdi.

Yusif aydur: Şimdi elə qılmayavən,
Yüzimdən mən niqabımı soymayavən,
Bu hal içrə əmürünce olmayavən,
Bu iş üzə səbr qılğıl deyür, imdi.

Andan Yusif bazıbəndin ana verdi.
Konduzindən bir biləzik ana verdi,
Ol biləzik saf qızıldan-altun idi,
Qırq bin misir qızılına dəgər imdi.

Sirçə sandı anı bəs ol Beniyəmin,
Bilümədi heç də anı nə qılasın.
Yusif aydur: omızına keçürəsin,
Xəfyə birlə təbəssümü qılur imdi.



Yusif Beniyəmin üzə dəlil oldı,
İkiləsi ol şəhərə belə girdi,
İbn-Yabin qardaşların cümlə bildi,
Əziz Yusif sarayına varur imdi.

Yusif aydur: İmdi bana dəstur vergil,
Qardaşların anlarımu, varıb gərgil,
Anlar ilə şol saraya belə girgil,
Qayğurmağıl, xatirin xoş dutğıl imdi.

Beniyəmin ayrulmağı rəva görməz,
Qardaşlarının ol qatına hərgiz varmaz!
Aydur: Səndən ayrulmağı könlüm verməz!
Sənin birlə bir rahətim artar imdi.

Bunı deyüb ağladı, zarı qıldı,
Aydur: Sənin sözin bana datlu gəldi,
Bənim məhrim səndən yana galib oldı,
Səndən ayru kimsənə xoş degül imdi.

Səndən ayru kimsənəni gözim görməz,
Sənsən canım fəraqında səbrim qalmaz,
Bir sözim var söyləməgə dilim varmaz,
Surətin xoş, Yusifimə bənzər imdi.

Yusif aydur: Bən həm dəği qul var deyür,
Mövlam vardur, anın hökmün dutar deyür,
Həqqin əmrin sındurmağa qorqar deyür,
Buyruq birlə iş işləmək gərək imdi.

Varubanı qardaşların bayıq bilğıl,
Məğbunlıqdan, məhzunlıqdan iraq olğıl.
Rəncimək çün qayğurmağıl şad olağıl,
Çərahətin mərhəmi bən olam imdi.

Beniyəmin qardaşları qatna gəldi,
Cümləsini gəlübəni görmiş qıldı,
Benyəminin şad olduğın anlar bildi.
Nə mənidən şadımansan, dərlər imdi.

Sən hərgiz bir şadü xürrəm olmaz idün,
Yusifi qurt yeyəli beç gülməz idün,
Duşnın açıb sən təbəssüm qılmaz idün,
Bugünki gün şadimansan, derlər imdi.

Beniyəmin anlar üzə cavab verdi,
Bən sizlərdən ayrıluban qalur idi,
Oşal dəmdə bir dəvəli gəlür idi,
Bənim ilə ərəbicə sözlər imdi.

Niqab ilə anın yüzi bəs örtülü,
Qərib dostu, ol kişi həm mürrüvətlü,
Dili fəsih anın, sözi yulaq datlu,
Anı eştib həm rahətim artdı imdi.

Bəni sizə qoşdur anca ol götürdi,
Bir biləzik ol bana həm bəxşiş qıldı,
Anı görə xatirimə şadlıq yıldı,
Qayğum, ğüssəm solubanı getdi imdi.

Qədrin bilib sənin üçün saqlayalım,
Ol biləzik nə üçünmiş biz biləlim.
Ol Yəhudə aydı: Anı biz görəlim!
Biləziki Yəhudəyə verür imdi.

Beniyəmin Rəvailə sunu verdi,
Rəvail həm alıb qolna ura qoydı,
Bu əcəbdür, anda dəği heç durmadı,
Beniyəmin gerü qolna geyrür imdi.

Qardaşları bir-birinə cümlə aldı,
Qamuları qollarına geydi saldı,
Heç kiminin qolına da eklənmədi,
Beniyəmin gerü qolna geyrür imdi.



*FƏSL*

## YUSİFNİN QARDAŞLARI YORMANINDA

Yusif dedi: Ol bənnalar hazır gəlsun,
Əcəb köşük, möhkəm saray bina qılsun,
Ol saraynın uzunu qırq arşun olsun,
Həm yüksəki qırıq arşun olsun imdi.

Bəzəsünlər anda Yəqub sovlətini,
Bəzəsünlər bəm oğlanlar surətini,
Həm anların Yusifinə möhnətini,
Cümləsini ol divarda yazlar imdi.

Aldayuvan atasından alduqların,
Donın soyub dar quyuya salduqların.
Öldürməyə həqiqət qəsd qılduqların,
Cümləsini ol saraya yazlar imdi.

Həm quyudan çıqarmağa gəldüklərin,
Qulımız deyib, yalan satu qılduqların,
Yenə satıb az bahaya alduqların,
Üç eybi var dedüklərin yazmış imdi.

Əziz Yusif ol dəm oluğ dəvət qıldı,
Saray içrə dürlü nemət hazır oldı,
Qonaqlara telim dürlü aşlar gəldi,
İxvanların qonaqlayu öndər imdi.

Qardaşları ol saraya gəlib girdi,
Ol Rəvail yazuları anda gördi,
Xəfyə birlə bir-birinə məlum qıldı,
Bizim batil əməlimiz, derlər imdi.

Atamızdan Yusifini alduğımız,
Atamıza həm aq-asi olduğımız,
Hər nə iş ki, biz Yusifə qılduğımız,
Bu məlikin sarayına yazmış imdi?!

Bu on qardaş bu yazunı anda gördi,
Kəndulərin batil işin, qamü bildi,
Nedaməti qılubanı peşman oldı,
Yemək, içmək, qayığusı getdi imdi.

Önlərində qeyudılar dürlü nemət,
Anlara həm uğradı qəm, qüssə, mehnət,
Cümləlıəri ağlaşurlar, qatı həsrət,
Heç kimsənə löqmə-təam yeməz imdi.

Əziz Yusif tərcümana əmir qıldı,
Sorğıl, bular neşə təam yeməz, dedi.
Böylə qatı ağlaşurlar, nə hal dəgdi?
Tərcümanı anlarıdan sorar imdi.

Anlar durub tərcümana cavab verdi:
Bizim birər qardaşımız olur irdi,
Anın görki bu yazuya bənzər idi,
Anı bayıq qurdlar yedi, derlər imdi.

Anı görə həsrətimiz betər oldı,
Yemək, imək, qayuğusı cümlə qaldı,
Yusif ayruq bir saraya xəlvət qıldı,
Qardaşların ol saraya ündər imdi.

On bir qardaş ol saraya gəldi girdi,
Yusif anda dürli nemət hazır qıldı,
On qardaşı təam yeyə cümlə gəldi,
Beniyəmin təam yeməz, ağlar imdi.

Yusif aydur: Nə mənidən gözün yaşlu?
Həm könülün qayğuludur, bağrın başlu,
Nə ğüssən var, bunun kibi on qardaşlu,
Nə ğüssən var, həsrətin, nə deyür imdi.

Beniyəmin aydur: Yenə gerü varsam.
Dəstur versən ol saraya yenə girsəm,
Bu saata bu surəti yenə görsəm,
Ol surəti Yusifimə bənzər imdi.



Yusif nəbi Benyəminə özət verdi,
Beniyəmin ol saraya genə girdi,
Ol surəti anıladı, baqdı gördi,
Ana baqıb həsrət birlə ağlar imdi.

Yusif aydur Məsalimə: Gerü varğıl,
Əmun birlə ol sarayda belə olğıl,
Sorar irsə əhvalını bəyan qılğıl,
Ol məhzunə kim irdigün ayğıl imdi.

Məsalimə ol saraya girdi irsə,
Əl qoşurıb qarşusında durdı irsə,
Beniyəmin Məsalimi gördi irsə,
Ağlar ikən ana əhval sorar imdi.

Qayğuları döndürədi vüsalın var,
Məhzunları oyandura cəmalın var,
Yusifimə bənzər sənin surətin var,
Kimsən, kimin oğulısan, deyür imdi.

Ol Məsalim əhval aydur, bəllü bayıq,
Aya, əmu, eştib bəndən bilgil təhqiq,
Bənim atam Misir şahı Yusif sədiq,
Misir əhli cümlə anın qulı imdi.

Ol atası Yəqub nəbi, həm İsrail,
Müdam gəlür, irmiş ana həm Cəbrail,
Mükərrəmi nəbi qılmış ana cəlil,
Həm risalət, həm kəramət qılmış imdi.

Beniyəmin anı eştib bir çağırdı,
Çağıruban huşı getdi, yerə düşdi,
Məsalimə bu əhvalı ana sordı,
Neşə belə haldan düşdün, deyür imdi.

Beniyəmin Məsalimə cavab verdi:
Bənim dəği bir qardaşım olur idi,
Anın adı həmi dəği Yusif idi,
Ol mənidən uğunuban düşdüm imdi.

Məsalimə aydur: Əmu, sən anlağıl,
Bu sirrimi qamu bənim sən dinləğıl,
Bən, qardaşın Yusif oğlu ki, dünləğıl,
Həm ol sənin öz qardaşın olur imdi.

Oldurur kim, dolanıban sana gəldi,
Şamdan yana qapuğıdan səni bildi,
Qardaşlarına səni həm ol qoşurıldı,
Qızıl-altun bilezik ol verdi imdi.

Beniyəmin bu əhvalı bəyan bildi,
Əqli şaşdı, bixud olıb, genə düşdi,
Əqli gəlib şad oluban xürrəm oldı,
Həsrətimə qouşdım bən, deyür imdi.

Məsalimə türküləyi gerü gəldi,
Atasına bu əhvalı bəyan qıldı.
Yusif anın kəlamını şərif gördi,
Həsrətimə qouşıdım deyür imdi.

Yusif nəbi bu xəlvətdə övə girdi.
Yəxtü yüzdən niqabını soyu aldı,
Həman dəmdə Beniyamin anı gördi,
Oşal saat hışu getib düşər imdi.

Qaçanda kim, əqli başna gəldi isə,
İkiləsi gözüb görüş qıldı isə,
Ol ikisi birin-birin bildi isə,
Zarlığını firiştələr dinlər imdi.

Andan sonra, olturdılar bular xəlvət,
Xaliqiğə qıldılar bəs şükür-minnət,
Sözləşürlər hal-əhvalı, həsrət-ibrət.
Ağlab-ağlab Yusif əhval sorar imdi.

Atasının əhvalından xəbər sordı,
Beniyəmin nətəligin aydur idi,
Ağlamaqdan iki gözi görməz oldı,
Darülməhzun məqamından çıqmaz imdi.



Yusif desə, gözlərindən qanlar aqar.
Firqət odı həsrətilə bağrın yaqar,
Vüsal umar, ümid dutar, gerü baqar,
Qavuşmaqdan heç ümidin kəsməz imdi.

Ol biri, qız qardaşınızı yarlı dinə,
Heç yengili ton geymədi əkioinə,
Ol peyvəstə səni sorar yol əhlinə,
Andan bərü ağılayu durar imdi.

Qulıları görücək xoş çağrar idim,
Ərəbləri görülicək ağlar idim,
Qayğuları görülicək yığlar idim,
Həm qullara, mən bənzəməz oldum imdi.

Yusif aydı: Ol adları neşə vardın?
Ol adları qoyımağa neçük gördün?
Beniyəmin aydur: Cümlə səni dərdin,
Sənsiz adlar heç gözümə görməz imdi.

Yusif aydur: İmdi sən tez gerü varğıl,
İxvanlarına qoşığılğıl, belə olğıl,
Anlar ilə belə tədbir qıla durğıl,
Beniyəmin qorqar, gerü varmaz imdi.

Aydur: Səni anuzivən yuva qıldım,
Andan bərü həsrətilə məhrum qaldım,
Yetmiş ildə yığlayuban bu gün buldım,
Cigərimi həzar parə qıldun imdi.

Andan sonra sorar, aydur: Öləndinmü?
Ya qardaşım, oğlın, qızın bulındımı?
Oğlanların atlarını atadınmı?
Neşə dürlü atlar verdün, deyür imdi.

Beniyəmin aydı: Tanrı buyruq oldı,
On iki oğlana bana ruzi qıldı,
Hər birinə bir dürlü ad atanıldı,
Sənin qayğun üzə səbəb qıldım imdi.

Ulu oğlum adını bən Tənqiz dedim,
İkincisin adını həm Qurt atadım,
Üçincisin adın bən Quyu ayıtdım,
Dörtincisin adını qan dedim imdi.

Dənqizlərin qırağında kob ağladım,
Dağılarda qurtlar dutıb antıladım,
Qanlı kömləg dutıb anı çoq yığladım,
Çoq quyular içinə bən baqdum imdi.

Beşincisin adını bən Gor atadım,
Altıncısın adını həm Dar atadım.
Yetincisin atını da Bar atadım,
Səkizincin adın Arslan, dedim imdi.

Goristanlar arasında bən zarıdım,
Darılardan darılara çoq yürüdüm,
Mağarlarda həm səni kop-çoq aradım,
Arslanları dutubanı sordım imdi.

Toquzıncın adını həm Muzdur dedim,
Onuncısın adını bən Qayğu dedim,
On birincin adını da Qərib dedim,
On ikincin adını Qul dedim imdi.

Həm qulları görücək xoş darar idim,
Qəribləri görücək həm sorar idim,
Qayğuları görücək çoq ağlar idim,
Həm qullara bən mehriban oldım imdi.

Yusif aydı: Şol adları netə qoydun?
Anın dəki adı nəçük rəva gördün?
Beniyəmin aydı: Cümlə sənin dərdin,
Sənsiz anlar gözimə görünməz imdi.

Yusif aydur: Hərgiz sən heç qayğurmağıl,
Barğıl, imdi qardaşlardan ayrılmağıl,
Bənim birlə qılasını bayıq bilgil,
Sənin üçün bu tədbiri qılam imdi.



Bən sənin yükində bir sağ gizləyəlim,
Sağ buluban bən sənə həm oğ deyəlim,
Qardaşlardan səni alıb bən qalayım,
Bənim ilə belə olğıl, – deyür imdi.

Beniyəmin qardaşları qatna gəldi,
Qardaşları anı görüb bilümədi,
Anlar aydı: Səni de, kim xürrəm qıldı?
Bənzin nuri dolun ay tək balqır imdi.

Andan Yusif niqabilə yüzin örtdi,
Qardaşların ikiləyin qonaqladı,
Kendü əmin anlara təam verdi,
İkin-ikin oturunlar, – deyür imdi.

İkin-ikin qardaşları əlin sundı,
Sunıb təam yeməginə niyyət qıldı,
Beniyəmin qardaşlarsız yalğuz qaldı,
Təam yeməz, həsrətilə ağlar imdi.

Yusif aydur: Ağlamağıl, bilgil işin,
İmdi qoyğıl, aqıtmağıl gözdən yaşın,
Bən olalım imdi sənin gəl qardaşın,
Bizim ilə bilə təam yegil imdi.

Beniyəmin şadı olıb tura gəldi,
Yusif ana sağ yanında urun verdi,
İkram qılıb kəndüsinə təşrif gördi,
Təxt üzərə bilə təam yerlər imdi.

Təam yedi, qızıl-altun sağ götürdi,
Cümləsinin dəvəsinə yük gətürdi,
Beniyəmin yükündə ol sağ gözlədi,
Ol ikidən özgə kimsə bilməz imdi.

Ol sağ qızıl-altunıdan olmış idi,
Dört yüz qızıl altun qiymət almış idi,
Ol vəqtdə qiyməti ol qalmış idi,
Bu qədərin baha qiymət dutar imdi.

Alqışlaşu dua qılıb dəbrəndilər,
Varıb yolda bir mənzildə əkləndilər,
Bir az vəqti bu mənzildə dikləndilər,
Artlarından Yusif suçı yetər imdi.

Yusif suçı uşbu işi başlab yetdi,
Yəqubinin oğlanların cümlə dutdı,
Oğurlamış sağı deyib təhdid etdi,
Kim, "innəkümməs sariqün"[1], deyür imdi.

Anlar aydur: Vallahı, biz sağ almaduq,
Məazəllah oğurluğı biz qılmaduq,
Əvvəl axir batil işi biz bulmaduq,
Ana baqmaz bu gəz gerü döndür imdi.

Dutubanı Misrə gerü yetürdilər,
Yüklərinin cümləsini götürdilər,
Cualarıın yükün cümlə arıtdılar,
Beniyəmin yükində sağ bulur imdi.

Yusif aydur: Siz düz-ətmək almadınız,
Nə mənidən bana hörmət qılmadınız?
Tört yüz qızıl-altunluq sağ gizlədiniz,
Qatı buşıb, anı birlə sözlər imdi.

Bunı eştib anlar yulaq utandılar,
Yusif suçı heybətindən imandılar,
Cümləleri bir-birinə dirəndilər,
Heç kimsənə nə deyəsin bilməz imdi.

Anlar anda Yusif üzə cavab verdi:
Bu oğlanın birisi həm yavuz idi,
Bir qardaşı bunın yulaq oğrı idi,
Anaları ol Rahilə, derlər imdi.

Yusifinə oğrılığı həm ol irdi,
Tifil ikən əmisi də söylər idi,

[1] Siz oğrusunuz.



Ol Yusifi yulaq qatı sevər idi,
Dört yaşnadək bəm qatında dutar imdi.

Yəqub suçı ol oğlanı ayladilər,
Oşal dayə hiylə vermək eylədilər,
Belnə qızıl-altun açuq bələdilər,
Yusifini Yəqub suçı verür imdi.

İki gündə ol dayəsi hazır gəldi,
Aydur: Qızıl-altun açğur yava qıldı,
Məgər, şayəd, ol açğurı Yusif aldı,
Atası ol İshaqından qalmış imdi.

Yəqub suçı arayuban anda buldı,
Yusifinin belindəymiş bəyan bildi.
Bəs Yusifi əmisinə təslim qıldı,
Dəqi iki yılğa tikrü versün imdi.

Bir neçəsi rəvayətdə eylə aymış,
Yusif təam yeyər ikən nan gizləmiş,
Pünhan qılıb yoqsızlara anı vermiş,
Yusif oğrı dedikləri budur imdi.

Andan Yusif anlar üzə cavab verdi:
Əvvəl-axir batil işlər sizdən irdi,
Yəqub suçı sizdən ögüş həsrət gördi,
Əlinizdən batil əməl çıqar imdi.

Siz anlar kim, atanızı ağlattunız,
Aldayuban soar oğlın həm aldunız,
Qullayuban azad ikən siz satdunız,
Haram-baha yedünüz siz, deyir imdi.

Oluq saat əmir qıldı Yusif sədiq,
Aydı: Dutın sağ oğrusın sizlər bayıq,
Şərin hökmin qılalım biz ana təbqiq,
İki yil ol zindan içrə yatsun imdi.

Andan bunlar Yusif üzə cavab verdi:
Atamız bu oğlanını sevər idi,
Həm bizlərə bu anıdan əmanətdi,
Bunı qoyğıl bizləridən dutğıl imdi.

Yusif aydur: Ol işi bən qılmayavən,
Adil ikən bən heç zalim olmayavən.
Suçlı üçün suçsızlardan almayavən.
Xəta yəsin bayıq dutın, – deyür imdi.

Bulmadılar dərman, anlar məhrum qaldı,
Ol on qardaş cümləsi bir yerə gəldi,
Bir xəlvəti məqamından tədbir qıldı,
Gəlin bir iş qılalım biz, derlər imdi.

Yəhud aydı: Qəsd eləbən biz varayın,
Heybət ilə anlara bən çığırayın,
Benyəmini anlardan bən, çağırayın,
Siz cümləniz qılıc dartıb durın imdi.

Qaçan anı eşitsəniz hazır gəlin,
Uşbu şəhrin əhlini siz cümlə qırın,
Yəhudənin heybətini zahir bilin,
Ol çağırsa, eşdən həlak olur imdi.

Yusif anlar buşduğını zahir bildi,
Kiçi oğlı Mamiləyə əmr qıldı,
Yəhudənin qatına, sən varğıl dedi,
Arqasını sığallayı anın imdi.

Ol Mamilə durubanı tərkin vardı,
Pünhan olub həm qatında bir az durdı,
Nagahanın arqasına əl yetürdi,
Ol Yəhudə hərgiz anı duymaz imdi.

Yəhudənin adəti gər boşar bula,
Buşubanı çağırmağa niyyət qıla,
Mamlə gəlib arqasından sığar ola,
Həman dəmdə öfkəsi bəs solar imdi.



Qardaşları anın ünün eşitmədi.
Ol Yəhudə hərgiz buşüb ün etmədi,
Bu arada bulmadı nə hikmətdi?
Gəlib əhval netəlikin sorar imdi.

Anlar aydur: Nə mənidən çıqırmadın?
Heybət birlə şəhər əhlin bəs qırmadın?
Sözümüzi sən yerinə gətürmədin,
Bu arada nə səbəb var? – derlər imdi.

Ol Yəhudə aydur: Əhval eylə oldı,
Bayıq bənim qatıma bir oğlan gəldi,
Ğafil ikən yığrınmadan əl sızıldı,
Huş-heybətim dükəl getdi, deyür imdi.

Anlar görüb bu əhvalı ecəbləşdi.
Aydurlar kim, bu əhvalı, netə düşdi?
İsrailin nəsli bunda var dedişdi,
Qamuları əcaibə qalur imdi.

Qayıqurdı anılara Yusif sədiq,
Aydur: Xaif olursınız sizlər bayıq,
Tədbirinizi sizin bildim bən həm təhqiq,
Təhdid qılıb, qorqunursız sizlər imdi.

Yusif aydur: Şəhr əhlini qırmağa,
Qəsdiniz var bu gəz sizin çıqırmağa,
Tədbir qılur siz bu şəhri öldürmağı,
Batil sağınc saqınursuz sizlər imdi.

Yusif aydur: İki növbət gəldiniz, der,
Sizlər bəndən telim timar buldınız, der,
Həm duz, ətmək bizim evdə yedniz, der,
Yəqub suçı oğlıdurur dersiz imdi?

Yusif buşub öfkə birlə taxtdan endi,
Heybət birlə təxt–saraya bir gəz buldı,
Saray içi dəpərəndi heybət andı,
Möhkəm yuvlaq öfkə birlə buşar imdi.

Aydır: Sizin bən atanzı ağırladım,
Yoqsa birin heybət ilə çaqıradım,
Cümlənizi növhə ilə öldürərdim!
Bu heybətin görüb anlar qorqar imdi.

Andan anlar Yusifinə çoq yalvardı,
Aqibəti anılara dəstur verdi,
Yəhudədən ayıruqı yola girdi,
Beniyəmin ilə birgə qalur imdi.

Təcil birlə qatırlayu anlar gəldi,
Bu əhvalı Yəqubına zahir qıldı,
Beniyəmin əhvalatı düşvar oldı,
Yəhudəmiz anun birlə qaldı imdi.

Yəqub suçı uşbu işi bildi bəyan,
Ğəm-ğüssəsi artuq oldı hozar çəndan,
Beniyəmin oğurluqın qıldı əyan,
Həqiqətdə gördünüzmü sizlər imdi?

Oğlanları Yəqub üzə səbr verdi,
Ol padişah bizə telim ehsan qıldı,
Bir qızılı, altunı sağ əksik oldı,
Beniyəmin yükündən çıqar imdi.

Yəqub aydur: Bən Tanrıdan umarıvən,
İnşallah, bən Yusifi görərüvən,
Üç oğluma cümlə belə irərüvən,
Oğlanları aydur: Anı netək, imdi?

Yəqub aydur: Həqdən tofiq elə bulsa,
Qul hökmünə səbr qılıb razı olsa,
Qılımağa daim düşvar işlər gəlsə,
Möhnət sonı rahət, sevinc olur imdi.

Quran içrə xaliq elə ayımış idi:
"Lateysəu mon ruhəllah", demiş idi,
Quranına inanmayan kafər idi,
Rəhmətindin rahət ummaq gərək imdi.



*FƏSL*

## [YƏQUB ƏLEYHİSSƏLAMNIN YUSİFİNİ CƏBRAİLDƏN SORMASI]

Gəldi bir gəz İsrailə ol Cəbrail
Ziyarətə verib idi mövla Cəlil.
Xəbər sordı Cəbraildən ol İsrail:
Ol Yusifim əsənmüdür, deyür imdi.

Cəbrail der: Yusifinin əsəndürür,
Həm də anın qandalığı bəyandürür,
Mülk-dövlət iyəsi həm sultandürür,
Bir tərəfdə padişahlıq qılur imdi.

Yəqub aydur: Ya Cəbrail, bili vergil,
Bən məhzunə Yusifini bulu vergil,
Bana minnət inayəti qılu vergil,
Ol Cəbrail aydur: Dəstur yoqdur imdi.

Yəqub aydur: Ah, ol dəstur qaçan ola?
Yusifimdən bu sevinci qaçan bula?
Mövla bana inayəti qaçan qıla?
Bunı aydur, gözindən qan aqar imdi.

Aya könlüm şadılığı, gözim nurı!
Aya bağrım paralısı, nəfsim surı!
Aya bənim Binyəminim, evim qorı!
Mövla səni görüməki versə imdi!

Bən qorquram, növbət ilə əcəl gəlsə,
Sizdən ayru ana bəndən firqət olsa,
Qouşmadın bən sizlərə həsrətilə!
Bunı aydur, ağlab-ağlab düşər imdi.

Oğlanları aydur: İmdi ağlamağıl,
Kənduzini həsrətilə dağlamağıl,
Axirətdə qovuşmağa bel bağlağıl,
Dünyadakı ümidini kəsgil imdi.

Yəqub aydur: Bu kəlaçı demən mana,
Bən ümidim heç kəsməzəm andan buna,
Bana rəhmət qılur irkən, genə ana,
Ümid var ki, vüsal ruzi qıla imdi.

Qamu haldan ol müqtədir qadirdurur,
Həsrətləri həsrətinə qauşturur,
Qadirdürür, məhzunları fərəc qılur.
Andan umar hərgiz nomid qalmaz imdi.

Bu gəz hüzni şiddət ilə bətər oldı,
Beniyəmin, həm Yəhudə anda qaldı,
Mehrabidə sücud içrə zarı qıldı,
Xudavənda, mədəd səndən, deyür imdi.

Aydur: Ol iş əgər elə olur irsə,
Misr ayası anı məhbus qılur irsə,
Yəhudə bir heybət birlə çağrur irsə,
Şəmun anın hasarların yıqar imdi.

Ol Şəmunnın qüvvəti ol qadir idi,
Yükrüb, yetib arslanları dutar idi,
Gövdəsindən başın cüda etər idi,
Cümləsini para-para qılur imdi.

Oğlanları aydur: Elə qılur idük,
Lakin anı bizdən güclü görür idük,
Naçar olıb bizlər ana boyun verdük,
Heç bir zəfər bulumadıq bizlər imdi.

Yəqub qızı ol Dünyaya əmr qıldı,
Dünya varıb davat, kağız alıb gəldi,
Ol Şəmuna buyurdı, hazır oldı,
Aya Şəmun, belə biti yazğıl imdi:

"Başlayıban əvvəl yazğıl əl-bismillah,
Andan güzin yazğıl Yəqub İsraillah
Ol Əzizi-Misrə bizdən salamüllah,
Halım zəif, vəqtim xarab, bilgil imdi.



Aya Əziz, qəbul qılğıl həmdü səna,
Nəzər qılğıl bu məktubu əhvalına,
Bizə ögüş dəgmişdürür rəncü ğina,
Biz aşnudan telim möhnət dartduq imdi.

Bənim dədəm İbrahimdür, məruf Xəlil,
Təqdir ilə ana qıldı mövla Cəlil,
Quran içrə vardur ana uşbu dəlil,
Nəmrüd anı yanar oda atdı imdi.

Andan Cəlil əmr qıldı ol Xəlilə,
Ya Xəlilim, müti olğıl bən Cəlilə,
Həqiqəti qılğıl oğlın İsmailə,
Bənim üçün anı qurban qılğıl imdi.

Ol Xəlilin oğlı bənvən, yarlı Yəqub,
Bənim həm bir oğlum vardı yuvlaq məhbub,
Məhrum qaldum ol oğluma yıva qılıb,
Həsrətimdən yuvlaq zəif oldum imdi.

Əleddəvam, anın hüzni bağrım yaqar,
Gözim yaşı qana dönüb su dək aqar,
Ah der irsəm, nəfəsimdən tütün çıqar,
Əleddəvam, yürəkimni dağlar imdi.

Yetmiş yildir Yusifim deb ağlayurvən,
Firqət odı birlə bağrım dağlayurvən,
Rəhmətinə mövlayım bel bağlayurvən,
Yusifimi sən göstərgil, deyir imdi.

Ağlamaqdan iki gözim nuri getdi,
Sədrim içrə yürək yandı bağrım göydi,
Beniyəmin qatınızda nə suç etdi?
Nə mənidən anı məhbus qıldun imdi?

Peyğəmdərlər kimsə malın almaz bulur,
Məşhurdurur, batil işi qılmaz olur,
Oğlanları oğrılığı qılmaz durur,
Ol iş ana töhmət işdir, bilgil imdi.

Bundan-andan bizə qılun telim ehsan,
Ehsanınız arta dursun, olmaz nöqsan,
Ol oğlana heç güman qılmağılsan,
Anı görü bizə xilas qılğıl imdi.

Yincitməgil bəni uşbu şiddət içrə,
Yoqsa, bən həm düa qılam həsrət içrə,
Nəslin birlə qalırsan sən möhnət içrə,
Məzlumların düasından qorqun imdi".

Oğlanları ol bitini götürdilər,
Əliyyülhal Misir içrə gətürdilər,
Ol Əzizin xidmətinə yetürdilər,
Yeri öpüb bitni ana sunar imdi.

Əziz Yusif ol bitini aldı gördi,
Açımadan öpüb anı yüznə sürdi,
Andan dönüb anılara cavab verdi,
Nə mənidən beylə qıldum, deyür imdi.

Yusif aydur: Qanqı sultan adil olsa,
Salehlərin bitikləri ana gəlsə,
Dərhal anı öpübəni yüznə sürsə,
Ol iş yuvlaq müstəcab iş olur imdi.

Ol bitini oqıdı həm Yusif sədiq,
Əhvalının nətəligin bildi təhqiq,
Firqət odı bağrını yaqdı bayıq,
Yaşurın ol niqab içrə ağlar imdi.

Həman dəmdə Cəbraili gəldi hazır,
İrsal qıldı Yusifə ol məlik qadir.
Aya Yusif, cavabnamə yazğıl deyür,
Tərkin gerü Yəqubuna göndər imdi.

Andan Yusif cavab yazdı İsrailə,
Ya İsrail, bu iş nətə caiz ola?
Qulu daim şakir gərək ol Cəlilə,
Mövla hökmün qulu razı gərək imdi.



Ya İsrail, bu iş içrə yanılmışsan,
Mövla şiddət verdügini yad qılmışsan,
Axır rahət verdügini tərk qılmışsan,
Fərmanına çələbin boy gərək imdi.

Ol Xəlilə odın bustan olduğını,
İsmailə qoç qar qurban gəldüğini,
Sənin gerü on oğlunun qalduğını,
Nətə böylə yazmadun sən, – deyür imdi.

Oğlanları biti alub gəlidilər,
İsrailə gətirübən bulıdılar,
Cavab eşdüb cümlə təhsin qılıdılar,
Uşbu sözlər peyğəmbərlər sözi imdi.

Bu goz Yəqub ayıdurdı oğlanlara,
Təcil gerü varınızlar siz ol Misrə;
Ümid ilə dutaram yüz, ol güzarə,
Beniyəmin Yusifilə belə imdi.

Bəs anılar varub Misrə gerü gəldi,
Yəqub suçdan Yusifinə salam qıldı,
Padişaha, bizim halınız düşvar oldı,
Bizi dutğıl, Beniyəmini qoyğıl imdi.

Əya, nəbi, "fətəhsəni"[1] deyür, bizə,
Bizlər yulaq möhtac olu gəldük sizə,
Anın hüzni yaqdı bizim bağrımıza,
Biti oqub Yusif anı bildi imdi.

Təxitindən endi Yusif şol dəm yerə,
Qardaşları birlə qıldı münazirə,
Bu bitini sunu verdi həm anlərə,
Bu bitini oqunız siz, deyür imdi.

[1] Yaxşılıq et!

Anlar Yusif əlinidən anı aldı,
Hər qanqısı baqdı isə oqdı, bildi,
Xəfyə birlə bir-birinə elam qıldı.
Bizim batil əməlimiz, derlər imdi.

Yusif aydur: Bunı heç kim oqu bilməz,
Bu şəhərin əhli bunı heç anlamaz.
Oquyub həm əbvalını beç söyləməz.
Uşbu biti sizin dilcə yazlur imdi.

Anlar aydur: Bizlər dəği bilüməzmiz,
Həm oquban sana cavab verimezmiz,
Bu bitidə savablı söz bulumazmız,
Yulaq düşvar bitidür bu derlər imdi.

Ol bitini anlar yulaq yazmış idi,
Ol Yusifi qul deyübən satmış idi,
Uşbu qulun üç eybi var demiş idi,
Müştəriyə ol bitini vermiş imdi.

Oşal biti Yusif elnə girmiş idi,
Yusif anı möhkəm yulaq görmiş idi,
Hərir diba arasına qoymış idi,
Ol həm anı yulaq möhkəm saqlar imdi.

Yusif aydur: Bir qul oğlan satmışsınız,
Qulumızın üç eybi var demişsiniz,
Ol şərt birlə bu bitini yazmışsınız,
Anlar aydur: Biz yazmadıq, derlər imdi.

Yusif aydur: Sağ götürün kim, uralım,
Sağ çınqırab nə deyirmiş biz görəlim,
Hər nə dersə, inanuban boy verəlim,
Anlar aydı: Ana boyun verdük imdi.

Andan Yusif buyurdı; sağ gətürdilər,
Qızıl-altun mili birlə sağ urdılar,



Qüdrət birlə sağ sözlədi, həm bildilər,
Anların nə qılduğını aydur imdi.

Yusif aydı: İmdi bavər qıldunızmu?
Sağ çınqırıb nə dedigün bildunuzmu?
Yusifə nə qıldunızı andunuzmu?
Bu gəz naçar olub iqrar qılur imdi.

Siz osız ki, ol Yusifi aldamışsız!
Bizim ilə tamaşaya gəl demişsiz,
Həqiqətdə öltürməgə qəsd qılmışsız.
Əlinizdən ol Yəhudə almış imdi.

Sevdük oğlın Yəqubıdan ayırmışsız,
Firqət odın bağırına qoyırmışsız,
Gəlüb bənim qatımda siz ögünürsiz,
Biz xaslarız, şərifləriz dersüz imdi.

Sizin birər əlinizi kəsərivən,
Cümlənizi boynunızdan asarıvən,
Cümlənizi qızığ ilə edürüvən,
"Mafəəltüm bi-Yusifə"[1], deyür imdi.

Bəs buyurdı gözlərini bağlan dedi,
Altun yığac butağına saqlan, dedi,
Anlar həm çoq ağlaşuban ğüssə yedi.
Cümləleri Yusifinə yalvar imdi.

Ayıdurlar: Şah, bizləri azad qılğıl,
Ol atamız İsrailə hörmət qılğıl,
Yəqub yulaq məhzundurur, inayət ğıl,
Ağlamaqdan iki gözi görməz imdi.

Ol məhzun bəs birimizi yıva qıldı,
Ağlamaqdan iki gözi görməz oldı,

[1] Yusifə nə etmişsiniz?

Anı eştib Yusifinin üzi göydi,
Cümləsinin əlin şeşib qoyar imdi.

Anı eşdüb Yusifinin əqli şaşdı,
Dəvyə bindi ol yüzindən niqab açdı,
Anıların cümləsinin səbri şaşdı,
Yüzin görüb, "Yusif sənsən", derlər imdi.

Aydur: Yulaq Yusifinə bənzəyürsən,
Yusif isən netə yadluq eyləyürsən?
Vallahü-billahü həqiqətdə sən Yusifsən,
"İnna Yusif-haza əxi"[1] derlər imdi.

Andan əziz Yusif aydur: Bilgil bayıq,
Bənvən imdi qardaşınız Yusif sədiq,
Uşbu bəni padşah qıldı qadir xaliq,
"Ənə Yusif, haza əxi"[2], deyür imdi.

Anı eşdüb cümləlrəri yüzin düşdi,
Utanmaqdan cümləsinin əqli şaşdı,
Misir əhli cümlələri əcəbləşdi,
Bu əhvalə əcayibə qalur imdi.

Yusif aydur: Qaldurınız başınızı!
Bağışladım oşal batil işinizi!
Heç qayğurman, məaf qılam bən həm sizi,
Suçınızı köçürdim bən, deyür imdi.

Andan anlar başlarını qaldurdılar,
Yulaq qatı həsrət birlə çoğlaşdılar,
Hər birisi Yusif birlə yığlaşdılar,
Anı görə firiştələr ağlar imdi.

[1] Sən Yusifsən, qardaşımızsan!
[2] Mən Yusifəm, qardaşımızam.



*FƏSL*

## YUSİF ƏLEYHİSSƏLAMNIN TƏDBİRİ

Yusif aydı: İmdi tədbir elə qılam,
Kömləgimi atamıza verüb ayam,
Ol məhzuni xürrəm qılıb sevinc sayam,
Xətanızı sizlər andan dilən imdi.

Nə əhvaldur, yüzügini verüb iməz?
Həm andağuq biləziki alun deməz.
Ayruq nəsnə veriməgi rəva görməz,
"İzhəbu"[1] biliməsi derlər imdi.

Quyu içrə Yusif yalnız qalmış idi.
Cəbrailə xaliq əmir qılmış idi,
Ol kömləgi uçmaqıdan almış idi.
Götürübən Yusifinə geyrür imdi.

Anı geydi ol qutıldı yılanlıqdan,
Ol kömləgi əta idi ol xalıqdan,
Dərman oldı dükəl ana sürürlıqdan,
Ol mənidən Yəqubına berir imdi.

Ol anası öldü, Yusif tifil qaldı,
Yəqub suçı bir qaravaş satun aldı,
Qaravaşnı Yusifinə dayə qıldı,
Kiçik oğlan erkən ayrub, satar imdi.

Zari qılub ağıladı ol qaravaş,
Kop dögüldi gözlərindən həm qanlı yaş,
İlahüna, bənim halim bilürsən xoş,
Sevdigimdən ayırudı bəni imdi.

Xaliq aydur: Bir hökmilə buyururvən,
Anı değı sevdügindən ayırurvən,
Firqət odın bağırına qoyırurvən,
Yetmiş yıl həm ağlaturam bilgil imdi.

[1] Gedin.

Əvvəl səni bəşirinə qovuşduram,
Andan sonra Yusifi həm bən göstərəm,
Bən qadirvən, vədəm qaçan xilaf qılam,
Bənim vədəm hərgiz xilaf olmaz imdi.

Yusif bir qul satun aldı Bəşir adlu,
Uşbu sözi dinləmağa yulaq datlu,
Qulı yulaq mehriban, həm şəfaətlu,
Dügəl işni ehsan birlə işlər imdi.

Gömüləgi Bəşirə ol Yusif verdi,
Biti yazdı belə dəği ana verdi,
Bəşir alıb bəs kömləgi yola girdi,
Yusifidən Yəqub suçna varır imdi.

Sabah yeli, xaliqiğə zarı qıldı,
Fəzli birlə xaliq ana dəstur verdi,
Bəşiridən bu yel on gün yulan gəldi,
Yusifinin duasını Yəqubuna iltər imdi.

Anı duydı Yəqub nəbi şükr qıldı,
Məhzun ikən Yəqub nəbi bəs şad oldı,
Aydur: Bənim Yusifimin iysi gəldi,
Sübh yeli götüridi, deyür imdi.

Ağrın əsgil, sübh yeli, nə ötərsən?
Sən həqiqət Yusifimsən yas dutarsan,
Cərahətim üngərməgə sən yetərsən,
Sən əsəli şad-xürrəm oldum imdi.

Bildim təhqiq müştəçisən, sübh yeli!
Yusif iysi əksilməz sən əsəli,
Anı dedüm bən asudə buldum, bəli!
"İnni lacid riyhə Yusif"[1], deyür imdi.

Yəqub qövni anı eşdüb dinləşdilər,
Yəqubını eyibləşü sözləşdilər,

[1] Küləkdən Yusifimin ətrini duyuram.



Qanıdandur, qanı Yusif, dedişdilər,
"İnnəkə nəfyi zəlalün"[1] derlər imdi.

Andan sonra on beş gündən Bəşir irdi,
Görər suda bir övrəti, ton yuvurdı,
Qüdrət birlə Bəşir gəldi, ana sordı:
Yəqub övi qandadurur, deyür imdi.

Övrət aydur: Ol Yəqubı nə sorarsan?
Tez yüyürsən, nə kişisən, nə dilərsən?
Sən Yəquba Yusifimi muştılarsan?
Muştıçısan məgər ki, sən deyür imdi.

Yəqub nəbi bəni satun almışıdı,
Yusifinə bəni dayə qılmışıdı,
Bəşir adlu kiçi oğlum satmışıdı,
Yetmiş yildür bəsrətəm, ol deyür imdi.

Xaliq bənə eylə vədə qılmışıdı,
Səni öndən sevindirəm demişidi,
Uş Yusifin muştuçısı ana gəldi,
Qanı bənim Bəşirim, deb ağlar imdi

Bəşir aydur: Aya anam, ağlamağıl,
Həsrətilə yürəgini dağlamağıl,
Həq vədəsi xilaf degil, ğəmı yeməgil,
Həqiqət uş Bəşir oğlın bənəm imdi.

Anı eşdüb başından əqli şaşdı,
Yarlı övrət uğunuban yerə düşdi,
Əqli gəldi, oğlı ilə ol görüşdi,
Hər kim görsə əcayibə qalur imdi.

Qatılaşu hər ikisi evə girdi,
Sevinməkdən ol övrətin usı getdi.
Salam qıldı, kömləgini sunu verdi,
Yüznə sürsə, Yəqub gözi açlur imdi.

[1] Sən zilləti rədd eləyənsən.

Gözin açdı İsraili anı gördi,
Nə kişisən, kimsən deyüb, ana sordı,
Bəşir aydur: Ol kim, bəni satdun idi,
Tifil ikən anamıdan ayrub imdi.

Andan Yəqub həm oqıdı ol bitini,
Qandalığın, bəyan bildi həsrətini,
Yusif sədiq Misir şahı olduğını,
Şükür qılıb həqğə sücud qılur imdi.

Andan Yusif qardaşlara xələt verdi,
Altun, gümüş, at-qatırı minnət verdi.
Atasını görüməgə rüxsət verdi.
"Və ətuti biəhliküm", deyür imdi.

Oğlanları atasına qavuşdılar,
Cümləleri Yəqub üzə görüşdilər,
Suçlarını tiləyibən ağlaşdılar,
Xətamızı bağışlağıl, derlər imdi.

Aldayuban Yusifini səndən alduq,
Qul deyübən ayıruqğa anı salduq,
Bugün bizlər anı təxtdə sultan bulduq,
Cümlə Misir əhli anın qulı imdi.

Yəqub aydı: Yanıqızı bağışladım,
Həqiqəti, günahızı əfv qıldım,
Bən həm dəği xaliqimdən rahət oldum,
Sizlərə həm rahət irsün, deyür imdi.

Bir dəvəni həm götürdi pək Cəbrail,
Ol dəvəni verib idi Mövla Cəlil,
Ya İsrail, bu iş içrə becid olğıl,
Tez Yusifə qovuşusun deyür imdi.

Minnət qılıb, ol dəvəyi Yəqub bindi,
Ulu, kiçi Kənan əhli yıraq qıldı,
Tamam yetmiş üç bin kişi yola girdi,
Yaqın gələ oğlanları yalvar imdi.



Yəqub suçı əl qaldurdı, dua qıldı,
Oğlanları amin dedi, zarı qıldı,
Duaların qəbul cənab Mövla qıldı,
Oğlanları cümlə zarı qılur imdi.

Əziz Yusif, yarlı şükür deyürübən,
Atasına qarşı çıqıb, həm gəlübən,
Burğu, təbil, kos-nağara urulubən,
Tazı atlar görklü ünin kişnər imdi.

Yəqub savçı anı görə şükür qıldı,
Yusif nəbi atdan enib bəyan oldı,
Yəqub savçı həm dəvədən enib gəldi,
Ata-oğul görüşübən ağlar imdi.

Qatı qohum, hamısı ol qardaşları,
Dükəl işə qadirdürür izim varı,
Yemə nəçük gəldi həm ol duş təbiri,
Yusifinə cümlə xidmət qılur imdi.

Yusif aydur: Şükür, məqhur oldı şeytan,
Qardaşlarım dost qıldı izim subhan,
Bugünki gün Misir şahı bənvən sıltan,
Şükür qılıb şəhrə belə girür imdi.

Andan gəldi Yusifinin oğlanları,
Yəqub sordı Yusif üzə həm anları,
Yusif aydur: Oğlanları, bizim barı,
Cümlələri Züleyxadan, deyür imdi.

Bəs Züleyxa xidmətinə hazır gəldi,
Yəqub savçı sorubanı əhval bildi.
Yəqub savçı Züleyxaya dua qıldı,
Züleyxaya andan Yusif aydur imdi.

Dəstur versin, qonaqlasam İsraili,
Sarayıma ündəsəm bən ol rəsulı,
Yusif aydur: Ya Züleyxa, bil əhvalı,
Peyğəmbərlər bu saraya girməz imdi.

Züleyxa bir kiçik saray hazır qıldı,
Dürlü nemət ol saraya gətirildi,
Yəqub savçnı ündədilər, gəldi girdi,
Bunu belə nəçük qıldun, deyür imdi.

Uşbu evi bana layiq xoş düzmişsiz,
Bənim könlüm dedükicə eyləmişsiz,
Kənan dəği bizim evgə bənzəmişsiz,
Züleyxa der: Bən Yusifdən sordım imdi.

Yəqub qövmi birgə anda durıdılar,
Züleyxanın sarayında həm otdılar,
Dürlü nemət, əlvan təàm gətürdilər,
Yəqub anı görüb yulaq danlar imdi.

Yəqub aydur: Yüz yugirmi yaşımdürür,
Ələddəvam, taət qılmaq işimdürür,
Müdam arpa ətməki aşımdürür,
Peyğəmbərlər belə təam yeməz imdi.

*FƏSL*

## QİSSEYİ-RƏYYAN

Rəyyan aydur Yusif üzə, aya sədiq,
Yəqub suçnı götürgilən bizə təhqiq.
Bizim həm ol Arımızı görsün bayıq,
Anun birlə həm kəlaçı qılsun imdi.

Yusif aydur: Rəyyan bəni ağırladı,
Zindanıdan çıqarıdı, mülkət verdi,
Aya baba, varalım biz ana, dedi,
Yəqub aydı: Xəta sözi dedin, imdi.

Heç bir minnət dutmağıl sən ol Rəyyandan,
Səni xaliq çıqarıdı ol zindandan,
Qamulara izzəti-rüfət ol subhandan,
Minnət ana dutmağılıq gərək imdi.

Yusif ana söz sözlədi, Yəqub vardı,
Rəyyan baqdı, bir nurani xoca gördi,



Əmrin necə, deyübeni ana sordı,
Yəqub aydı: Yüz yigirmi yaşım imdi.

Yenə Arım ilqar etdi, artuq dedi,
Əvvəl Yəqub suçı söznə inanmadı,
Yəqub suçı əl qaldırdı, dua qıldı,
Önükəki, köksi üzrə düşər imdi.

Məlik Rəyyan Yusif üzə genə sordı,
Nə mənidən Arımın önkək neşə düşdi?
Yusif aydı: Peyğəmbərə yalan dedi,
Lacərəmi, mundağ rüsvay oldı imdi.

Andan Rəyyan ol Yəquba çoq yalvardı,
Bu Arımın ruzgarları telim gördi,
Həm dönübən sizin dinə yenə girdi,
Buna edgü dua qılğıl, deyür imdi.

Sənin dədən İbrahim ol həq Xəlili,
Atan dəği İshaq savçı həq rəsuli,
Həm sən dəği xaliqinin İsraili,
Sənin sözin yalan degil, gərək imdi.

Yəqub savçı ol qaldırdı, düa qıldı,
Yenə Arımın önükəgi səhih oldı,
Arım bu gəz yenkiləmiş bayıq buldı,
Səni bən həm İshaq sandum, deyür imdi.

Yəqub savçı Arım üzrin qəbul qıldı,
Həman dəmdə pək Cəbrail hazır gəldi,
Ol Arımın əcəlindən xəbər verdi,
Arım bu gün ölmüş olur, deyür imdi.

Yəqub əhval Arımına bayıq qıldı,
Arım oşal sözlərini bavər buldı,
Xaliqinin fərmanilə Arım öldi.
Qamuları əcayibə qalur imdi.

Andan sonra İsrailə xəbər verdi,
Yəqub savçı Yusif ilə yenə gəldi,
Buyurıdı, yudurıdı, kəfən sardı,
Kəndu əlin anı dəfin qılur imdi.

Yəqub savçı Misir içrə qırq yil durdı,
Bir gün gəlüb Cəbraili xəbər verdi,
İsrailə həqdən salam ol yetkürdi,
Əmr elodi: Misirdən çıqğıl imdi.

Yəqub savçıya bu əhval məlum oldı,
Yusifini ünüdədi elam qıldı,
Yusif nəbi eşidübən məğmum oldı,
Yəqub suçı vida qılıb çıqar imdi.

Oşal dəmdə Yəqub anı öğütlədi:
Bu gəz, oğlum, bir öğütim alğıl, dedi,
Aqibət sən həm Misirdən çıqğıl, dedi,
Mömınlərə Misir məqam degül imdi.

Yəqub andan Kənanına nəql qıldı,
Əziz Yusif ağlayuban gerü döndi.
Vəzir, hacibə qamusına öğütlədi,
Yəqub suçı qovmın dərüb getər imdi.

Atasının yerinə həm Yəqub gəldi,
Öğüş degül, bir qaç günlər müqim oldı,
Firiştələr üzə xaliq əmr qıldı,
Firiştələr gəlib, bir gor qazur imdi.

Yəqub savçı anı görə əhval bildi.
Oğlanların vəsiyyətçün hazır qıldı,
Cümlə qövmi qatına həm dirişdürdi,
Səfalığın, halallığın dilər imdi.

Yəqub savçı salam qıldı, əhval sordı,
Firiştələr Yəqubına səbir verdi,
Tanrısının bir dostuna əcəl irdi,
Anın üçün gor qazdurur, derlər imdi.

Firiştələr güni tamam əylədilər,
Hərir diba, udü ənbər döşədilər,
Gor içərə əcəb ziba bəzədilər,
Yəqub anda giriməgə dilər imdi.



Firiştələr aydur: Əgər girir irsən,
Həqiqətdə bu məqamı sövər irsən,
Bu rahətə qovuşmağa irər irsən,
Ya İsrail, bu şərbətni icgil imdi.

Yəqub savçı əl sunuban aldı anı,
Bismillahi deyib içdi ol qədəhni,
Ol tənindən ayırıldı əziz canı,
Bir quş kibi uçumağa uçar imdi.

Firiştələr oluq saat anı yudı,
Uçmaqdan bez götürübən kəfən qoydı,
Andan sonra həm qövminə xəbər yaydi,
Əhli-beyti gəlib zarı qılur imdi.

Oğlanları namazığa hazır gəldi,
Firiştələr cümlə ana namaz qıldı,
Ol məqamdan dörtinci kök anın oldı,
Xəlil, Sara, İshaq, Yəqub anda imdi.

Bəs Yəqubın Kənandağı oğlanları,
Həm Yusifə ilətdilər bu xəbəri,
Yusif anı eşidübən qıldı zarı,
Yulaq qatı həsrətilə ağlar imdi.

Eşitdisə atasının vəfatını,
Oqıdı "rəbbi-qədri"[1] ayatını,
Dedi: "Min əlmükə, əlləmtəni"[2],
"Mən təviləl əhadisə"[3], deyür imdi.

Qaçanda kim, bu əzizə vardı anlar,
Yəqub suçı vəfatını ayladılar,
"Təfənnüni müslimən"[4] deb, ölüm dilər,
"Vəəlhisni bissaləhin"[5], deyür imdi.

[1] Quranda ayə.
[2] Elminlə mənə bilik ver.
[3] Hadisələri duymağı öyrət.
[4] Məni dünyadan müsəlman apar.
[5] Yaxşı adamlar sırasında.

*FƏSL*

## YUSİF ƏLEYHİSSƏLAMNIN MİSİRDƏN ÇIQMASI

Tək Yusifə Cəbraili hazır gəldi,
Bəs xaliqdən Yusif üzə salam qıldı,
Həqiqəti altımış yil ömrin qaldı,
Ana layiq yırağlığın qılğıl imdi.

Uşbu Misrin əhlin-elin qılğıl dəvət,
İslam dinin oquğılğıl, kosgil büdət,
Əslində sən peyğəmbərsən bil həqiqət,
Küfr əhlini İslama sən oqğıl imdi.

Yusif Misir əhlin cümlə dəvət qıldı,
Ol kəlaçı anlar üzə şiddət gəldi,
Məlik Rəyyan həm Yusifi ögütlədi,
Misir əhli səni yulaq sevər imdi.

Məlik Rəyyan ol Yusifi ögütlədi,
Misir əhli səni yulaq sorar dedi,
Ama bular islamə heç gəlməz idi,
Buları sən ündəməgil, qoyğıl imdi.

Yusif aydur: Bilgil, aya, Məlik Rəyyan,
Bayıq bana əmr qıldı xaliq dəyyan,
Bən xaliqin əmrin sizə qıldım bəyan,
Anın əmrin yürütümək gərək imdi.

Bədəzanı anı eylə qılmayavən,
Ayıruq bən bu Misirdə qalmayavən,
Kafirlərə hərgiz qonşı olmayavən,
Küfr əhlindən üzlət qılmaq gərək imdi.

Yusif nəbi möminləri cümlə verdi,
Bir xoş yerə "Nəhrülüyun" həm at verdi,
Misirdən nəql qılubanı anda durdı,
Bir şəhristan anda bina qıldı imdi.



Yusif nəbi anda buldı telim dövlət,
Ol şəhərdə dolu oldı dürlü nemət,
Ana hərgiz girəmədi küfr-bidət,
Ol şəhərə "Cəbrül-Əmin", derlər imdi.

Rəyyan eşdüb ol şəhəri əcəblədi,
Ol şəhəri görümək arzuladı,
Dəstur versə bu şəhəri görsəm dedi.
Yusif aydı: Bunda kafər görməz imdi.

Rəyyan anı eşidübən mömin oldı,
Vəlakin ol qadir təqdir elə qıldı,
Ol şəhəri görimədən Rəyyan öldi.
Bəziləri bu rəvayət qılır imdi.

Bəziləri der: Rəyyan telim ömir sürdi.
Yüz döndərdi kafərliqğə dinə girdi,
Ol arada Musa savçı anı gördi.
Həqiqəti ana firon derlər imdi.

Bəziləri ol məsiyət aydur qıldı,
İki yüz il Misir içrə məlik oldı,
Ol taqinin oğulı həm firon idi.
"Məsiyəti oğlı Vəlid", derlər imdi.

*FƏSL*

## YUSİF ƏLEYHİSSƏLAMNIN VƏFATININ BƏYANI

Yusif nəbi ol şəhərdə telim oldı,
Bir gün haliq ana əcəl məlum ğıldı,
Yusif ündəb oğlanların ögütlədi,
İmanınızı saqlayınız deyür imdi.

Andan sonra həm Züleyxa vəfat buldı,
Yusif anın həsrətindən məğmum oldı,
Andan sonra yenə ayruq olammadı,
Oğlanları başuruban bulur imdi.

Andan sonra həm Yusifə gəldi nöbət,
Övladından əhvalından oldı firqət,
Nəql qıldı xaliqiğə qıldı vəslət,
Rəhim ana rəhmət nisar qıldı imdi.

Övladları dəriləyib növhə qıldı,
Təchizini tamam edüb namaz qıldı.
Ol sədiqnin tabutı həm hazır oldı,
Bir xoş yerə anı mədfun qılur imdi.

Ol tərəfdə firavani oldı nemət,
Adamiyə, bəhayimə buldı rahət,
Vəlakin ol Misir içrə oldı şiddət,
Xəlayiqlər darlıq içrə qaldı imdi.

Məsalimə Məlik Reyyan kişi saldı,
Yusif suçı tabutıdan dursun dedi,
Ol kəlaçı Məsalimə şiddət gəldi.
Bən atamı qaçan verəm, deyür imdi.

Məsalimə uşbu xəbər ağır gəldi,
Oşal saat ləşkər dərlib hazır oldı,
Onun ilə hərb qılmağa həmlə qıldı,
Həm ol değı eşdüb tədbir qılur imdi.

Andan sonra bu araya sülh düşdü,
Əhl-əyalı cümlə ana ögütləşdi,
Məlik Reyyan atanınan edgü eşdi,
Toqışmağıl, muradınca olğıl imdi.

Yusif nəbi tabutını Reyyan aldı,
Misiridən yengisinə dəfn qıldı,
Ol arada həm xoş rahət genlik oldı,
Bu arada yulaq darlıq oldı imdi.

Andan Reyyan Məsalimə düzlük qıldı,
Çıqarıban suv içində mədfun qıldı,
Misir içrə yulaq ögüş nemət oldı,
İki yili ucuzlıqı olur imdi.



Yusif nəbi suv içində qırq yil qaldı,
Ol vəqtə kim, Kəlimüllah Misrə gəldi,
Kərim xaliq kəliminə əmr qıldı,
Sədiqimiz suv içindən çıqar imdi.

Musa Kəlim tabutını tələb qıldı,
Bulumadı, bəs bir övrət hazır gəldi,
Yusif nəbi tabutını ol göstərdi.
Musa anı suv içindən çıqar imdi.

Xaliqidən ol Musaya dəsdur oldı,
Musa Yusif tabutını alıb gəldi.
Gəldi Yəqub tabutına nəzər qıldı,
Qəbiridən ol tışraqa durur imdi.

Anda baqıb əcayibə görər idi.
Yusif savçı qissəsini qılur idi,
Hər birini ayrı-ayrı aytur idi,
Peyki-həzrət anda hazır gəldi imdi.

Bəs qoyıdı, aləm fəxri, getdi, büdət,
Kafirləri islam taba qıldı dəvət,
Əmri birlə gəldi ana peyki-həzrət,
"Nəhnü əhsənul qisas"[1], deyür imdi.

Yusif savçı qissəsini qılur idi,
Hər birinə ayru-ayru aytur idi.
Musa kəlim tabutnı alur idi,
Qızıl altun lövh üzərə yazar imdi.

Bir gün cümlə yəhudilər məcmu oldı,
Salam oğlı Əbdüllaha bilə gəldi,
Qamuları Mustafaya salam qıldı,
Telim dürlü məsələlər sorar imdi.

Əgər ki, sən gertü rəsul olur isən,
Risalətin dəvasını qılur isən,

[1] Bu hekayətlərin ən gözəlidir.

Yusif savçı qüssəsini bilür isən,
Nətəligin bizə elam qılğıl imdi.

Rəsul aydur: Ya cuhudlar oturunuz,
Kafirligi könlünüzdən çıqarınız,
Fəsih dillə, səhih iman gəltüriniz,
Sizə anın nətəligin qılam imdi.

Bəs ol sədr məni içrə xəbər açdı,
Eşitübən cuhudlarnın əqli şaşdı,
Mustafanın məlik söznə əcəbləşdi,
Bizdən yekrək bu ayıtdı, derlər imdi.

Mustafaya həqdən tofiq əyan oldı,
"Ləqəd kanə qisəsühüm"[1], bəyan qıldı,
Cuhudlarnın əqilləri müqir gəldi,
Əhməqləri əcəbləyü duymaz imdi.

*FƏSL*

## [QİSSEYİ-YUSİFİN BİTMƏSİ]

"Behəmdüllah, hazəl-kitab fəqəd təmmət"[2]
Ol oğanım ilham qıldı şükr-minnət,
Anar isən həzar dürlü pənd-hikmət,
Uşbu zəif, nəzm içərə düzdi imdi

Yusif savçı qissəsini qılduq əyan,
Ərəb, əcəm tiləyincə qılduq bəyan,
Oqumağı, dinləməği oldı asan,
Oquyanlar dua içrə ansun imdi.

Yusif savçı hikmətini aqil oqar,
Anladuqca könli irər, yaşı aqar,

[1] Onların hekayəti budur.
[2] Tanrıya şükr olsun ki, bu kitab bitdi.



Əzasından yazıqları, saçlur çıqar,
Rəhim ana rəhmət ruzi qıla imdi.

Fazil kişi uşbu nəzmi söylər olsa,
Aqil kişi qulaq dutıb dinlər olsa,
Qail samе bu müznisə dua qılsa,
Mücib anı müstəcabi qıla imdi.

Oquyanlar, dinləyənlər dua qılur,
Uşbu zəif dua umar, xaliq bilür,
Dua birlə telim asi rəhmət bulur,
Məğfirətə ol şayistə olur imdi.

Hər daş, derlər [bilgil], göhər daşı olmaz,
Dögəl kimsə göhər qədrin qiyas qılmaz,
Uşbu nəzmin qiymətini əhməq bulmaz,
Aqil bunı dinlər, anlar bilür imdi!

Ah dariğa, degmə kimsə düzimədi,
Fəhmi, əqli əksük kişi yazımadı,
Bu zəifnin üşbu nəzmin arzımadı,
Bu rübai vəzni içrə düzsə imdi.

Bunı düzən zəif bəndə, adı Əli
Yarlığağıl, əya rəhim, asi qulı,
Yigirmi dört rəqəm içrə saldı yılı,
Rəhmətindən mehribanlıq umar imdi.

Ümid dutar uşbu müznib sən Mövlayə,
Sən kərimsən, həm rəhimsən, bu zəlilə –
Rəhmət qılğıl, əya, rəhim, qul Əliyə.
Qayığulu nəfəsimi sən müfərrəh qılğıl imdi.

Xudavəndа, bu hacətim sana məlum,
Bən məhzunnın münacatı sana məlum,
Ya ərrəhimürrahimin, qılma məhrum!
Axır dəmdə iman əta qılğıl imdi.

Mövlamidən mədəd, nüsrət niyazında,
Rəcəb ayı cəlaliyə otuzında,
Tarixinin altı yüz toquzında
Bu zəif bu kitabını düzdi imdi.

Tofiq nüsrət, fəhm, qüvvət həqdən buldum,
İlham ruzi qılduğına şakir oldum,
Bu arada bu kitabı tamam qıldum,
Oquyanlar bana dua qıla imdi!

*SON*



# ƏLAVƏ

## YUSİF SURƏSİ

(*Tərcümədə əsərin üslubu saxlanılıb*)

Bu, məlum kitabın ayələrindəndir. Biz Quranı ərəb dilində göndərdik ki, sizə aydın ola. Ən gözəl qissəni hekayət edirik. Sən əvvəlcə bundan xəbərdar deyildin.

Yusif atasına dedi ki, ey ata, yuxuda on bir ulduz və günəşlə ayı görmüşəm. Onlar mənə səcdə edirdilər. Atası dedi: ey oğul, öz yuxunu qardaşlarına demə. Onlar sənin haqqında hiylə düzəldərlər. Şeytan insan üçün aşkar düşməndir. Sən ki, bu yuxunu görmüsən, Tanrı səni əziz edəcək. Sənə hadisələrin izahı elmini öyrədəcək. Bütün nemətləri sənə və eləcə də Yəqubun başqa övladlarına bağışlayacaq; necə ki, sənin baban İbrahim və İshaqa bağışlamışdı. Allah qüdrətli və dəyanətlidir.

Burada Yusiflə qardaşları hekayətində sual verənlərə cavablar vardır. Qardaşları dedilər ki, Yusif və onun doğma qardaşı atamızın yanında bizdən əziz sayılır. Atamızın burada xətası vardır. Onu ya uzaq bir yerə atmalı, ya da öldürməliyik ki, bizə mane olmasın. Belə etsək, atamızın bizə mərhəməti artar. Sonra da tövbə edib, yaxşı adamlar sırasına keçərik. Dedilər ki, Yusifi öldürməyək, qaranlıq bir quyuya ataq. Bəlkə də yoldan keçənlər tapıb apardılar.

Onlar dedilər: ata, nə üçün bizi Yusifə yad hesab edirsən? Biz ki, onun xeyirxahlarıyıq. İcazə ver, sabah bizimlə gedib, meyvələr yesin, oynasın. Biz onu qoruyub saxlarıq. Dedi: mən onsuz darıxaram. Qorxuram onu qurd yesin. Sizin də xəbəriniz olmasın. Dedilər ki, bəs biz nəyik, qoymarıq onu qurd yesin. Belə olarsa, onda biz ziyankarlar olarıq.

Götürüb apardılar. Fikirləşdilər ki, salsınlar qaranlıq bir quyuya. Biz ona vəhy göndərdik. Əlbəttə, onları bu macəradan xəbərdar edəcəksən.

Axşam ağlaya-ağlaya atalarının yanına gəldilər. Dedilər ki, ey ata, yarışa-ötüşməyə başladıq. Yusifi qoyduq paltarlarımızın yanında. Qurd gəlib yeyib. Yəqin ki, buna inanmayacaqsan. Baxmayaraq ki, biz düzünü deyirik. Yusifin köynəyini yalançı qana batırıb gətirdilər. O,

bunu görüb qüssələndi. Amma köynək parçalanmamışdı. Dedi: əcəb qurddur, Yusifi yeyib, köynəyini bütöv saxlayıb. Sizin nəfsiniz bunu bəzəməyə əmr verib. Allah kömək eləyər; mənim işim səbr eləməkdən başqa heç nə deyil.

Bir karvan gəldi. Öz su gətirənlərini suya göndərdilər. O, dolçasını quyuya salladı. Onu tapdı, gətirib dedi ki, muştuluq verin, gözəl bir oğlan tapmışam. Karvan əhli onu gizlətdilər. Dedilər ki, bu suyun sahibi onu bizə bağışlayıb. Allah onların nə edəcəyini bilirdi. Qardaşları onu az qiymətə çox ucuz, bir neçə dirhəmə satdılar. Onlar Yusifin qiymətini bilmirdilər.

Misir əhalisindən bir nəfər onu öz arvadı üçün aldı. Dedi ki, qoruyub saxlamaq lazımdır. Bizə fayda verə bilər. Ya da özümüzə oğul edərik. Beləliklə, Yusifi orada saxladıq. Ona hadisələrin şərhini açmağı təlim etdik. Allah öz istəyində bacarıqlıdır. Bunu çox adam bilmir. Yusif boya-başa çatıb kamilləşdi. Ona bilik və elm öyrətdik. O qadın, yəni Züleyxa Yusifə dedi ki, mənə yaxın gəl. Qapıları bağladı. Yusif işi belə gördükdə dedi ki, əsla buna boyun qoymaram. Tanrı məni pak və təmiz – özünə yaxın xəlq eləyib. Mən sənin ərinə xəyanət etmərəm. Xainlər nicat tapmırlar. Yaxşılığa yamanlıq edənlər pis adamlardır. Qadın Yusifə sarı hərəkət etdi. Yusif tabe olmadı. Tanrının istəyi belə idi. Belə lazım idi. Onu pis yoldan döndərdik. O, bizim müxlis həndələrimizdəndir. Yusif bağlı qapılara çatanda öz-özünə onun üzünə açılırdı. Əlini uzadıb onu tutdu və özünə sarı çəkdi. Yusifin köynəyi arxadan cırıldı. Arvadın əri gəlib çıxdı. O, Züleyxanı həyəcanlı görüb bildi ki, nəsə baş verib. Yusifin də halı özündə deyildi. O, hələ məsələni soruşmadan Züleyxa irəli keçib dedi: sənin namusuna təcavüz edənin cəzası nədir? O, öz günahını gizlətmək istəyirdi. O, Yusifi zindana salmaq, ya da əbədi bir əzab verib, ədəbləndirməyi lazım bildi. Yusif onu zindana salmaq və döyməklə cəzalanmasını eşidəndə dedi: o, məni bu əmələ dəvət etdi. Mən isə ona tabe olmadım. Əziz dedi: mən buna necə inanım? Kimin bundan xəbəri var? Yusif dedi: o biri evdə dörd aylıq uşaq var, o, mənim şahidimdir. O uşaq Züleyxanın xalasının balası idi. Əziz dedi: dörd aylıq uşaq necə şahid ola bilər?! Sən bizi ələ salırsan?! Yusif dedi: böyük Tanrının əmri ilə o, dil açıb danışa bilər. Əziz uşaqdan soruşdu. O cavab verdi ki, Yusif düz deyir. Allah bu barədə xəbərdardır. Ey Əziz, əgər Yusifin köynəyi qabaqdan cırılıbsa, demək, Yusif günahkardır. Əgər arxadan cırılıbsa, onda təqsir



Züleyxadadır, Əziz baxıb gördü ki, köynək arxadan cırılıb. Əziz Züleyxaya dedi ki, bu, siz qadınların hiyləsidir. Sizin hiylələriniz çox böyükdür. Yusifə dedi: ey Yusif, bağışla və bu məsələni gizli saxla. Züleyxa, sən isə tövbə elə. Çünki bu xətanı sən eləmisən.

Şəhərdə qadınlar arasında yayıldı ki, Əzizin arvadı bir cavanla eşqbazlıq eləyir. Çalışır ki, onu özünə tabe eləsin. O, yoldan azmışdır. Əzizin qadını bunu eşidib onların arxasınca adam göndərdi və onlara bir məclis düzəltdi. Hərəsinin əlinə bir bıçaq verdi. Sonra dedi: ey Yusif, çıx gəl səni görsünlər. Onu görəndə mat qalıb öz əllərini kəsdilər və dedilər ki, bu ilahi varlıqdır, bu cavan adam deyil, əziz bir mələkdir.

Züleyxa dedi: budur, baxın, siz məni danlayır, aşiq olduğum üçün təqsirləndirirsiniz. Onunla oturub danışdım ki, bəlkə aldadıb yola gətirim. Amma öz nəfsinə qalib gəlib, tabe olmadı. Əgər mən deyəni eləməsə, zindana göndərəcəyəm ki, xar və bədbəxt olsun. Yusif dedi: ilahi, bunların hiyləsinə uymaqdansa, mənim üçün zindan yaxşıdır. Əgər məni qoruyub saxlamasan, söz yox ki, onlara meyl edib cahillər cərgəsinə keçəcəyəm. Allah onun duasını qəbul etdi və onların şərindən nicat verdi.

Allah hər şeyi eşidir və bilir. Yusifin dəlillərini gördülər. Köynəyinin arxadan parçalanması, körpənin şahidliyi və qadınların əllərini doğraması hamıya məlum oldu. Bununla belə, məsləhət bildilər ki, bir müddət zindanda qalsın. İki nəfər cavan Yusiflə birlikdə zindana daxil oldu. Onlardan biri dedi: yuxuda gördüm ki, üzüm suyu sıxıram – şərab düzəldirəm. O birisi isə dedi: yuxuda gördüm ki, başıma bir tabaq çörək almışam, quşlar gəlib onu yeyirlər. Bunu bizə təbir elə. Səni ağıllı və pak adam kimi görürük. Yusif əvvəlcə yuxunu belə tezliklə təbir eləmək istəmədi. Burada nə isə hiss edirdi. Dedi ki, sizə veriləcək bir təamın nədən ibarət olduğunu qabaqcadan deyə bilərəm. Bunu mənə mənim Tanrım öyrədib. Mən Tanrıya və axirətə inanmayanları tərk elədim. Onlar kafir və etiqadsızdırlar. Mən öz atam Yəqub, babam İbrahim və İshaqdan ayrılmaram, onların yolunu seçdim. Biz tanrıya şərik qərar vermirik. Onu yeganə və şəriksiz tanıyırıq. Bu, Allahın bizlərə mərhəmətidir. Heyif ki, camaatın çoxu naşükürdür.

Ey mənim zindan yoldaşlarım, sizin ki, qızıldan, gümüşdən, dəmirdən və ağacdan bu qədər tanrılarınız var, yaxşı olar ki, siz yeganə qadir pərvərdigara iman gətirəsiniz. Bu adlar ki, siz və sizin atalarınız

işlədir Tanrı göndərməyib? Başqa bir dəlil, Tanrıdan başqa ayrı hökmran yoxdur. O buyurubdur ki, ondan başqa ayrısının qarşısında itaət etməyin. İbadət yalnız ona layiqdir. Düz yol onun yoludur. Amma çoxları bundan xəbərsizdirlər.

Ey mənim zindan yoldaşlarım, biriniz ki, şahın saqisidir, üç günə xilas olacaq. Gedib yenə öz soltanını, həmişə olduğu kimi, şərabla məst edəcək. Amma o birisi ki, çörəkçidir, dardan asılacaq. Bir müddət bu halda qalacaq, quşlar gəlib başını yeyəcəklər. O dedi ki, yalan deyirdim, mən belə yuxu görməmişəm. Yusif cavab verdi ki, gördüyünüz yuxu barədə əmr verildi və təhkim edildi. Siz məndən elə bir yuxu təvili istəmişdiniz. Dediyimin əksinə olmayacaq. Sonra saqiyə dedi ki, sən azad olacaqsan, öz hakiminin yanında məni yada sal. De ki, o günahsızdır. Bəlkə mənə bu bəladan nəcat versin. O, nəcat tapdı. Lakin öz əvvəlki mənsəbinə çatdıqdan sonra zindan və orda ona yuxu təbir edəni unutdu. Yusif bir neçə il zindanda qalmalı oldu.

Üç gündən sonra şah adam göndərib çörəkçini xəyanəti sübut olduğu üçün dara çəkdirdi. Quşlar gəlib gözünü oydular. Deyirlər ki, Yusif yeddi və ya on iki il zindanda qaldı. Məlik Rəyyan dəhşətli bir yuxu gördü. Bütün əyanları çağırıb dedi ki, yuxuda gördüm Yabəs çayından yeddi kök öküz çıxdı, onları yeddi arıq öküz yedi. Sonra gördüm ki, yeddi quru sünbül yeddi göy sünbülü yeyib yerə batdı. Mənim bu yuxumun təbirini söyləyin. Cavab verdilər ki, bu çox qarışıq yuxudur, biz onu yozmaqda acizik. Zindandan nəcat tapan saqinin yadına düşdü, dedi ki, zindanda bir nəfər var, yuxunu çox gözəl təbir edir. Məni göndərin gedib ondan soruşum. Şah şad olub dedi ki, tez hərəkət edib ondan bu yuxunu öyrən.

Saqi ata minib zindana gəldi və Yusifdən soruşdu ki, ey düz danışan insan, söylə görək bu yuxunun təbiri nədən ibarətdir. Yeddi arıq öküz yeddi kök öküzü yedi, yeddi quru sünbül də yeddi göy sünbülü özünə sarıyıb qurutdu. Alimlər bunu yozmaqda aciz qaldılar. Mən düzgün cavabla şahın və şahın adamlarının yanına qayıda bilim və onlara bunun nədən ibarət olduğunu söyləyim. Qoy sənin fəzilətini başa düşüb yanına çağırsın.

Yusif dedi ki, yeddi il əkin, biçin, taxılı sünbüldə saxlayın. Az hissəsini yeyin, qənaət edin. Ardınca yeddi il rahatlıq olacaq. Saxladığınız taxılı yavaş-yavaş yeyin. Sonra yağış yağacaq, bərəkətli il gələcək, adamlar özlərinə azuqə tapacaqlar.



Saqi geri qayıdıb, yuxunun təbirini şaha dedi. Şah bu təbiri qulaqları ilə eşitmək üçün dedi ki, gedib Yusifi yanıma gətirin. Şahın adamı gəlib Yusifə dedi ki, buyur gəl şahın yanına. Ondan soruş ki, qoy tələb edib bilsin ki, qadınların hiyləsi və məclisdə əllərini kəsməsi nə idi. Necə ki, mənim Allahım bu hiylədən xəbərdardır. Yusif istədi ki, onun günahsız olduğu məlum olsun. Qasid gəlib bu əhvalatı şaha dedi. Şah o qadınları çağırdı. Züleyxanı da gətirdilər. şah soruşdu ki, bu nə əhvalatdır? Yusifdən nə istəyirdiniz? Dedidər ki, Yusif pak-pakizə bir şəxsdir. Allah onun kimi bir məxluq yaratmayıb. Biz ondan az, ya çox heç bir pislik görməmişik. Züleyxa dedi ki, mən ona çatmaq fikrimi bildirdim, qəbul eləmədi. Mən də belə bir hərəkət etdim. Yusif nə deyirsə, düz deyir. Şah əmr elədi ki, Yusif gəlsin, bunlara cəza verəcəyəm. Yusif dedi ki, mənim məqsədim onlara cəza verdirmək deyil. Məqsədim budur: Əziz bilsin ki, mən ona xəyanət etməmişəm; bir də bilsin ki, Tanrı yalnız düz yol göstərir. O, pis əməllər sahibinə, xəyanətkarlara cəza verər. Demirəm ki, mənim nəfsim tərtəmizdir. Və arzulara meyl etmir. Nəfs həmişə pisliyə doğru sövq edir. Amma mənim pərvərdigarım mehriban və bağışlayandır. Məlik dedi ki, sən bu gündən mənim yanımda ayrıca hörmət sahibisən. Cavab verdi ki, mən bu torpağın xəzinələrinin sahibi ilə onları necə saxlamağı yaxşı bilirəm. Beləliklə, Yusifi oranın əzizi etdik. Burada hər nə istəsə və hər kimə nə etmək fikrində olsa, ona icazə verdik. Yaxşı insanların əməyini itirmirik. Əlbəttə, axirət muzdu iman gətirənlər üçün daha yaxşıdır.

Qardaşları gəldi, Yusif onları tanıdı, onlar isə onu tanımadılar. Yusif onlara hörmət göstərdi. Dedi ki, mən çanağı dolu doldururam. Mən ən yaxşı qonaqçıyam. Atanızın yanında qalan qardaşınızı da gətirin bura. Mən adam başı taxıl verirəm, dəvə sayı yox. Əgər onu gətirməsəniz, bir də mənə yaxın gəlməyin. Daha taxıl verməyəcəyəm. Dedilər atamızla danışarıq, icazə versə, itaət etməliyik. Qullarına dedi ki, onların sərmayəsini, gətirdikləri nəqdi qaytarın özlərinə. Bəlkə aparıb, evdə bunun nə olduğunu bilib geri dönsünlər.

Gəlib atalarına dedilər ki, qardaşımızı aparmasaq, bir də taxıl verməyəcək. İcazə ver, onu aparaq. Qoruyub saxlayarıq. Ataları dedi ki, sizə inanmıram, necə ki, qabaqca onun qardaşını da inanmışdım. Tanrı qoruyub saxlayanların ən gözəli, mehribanların mehribanıdır. Qablarını açıb gördülər ki, apardıqları nəqdi oraya qoyublar. Dedilər ki, daha nə istəyirik, sərmayəmizi özümüzə qaytarıb. Qoy gedib özümüzə və

adamlarımıza taxıl alaq. Biz qardaşımızı mütləq qoruyub saxlayacağıq. Bir dəvə artıq yük alarıq. Gətirdiyimiz azdır. Dedi ki, mənimlə and için, peyman bağlayın, yoxsa onu sizə verməyəcəyəm. Onlar and içib söz verdilər. Dedi ki, ey mənim oğlanlarım, hamınız bir dərvazadan çıxmayın ki, sizə göz dəyər. Bir dərvazadan girib, o birindən çıxın. Mən sizdən heç bir qəzanı dəf etmirəm. Tanrıdan başqa hakim yoxdur. Mən ona təvəkkül edirəm. Bütün ümid bəsləyənlər ona üz tutmalıdırlar.

Ataları dediyi dərvazadan daxil oldular. Amma, bu, onların başından heç bir qəzanı rədd etmədi. Oğurluq qarası yaxdılar. Yəqubun müsibəti iki qat oldu. O, ancaq bunu tapşırmışdı, ürəyində olanı demişdi. O, bilik sahibi idi. Biz bunu ona öyrətmişdik. Çoxları isə bunu bilmir. Yusifin yanına daxil oldular. Doğma qardaşını çağırıb dedi ki, nə baş verəcəyindən qəmlənmə. Mən sənin qardaşınam.

Yusif onları yola saldı. Məşrəbəni qoydurdu qardaşının xurcununa. Sonra da münadilər səsləndilər ki, ey karvan əhli, siz oğrusunuz. Soruşdular: nə itiribsiniz ki, axtarırsınız. Dedilər ki, şahın taxıl ölçənini, məşrəbəsini. Kim onu tapsa bir dəvə yükü ənam alacaq. Mən isə onu tapmağa gəlmişəm. Cavab verdilər ki, biz həmin adamlarıq, bir fəsad törətmərik. Heç vaxt oğurluq etməmişik. Söylədilər ki, bu, doğru olarsa, cəzası nədir. Dedilər: məşrəbə kimin xurcunundan çıxsa cəzalanmalıdır. Zalimlərə cəza verilir. Yusif xurcunları axtarmağa başlatdı. Əvvəlcə o biriləri. Sonra ölçü qabı doğma qardaşının xurcunundan çıxdı. Əlbəttə, Yusif təlqin etdik ki, qardaşını əsir saxlasın. Başlarını aşağı salıb, onu danlamağa başladılar.

Misir hakiminin qanununa görə onları döyməli, əzab verməli idilər. Budur ki, Yusif onu etmədi. İstəsək hər kimi yüksək dərəcəyə qaldırarıq. Hər elm sahibindən uca bir alim var. Yusif soruşdu: bu nə hərəkətdir elədiniz? Məgər demirdiniz ki, peyğəmbər övladısınız? Dedilər biz eləməmişik. Əgər o, edibsə, nə eləyək. Onun doğma qardaşı da belə eləmişdi. Xalasının həyətində bir duma var idi. Qapıya bir yolçu gəlir. Yusif quşu ona bağışlayır. Qardaşları deyirlər ki, Yusif oğrudur. Yusif bunu gizli saxladı, demədi. Amma dedi ki, oğurluqda siz daha pis işlər görübsünüz. Oğulu atasından oğurlayıb itirdiniz. Allah bunu bilir. Yusif qardaşını adamlarına tapşırdı; onlar nə qədər yalvardılar mümkün olmadı. Dedilər: onun qoca bir atası var. Bizim birimizi saxlayın. Sizi yaxşı adam kimi tanıyırıq. Dedi ki, əsla ola bilməz. Allaha pənah aparırıq. Biz müqəssirin yerinə başqasını tutsaq zalım hesab olarıq. Naümid oldular. Bildilər ki, onu geri verməyəcəklər. Gedib xəlvəti məşvərət etdilər. Onların yaşca böyükləri dedi: məgər bilmirsiniz ki, atanız oğlu barədə əhd-peyman etdi. Yəni, siz onu qoruyub saxlamalısınız. Siz də and içdiniz. İndi isə bu hadisə baş verdi. Belə bir təqsir etdiniz. Mən, atamız icazə verməyincə, Misirdən çıxmayacağam. Ya da bu barədə Allah özü atamın yanına qayıtmağa və ya onu xilas etməyə hökm eləsin. O, hökm verənlərin ən yaxşısıdır. Siz atanızın yanına qayıdıb deyin ki, oğlu oğurluq elədi. Biz isə bildiyimizdən başqa heç nəyə şahidlik edə bilmədik. Həqiqətdə belə oldu ki, Məlikin ölçü qabını onun bar-bünəsindən çıxartdılar. Bəlkə də biləbilə qabı onun yükünə qoyublar. Nə cür olduğunu bilmirik. Olduğumuz kənddən və gəldiyimiz karvandan soruşun. Biz düz danışırıq. Dedi: bəlkə sizi bu əmələ nəfsiniz məcbur edib. Mənim səbrdən başqa çarəm yoxdur. Ümidvaram ki, Allah hamısını Yusiflə qardaşını mənə yetirə. Əlbəttə, o, bilici və hikmət sahibidir. Onlardan üz döndərib dedi ki, vay mənim halıma. Yusif fəraqında nə edəcəyəm. Onun gözləri bu qəmdən ağardı, özü də qocaldı. Dedilər: sən Yusifini bu şəkildə yad etsən, ya xəstələnəcəksən və ya öləcəksən. Cavab verdi ki, mən öz ağır qəmlərimi Allaha bəyan edirəm. Siz isə bunu bilmirsiniz. Ey mənim oğlanlarım, gedib Yusifi və onun qardaşını axtarın, Allahın mərhəmətindən naümid olmayın. Əslində heç kəs Allahın mərhəmətindən naümid olmaz, yalnız kafirlər naümiddirlər.

Gedib dedilər: ey Əziz, bizə fəlakət üz verib. Nəyimiz var, azdan-çoxdan gətirmişik. Bizə rəhm elə, sədəqə ver, Allah sədəqə verənlərə kömək edir. Yəqub Misir padişahına məktub yazıb deyir ki, biz peyğəmbər nəsliyik, oğurluq eləmərik. Mənim bir oğlumu qardaşları çölə aparıb dedilər ki, qurd yeyib; qanlı köynəyini də mənə gətirdilər. Fəraqında o qədər ağlamışam ki, gözlərim kor olub. Onun doğma qardaşı var idi ki, nəfəsilə təsəlli tapırdım. Siz onu oğurluq üstə saxlayıbsınız. Onu mənə qaytarın, yoxsa elə bir nifrin edərəm ki, sədəməsi yeddinci oğlunuza belə toxunar. Dedi: Yusif və qardaşına nə etdiyinizi bildiniz. Əlbəttə, o vaxt nadan idiniz.

Yusif tacı başından götürdü. Dedilər ki, sən Yusifsən. Cavab verdi ki, bəli, mən Yusifəm, bu da mənim qardaşımdır. Allah məni bizə ənam verdi. Məsələ budur ki, Allah pəhrizkarları, yaxşı adamları, səbr eləyənləri məhrum etmir. Dedilər: Allah səni bizə əta edib. Əlbəttə, biz xətakarlarıq. Dedi: sizə sərzəniş yeri yoxdur. Allah sizin təqsirinizdən

keçəcək. O, mehribanların mehribanıdır. Mənim bu köynəyimi aparıb verin atanıza, salsın üzünə gözləri açılacaq. Sonra, onunla birlikdə hamınız yanıma gəlin.

Karvan şəhərdən ayrıldı. Yəqub dedi ki, oğlum Yusifin köynəyinin ətrini duyuram. Mənə ağılsız və sayru deməyin. Dedilər: and olsun Allaha ki, sən öz qədimki xəta fikrindən dönmürsən. Qasid gəlib köynəyi ona verdi. Gözləri açıldı. Dedi: sizə demişdim ki, Allah tərəfindən mənə bildirilənləri siz bilmirsiniz. Dedilər: ata, bizə bağışlanmaq tələb et. Bizlər günahkarlarıq. Dedi: mən sizə Allahdan mərhəmət dilərəm. O, bağışlayan və mərhəmət sahibidir. Yusifin yanına gəldilər. O, bunları qarşıladı. Atasını və anasını yanında oturtdu; dedi: gəlin Misrə ki, Allah belə istəyibdir. Atası ilə anasını öz taxtında oturtdu. Onlar ona təşəkkürlər etdilər. Dedi: ey ata, mənim qabaqca gördüyüm yuxunun təbiri bu imiş. Allah onu düz elədi. Mənə belə bir nemət bağışladı. O, məni zindandan çıxartdı, sizi mənə yetirdi. Şeytan qardaşlarımla mənim arama elə bir fitnə salmışdı. Mənim Allahım ən yaxşı tədbir tökəndir. Nə istəsə onu eləyər. O, hikmət sahibidir, hər şeydən xəbərdardır, Ey mənim Tanrım, məni padşahlığa çatdırdın, mənə yuxu təbiri və hadisələri qabaqcadan bilmək elmi öyrətdin. Ey yerləri və göyləri yaradan, sənsən məni dünyada və axirətdə dolandıran. Məni müsəlman öldür və saleh adamlara qovuşdur. Ey Məhəmməd, bu qissə gizli qalan xəbərlərdəndir. Onu sənə göndərdim, vəhy verdim. Onlar sənin haqqında pis fikrə düşənlər idilər. Adamların əksəriyyəti müsəlman deyil. Sən istəsən də onlardan Quranı oxumaq və təbliğ etmək üçün sual eləmirsən. Burada sənin heç bir müzdün yoxdur. Qissəni deyənlər muzd istəyirlər. Quran aləm üçün nəsihətlərdən başqa heç nə deyildir. Məkkə müşrikləri sənin möcüzələrinə etina etmir və üz çevirirlər. Onlar böyük qüdrət sahibinin varlığına göylərdə və yerdə olan hikmət və şəninə inanmır, dəlillərini saymırlar. Bu haqda nə düşünür, nə də ibrət alırlar. Onlar buna iman gətirmirlər. Əksəriyyəti kafirdirlər. Onlar bilmirlər ki, Allah tərəfindən əzab göndəriləcək və qiyamət olacaqdır. Bundan xəbərsizdirlər. De ki, mənim yolum budur. Sizi Allaha tərəf dəvət eləyirəm, inkar edilməz dəlillərlə. Mən və mənim tərəfdarlarım da belə edirlər. Tanrı pakdır, mən ona şərik qail olanlardan deyiləm. Səndən qabaq da kənd əhlinə kişilər göndərib və onlara vəhy vermişik. Özlərindən qabaqkıları seyr edib, necə olduğunu bilmirlər. Yaxşı adamlar üçün axirət mükafatı yaxşıdır. Peyğəmbərlər



onların imanından naümid olduqda möhlət verdik. Kafirlər elə xəyal elədilər ki, peyğəmbərlər onlara yalan deyirlər. Peyğəmbərlərə kömək etdik və onlara əzab göndərdik. Peyğəmbərlərə və onlara tabe olanlara nəcat verdik. Bizim kafirlərə verdiyimiz əzab geri qayıtmaz. Əql sahiblərinə, peyğəmbərlərin və Yusifin qissəsində nəsihətlər vardır. Quranda yalan deyilmiş bir söz yoxdur. Amma özündən əvvəlkilərin təsdiqi və hər şeyin təfsili ondadır. O, möminlər və müsəlmanlar üçün düz yol göstərən və mərhəmətli dəlildir.

## LÜĞƏT

### ƏSKİ AZƏRBAYCAN SÖZLƏRİ

### A

*Acış* – acı, acımış.
*Açğur // açqır* – açan, açar.
*Adaq // adağ* – ayaq.
*Ağ/maq/* – qalx/maq/, ucal/maq/, yüksəl/mək/.
*Ağır* – qiymətli, dəyərli, möhkəm, əziz.
*Ağırla/maq/* – qiymət ver/mək/, əzizlə/mək/, hörmət et/mək/.
*Al* – hiylə, fel, kələk, qırmızı.
*Alb // alp* – igid, cəsur, qəhrəman, bahadır.
*Alda/maq/* – aldat/maq/, kələk gəl/mək/, hiylə qur/maq/.
*Aldaçı* – alan, satın alan.
*Alıd* – hüzur, qarşı.
*Alıdur/maq/ // aludur/maq/* – aldadıb al/maq/.
*Alıqa //* alğa/lı/ – almaq, götürüb qayıtmaq.
*Amraq // amrak* – istəkli, əziz, doğma, yaxın.
*An* – yan, qabaq-qarşı.
*Ana* – ona.
*Anca* – o miqdar, o qədər.
*Anda* – orada, o yerdə, o vaxt.
*Andıca* – bir anlığa.
*Anğac* – çatdıqda, yetdikdə.
*Anız-anız* – yumşaq-yumşaq, anlada-anlada.
*Anıt/maq/* – and ver/mək/, and içdir/mək/.
*Anraş/maq/* – dərk et/mək/, anla/maq/, duy/maq/.
*Ansız* – onsuz /onu unutmadan, arzulamadan/.
*Antlaş/maq/* – and iç/mək/, əhd-peyman et/mək/.
*Ard/maq/ // arıdı/maq/* – üzül/mək/, zəiflə/mək/, candan düş/mək/.
*Arıq/arığ* – təmiz, pak.
*Arıq // arq* – arx, su axarı, kiçik çay.
*Arıl/maq/* – ayrıl/maq, ibrət götür/mək/.
*Arızı/maq/* – arzula/maq/, arzu et/mək/.
*Arqan* – örkən, ip, kəndir.
*Art // artını* – ard, arxa, arxasınca.



*Ası // asıq* – fayda, xeyir.
*Aşar* – aşırar, yeyər, yıxar.
*Aşlıq* – yemək-içmək, ərzaq.
*Aşnu* – əvvəl, əvvəlki, keçmiş, keçmişki.
*Ay/maq/* – de/mək/, söylə/mək/, aydın et/mək/.
*Aya // iyə* – sahib, qoruyan, saxlayan, böyük, hörmətli.
*Ayğac* – bir ayadək, bir ay müddətinə.
*Ayıruqı // ayruqsı* – ayrısı, başqası, o birisi.
*Ayz/maq/ //* ayzı/maq/ – ümid et/mək/, arzu et/mək/.
*Azuq // azıq* – yemək, azuqə, ərzaq, yem.

### B

*Baba* – ata, böyük ata.
*Balqır* – parlaq, işıqlı, nurlu.
*Balqu* – yuxarı, hündür, uca.
*Bar/maq/* – get/mək/, var/maq/, hərəkət et/mək/.
*Barmaqlıq* – getməklik, varmaqlıq.
*Barıça/barça* – bütün, bütöv, hamı, birgə, cəmi.
*Başağ* – baş, üst, yan, kənar; başçı, öncül.
*Başdağ* – başçı; ulu Tanrı, böyük.
*Başquran* – başçılıq edən, yol göstərən, kömək edən.
*Bayağı // bayaqı* – bayaqkı kimi, köhnəlmiş, vaxtı keçmiş.
*Bayıq* – doğru, dürüst, təbii, həqiqi, aydın, düz.
*Bayıt/maq/* – şənlət/mək/, varlandır/maq/.
*Baykut* – pərt, məğlub, rədd edilmiş, sayılmaz.
*Becid // bəcid* – tez, cəld, zirək.
*Bənüklə/mək/* – xalla/maq/, nişanla/maq/, dağla/maq/, əzab ver/mək/.
*Bəs* – beş.
*Bilə* – birgə, birlikdə.
*Bili* – məlumat, xəbər, bildirmək, anlatmaq.
*Bilül* – billur, qiymətli şüşə, parlaq.
*Bitək* – əsər, kitab, bitmiş yazı, fikir toplusu.
*Biti/bitik* – kitab, yazı, məktub, müqavilə.
*Bozla/maq/* – bağır/maq/, haray çəkmək.
*Buğav, bağ-buğav* – bənd, bağ, ip, buxov.
*Buğday* – buğda.

*Buldaçı* – dərk etməli, bilməli, duymalı.
*Bundağ* – bu cür, belə, bunun kimi.
*Burğu* – çalğı aləti, şeypur.
*Buş/maq/* – bus/maq/, güd/mək/, gözdən keçirt/mək/.
*Büt* – gözəl, bütpərəstlərin müxtəlif əşyalardan düzəltdiyi tanrısı.

## Ç

*Çağrı/maq/* – çağır/maq/, hıçqır/maq/.
*Çalıq* – car çəkən, haraуçı, çalqı alətilə səsləyən.
*Çər* – vaxt, vədə.
*Çəri* – qoşun, əsgər, ordu.
*Çıqğay* – çıxan, çıxmış.
*Çoğ* – çağırış, bağırış.
*Çoğlaş/maq/* – çağırış/maq/, bağırış/maq/.
*Çov* – səs, haray, çağırış.
*Çuğlaş/maq/* – dərdləş/mək/, pıçıldaş/maq/, qarış/maq/, giriş/mək/, baş qoş/maq/.

## D

*Darğı/maq/* – darıx/maq/, sıxıl/maq/, dara düş/mək/.
*Darluq/darlıq* – kasıblıq, aclıq, ehtiyac, yoxsulluq.
*Datlurig* – dadlı-duzlu, şirin, xoşagələn.
*Dediş/mək/* – söhbətləş/mək/, de/mək/, danış/maq/.
*Dekəl* – çığal, nadan, fərsiz, qanmaz.
*Dekmə // dəkmə* – küt, təsadüfi, hər yetən.
*Denə* – yenə, genə.
*Dəprən/mək/* – tərpən/mək/, hərəkət etmək.
*Dər/mək* – yığ/maq, topla/maq, cəm et/mək/, düz/mək/; bağla/maq/.
*Dariçə* – pəncərə, qapıcıq.
*Dərilə/mək* – yığ/maq/, topla/maq/, cəmlə/mək/.
*Dərnə* – içəri, dərin yer, qapalı otaq.
*Dikən/mək/* – arxalan/maq/, özünü çək/mək/, qürurlan/maq/.
*Dinə* – anlamaq, yararlı saymaq, məqsədə uyğun saymaq.
*Dinləş/mək/* – bir-birini dinləmək, an/maq/, başa düş/mək/.
*Diriş/mək/* – topla/maq/, bir yerə yığ/maq/.
*Dirləş/mək/* – dirçəl/mək/, təəccüb et/mək/.



*Dirnəş/mək/ // dırnaş/maq/* – həyəcan keçir/mək/, qeyri-adi hal al/maq.
*Dizin/mək/* – qoşul/maq/, birləş/mək/, sıralan/maq.
*Diziş/mək/* – düzül/mək/, sıralan/maq/, birləş/mək/.
*Döndürədi* – döndürən, yox edən, dəyişdirən.
*Dönəlti* – dönüş, çevriliş, inqilab.
*Dura-qıba* – duruxub, yadlıq edib, kənar durub.
*Duş* – yuxu, vaqiə, xəyal, fikir.
*Dükəl // tükəl* – bütün, bütünlüklə, hamısı, tamam.
*Dün/tün* – dünən, gecə.
*Dünlə/mək, maq/* – başa düş/mək/, qan/maq/, bil/mək/.
*Dünü-güni* – gecəli-gündüzlü, dünənli-bugünlü.

## E

*Edgü* – yaxşı, uğurlu.
*Eklən/mək/* – uyğun gəl/mək/, yerləş/mək/, düz gəl/mək/, yaraş/maq/.
*Eliki/yıl/* – ilk/il/, nəzərdə tutulan /il/.
*Elgil* – elliklə, ellər, hamılıqla.
*Eniz* – aşağı, eniş.
*Eş* – yoldaş, dost, həmdəm, həmkar, istəkli; sevgili.
*Ev/mək/* – istə/mək/, arzula/maq/.
*Ey, eyi* – yaxşı, gözəl, yey.
*Eygün // eygi* – yaxşı, gözəl, xoşagələn.

## Ə

*Əkər* – erkək, kişi, ər.
*Ərən* – igid, igid ər, cəsur, ağıllı, müdrik.
*Əsən* – sağ, sağ-salamat, gözəl, yaxşı.
*Əsrügə/mək/* – halı dəyiş/mək/, həyəcanlan/maq/, xəstələn/mək/.
*Əzi // izi // izdi* – Tanrı, böyük, əziz, istəkli.

## G

*Gerün/mək/* – sığın/maq/, tabe ol/maq/, inan/maq/.
*Gəlit/mək* – gəlib çat/maq, gəlib yet/mək/.
*Gəltür/mək/* – gətir/mək/.
*Gərtün/mək/* – inan/maq/, qovuş/maq/, yanaş/maq/.
*Gəz* – dəfə, səfər, vaxt, yol.

*Girnəş/mək/* – qərara gəl/mək/, söz ver/mək/.
*Görk, görklü* – gözəl, göyçək, görkəmli, adlı-sanlı.
*Görklürik* – gözəl, görkəmli, məşhur, yaxşı.
*Göndür/mək/* – ürək-dirək ver/mək/, təsəlli ver/mək/, ümidləndir/mək/.
*Göydür/mək/ // göyüdür/mək/* – göynət/mək/, yandırıb tök/mək, incitmək.
*Göz/mək/* – gözləş/mək/, gözlə danış/maq/.
*Gülün/mək/* – gülüş/mək/, istehza ilə gülümsə/mək/.
*Güvənc* – öyünən, qürurlu, özünə güvənən.

## İ

*İkiləsi* – ikisi birlikdə, ikisi də, ikisi birgə.
*İkni* – bağır, qucaq, ağuş, sinə.
*İl/mək/* – elə, elə/mək/, onun kimi.
*İlə/mək/* – get/mək/, ət/mək/, gəlib keç/mək/, qat/maq/.
*İlət/mək/* – götür/mək/, götürüb apar/maq/, yetir/mək/, çatdır/maq/, birləşdir/mək/.
*İlətyə/mək/* – apar/maq/, götür/mək/, çatdır/maq/.
*İlt/mək/* – al/maq/, alıb apar/maq/, itələyib sal/maq.
*İltər/mək/* – gətirib çıxar/maq/, ver/mək/.
*İltərir/mək/* – ver/mək/, çatdır/maq/, yetir/mək.
*İnanc* – ümid, inanmaq. ümid bəsləmək.
*İnanclıq* – şahidlik, inandırmaq.
*İr/mək/* – yeri/mək/, gəl/mək/, elə/mək/, ol/maq/, izlə/mək/, get/mək/.
*İrən* – gələn, eləyən, çatan.
*İrər/mək/* – çat/maq/, yet/mək/, qovuş/maq/, birləş/mək/.
*İrəş/mək/* – get/mək, yeri/mək, hərəkət et/mək/.
*İriş/mək/* – yetiş/mək/, çat/maq/, iliş/mək/.
*İrqumış* – bilikli, kamil, dolğun, elmə yiyələnmiş, kamil, arif.
*İrsə* – gəlsə, çatsa, birləşsə.
*İrsə // isə* – isə /bağlayıcı/, sa, sə, /şəkilçi/.
*İrür* – idi, di, dir /şəkilçi/.
*İs // iz* – Tanrı, ilahi, kömək.
*İsanlaş // ısanlaş/maq // esanlaş/maq/* – sağollaş/maq/ – bir-birinə səlamətlik arzu et/mək/, vidalaş/maq/.
*İşar/maq* – parlaq, işıqlı, işıqdayan.



## K

*Kabur* – çuxur, məskən, pis yer, "Ad kaburı" – cəhənnəm quyusu.
*Kala // kələ* – çox, böyük, artıq, kalan.
*Kədbanu* – böyük xanım.
*Kəlac/kalaç* – söhbət, söz, kəlam, danışıq, kəlmə.
*Kəndu* – özü.
*Kərtü* – doğru, həqiqi.
*Kiçi* – kiçik, balaca.
*Kob // kop* – çox, xeyli, bütün.
*Küylə/mək/* – haray-həşir sal/maq/, qorxut/maq/.
*Küz* – payız, son bahar, xəzan.

## Q

*Qaba* – böyük, qoca, yaşlı, ulu, uca, hündür, dik.
*Qaçan* – haçan, nə vaxt.
*Qaçanı* – 1. neçəsini, bir qismini / "Bir qaçanı yıraq yerə yetirdilər" 2. haçan, nə vaxt / "Qaçanı kim, sağı-sola salam verdi, əhval nədür, kim gəlimiş? sorar imdi"/.
*Qaçquçı* – qaçan, qaçıb gedən, əkilən.
*Qaqı* – əsəbi, hirsli, özündən çıxmış, qaqsımış.
*Qaqır/maq/* – hirslə çağır/maq/, qəzəblə səslə/mək/.
*Qamu* – hamı, hamısı.
*Qancarı // qancaru* – hayana, hansı tərəfə, necə, hancarı.
*Qança // qanıça* – hara, haraya, hayana.
*Qanda* – harda, harada.
*Qandalığın* – harda olduğun.
*Qankəs* – əlac, çarə, dərman.
*Qanqı, qansı* – hankı, hansı.
*Qarındaş* – qardaş, bir qarından olan.
*Qaş* – sərhəd, üfüq, aşırım, keçid.
*Qat* – yan, hüzur, qarşı, ön.
*Qatı // qatığ* – qatı, tünd, güclü, bərk, dönməz.
*Qatırlayı* – qatıra mindirib.
*Qaturla/maq/* – qatıra minmək /atlanmaq kimi/.
*Qayğur/maq/* – qayğılan/maq/, qayğı çək/mək/.

*Qızığu* – qəzəb, həcəyan, acıq, hirs, hiddət.
*Qızğur // qızqur/maq/* – əzab çək/mək/, daxilən cəza al/maq/, qızış/maq/, daxilən yan/maq/, qəzəblən/mək/.
*Qızğuruş/maq/* – həyəcanlan/maq/, əzab çək/mək/, peşman ol/maq/.
*Qıl, qıl/maq/* – ol, ol/maq/, et, et/mək/, elə, elə/mək/.
*Qıluq* – yerinə yetirilmiş, edilmiş, qılınmış.
*Qımırsaq* – həşərat, qurt-quş.
*Qor* – işıq, nur, od, qığılcım.
*Qorığ* – gözəl, görkəmli, gözlənilməli, qorunmalı.
*Qoşar* – söz qoşan, şeir yazan, şair, yazıçı.
*Qoşarğuçı* – şair, yazıçı, söz ustası.
*Qoşur/maq/* – qoş/maq/, birləşdir/mək/.
*Qova* – göndəriş, dərhal yola salmaq, qovmaq, fərman.
*Qovçı* – çuğul, hay-küyçü, sözgəzdirən, xəbərçi.
*Qoyı* – imkan, tapşır/maq/, şərait.
*Qumuq* – əziz, sevimli, mehriban.
*Quşundur/maq/* – sarı/maq/, qurşaq bağla/maq/.
*Qut, qutlı* – uğur, dövlət, bəxt, bəxtli, dövlətli, mübarək.
*Quyaş* – qaynar, qızmar, uyarlı.

M

*Mundağ* – bunda, bundan, belə, bu cür.
*Mundi* – girov, əvəz /saxlamaq/.
*Munkula/maq/* – nifrətlə/mək/, incit/mək/, qarğı/maq/.
*Muştula/maq/* – muştuluqlamaq, xoş xəbər vermək.

N

*Nəçük // neçük* – nə üçün, niyə, necə, nə cür.
*Nəsnə* – mal, bir şey, nə isə, nəsə.
*Noğə // noğa* – nalə, haray, içəridən gələn səs, qəm-qüssəli deyim, növhə.

O

*Oğan* – öyən, ilham verən, kömək olan, arxa duran.
*Oğlıq // oğluq* – el-oba, ölkə, yaşayış yeri, ariflər.
*Oqu // oqı/maq/* – çağır/maq/, çağrış/maq, oxu/maq/.



*Olla/maq/* – səslə/mək/, hayla/maq/, çağır/maq/
*Oluğ* – o, həmin.
*Oluğıl* – ol, yerinə yetir.
*Ol, olul/maq/* – o, olub keç/mək/, sovuş/maq/.
*Omuz* – bilək, qol.
*Oşal* – o, həmin, haman.
*Oyağan/maq/* – oyan/maq/, ayıl/maq/.
*Oyandur/maq/* – oyat/maq/, ayıt/maq/.

Ö

*Ög*, öglər, əql, ağıl, əqillilər, ağıllılar, müdriklər.
*Ök/mək/* – öy/mək/, tərifle/mək/, alqışla/maq/.
*Öküş* – çox, xeyli, hədsiz.
*Ön/mək/* – böyü/mək/, yetiş/mək/, bit/mək/, irəli get/mək/.
*Öndin* – ondan, irəlidən, bundan əvvəl, qabaqdan.
*Öngin* – öncə, qabaqca, irəlicə.
*Öntür/mək/* – apar/maq, ötür/mək/, qabağa çək/mək/.
*Ör, örü, örə/mək/* – bəlirmək, dikəl/mək/, yüksəl/mək/.
*Örən* – istəkli, əziz, hörmətli.
*Özət* – əsl, binövrə, özül, nəsl, zat.

P

*Poşan/maq/* – boşal/maq/, azad ol/maq/.
*Puç // buç* – nəsl, əsl-nəcabət, övlad.
*Puş // buş/maq/* – sıxıl/maq/, daral/maq/, usan/maq/.

S

*Sağ* – qızıl çanaq, ölçü qabı, məşrəbə, qədəh.
*Sağaq* – yanaq, yanağın almacıq hissəsi.
*Sağraq* – buxaq.
*Saq/maq/* – təsəvvür et/mək/, canlandır/maq/, sağ gör/mək/.
*Saqçan* – sağcan, sələmət.
*Saqın/maq/* – özünü gözlə/mək/, kənar çək/mək/, qoru/maq/.
*Saqınc* – xoş dilək, uğur.
*Saqıncı* – xoş diləkli, uğurlu.

*Saqıt/maq/* – heç san/maq/, üstündə durma/maq/, sözündən dön/mək/, etibarsız.
*San* – şöhrət, kömək, adlı-sanlı /olmaq/.
*Sanla/maq/* – saya sal/maq/, qoru/maq/, hifz et/mək/.
*Sataş/maq/* – rast gəl/mək/, təsadüf et/mək/, toxun/maq/.
*Satuqlan/maq/* – alıb-sat/maq/, ticarət et/mək/.
*Savqın/maq/* – sevin/mək/, xoşhal ol/maq/, fərəhlən/mək/.
*Savçı* – peyğəmbər, müdrik.
*Semiz* – kök, yağlı, ətli-canlı.
*Səçin* – kəndir, ip, buxov.
*Sək/mək/* – yeri/mək/, məqsədli, nazlı-işvəli yeriş.
*Sirçə* – sirli, örtülü, gizli.
*Sırğa/maq/* – bürü/mək/, tut/maq/, qapsa/maq/.
*Sızana/maq/* – əl-ayağa düş/mək/, tələs/mək/, özünü itir/mək/.
*Sızıl/maq/* – əl uzat/maq/, sürt/mək/, toxun/maq/.
*Sizin/mək/ // sızın/maq/* – yayın/maq/, əkil/mək/, aradan çıx/maq/, yox ol/maq/.
*Solaya/maq/* – soruş/maq/, xəbər al/maq/.
*Sovla/maq/* – soruş/maq/, söz al/maq/.
*Sovyət* – halə, şəkil, görkəm, kölgə.
*Soy* – nəsl, can-ciyər, əsl-nəcabət, yaxın adam.
*Soylan/maq/* – yaxın adamları ilə oturmaq, dincəlmək.
*Sövləş/mək/* – sözləş/mək/, danış/maq/, söhbət et/mək/.
*Sözinə/mək/* – həyəcana gəl/mək/, diksin/mək/, pərt ol/maq/.
*Söydür/mək/* – tapşır/maq/, muğayat ol/maq/.
*Suç, suçlu* – 1. Günah, təqsir, günahkar, təqsirli "Bən sizlərə nə suç qıldım, deyür imdi"; "Cəzasını buldaçıdır suçı qılan"; "Bivəfalıq qıldun bizə, suçlu oldun".
*Sun/maq/* – ver/mək/, dər/mək/, uzat/maq/.
*Sur* – məclis, qonaqlıq.
*Sünük* – sümük.
*Süsləndir/mək/* – ütülə/mək/, hamarla/maq/, gözəlləşdir/mək/.

## Ş

*Şaş/maq/* – çaş/maq/, özünü itir/mək/.
*Şaşıdur/maq/* – aç/maq/, azad et/mək/.
*Şeş/mək/* – aç/maq/.



## T

*Taba // tapa* – yan, həndəvər, səmt, tərəf.
*Taq* – tükənmiş, azalmış, qurtarmış.
*Tal // dal* – çubuq, cavan, zoğ, ağac.
*Tamaşara* – səyahət, gəzinti, tamaşa, mənzərə.
*Tamuğ* – cəhənnəm.
*Tanuğ // tanıq* – şahid, tanıyan, bilən.
*Tapu // tapı* – səcdə, sitayiş, pərəstiş, ibadət.
*Tap/maq/* – çək/mək/, sıxıl/maq/, daral/maq/, dart/maq/.
*Telim* – çox, bol, xeyli, artıq.
*Təkrə // dikmə* – çövrə, ətraf.
*Tinənincə* – meylincə, istəyincə, arzusunca, amalınca.
*Tik/mək/* – yoluna qoy/maq/, təmin et/mək/, yarat/maq.
*Tikmə* – səfeh, ləyaqətsiz, sarsaq.
*Tikrək* – bitmiş, hazır.
*Tikrü* – bəxşiş, hədiyyə, qiymətli /şey/.
*Tış* – çöl, kənar, qıraq.
*Toğarı* – toğara gün-təzə gün, yeni doğan günəş.
*Tolunı* – Tolun ay – bədirlənmiş, dolmuş ay, tam ay.
*Toyı* – şənlik, genişlik, şadlıq, birgəlik.
*Töv/mək/* – yaxın ol/maq/, meyl et/mək/, istə/mək/.
*Tura* – adam, nəfər, şəxs.
*Tutaş/maq* – od tutub yan/maq/, alış/maq/.
*Türkiləyi* – türk kimi cəld, zirək, şücaətli, qüdrətli.
*Tün* – bax – dün.
*Tün // dün* – dünən axşam, gecə.

## U

*Uçmaq // uçmağ* – cənnət, behişt.
*Uğ* – çadırın üst kəmələri.
*Uğın/uğun // oğun/maq/* – özündən get/mək/, özündən gedib yıxıl/maq/.
*Uğla/maq* – çadırın üst kəmələrini çək/mək/, bərkit/mək/.
*Uğutlu* – uyğulu, yuxu görmüş.
*Ulaş/maq/* – paylaş/maq/, bölüş/mək/, ayrıl/maq/.
*Uluq // uluğ* – ulu, böyük, hörmətli, ağsaqqal, müdrik, baba.
*Umuq* – ummaq, uman, ümid gözləyən.

*Una/maq/* – inan/maq/, çağır/maq/, təsdiq et/mək/.
*Ur/maq/* – vur/maq/, döy/mək/.
*Ura dur/maq/* – cəld qalx/maq/, durub qalx/maq/, cəld ol/maq/.
*Uraqut* – arvad, qadın, xatın.
*Urun // uru* – oturulan yer, məskən, bir şey saxlanılan yer; anbar.
*Us, uslı* – əql, əqilli.
*Uş, uşbu* – bu, məhz, məhz bu, kimi.
*Uş/maq/* – uçub gəl/mək/, tez, tələsə-tələsə gəl/mək/.
*Uşan/maq/* – dağıl/maq/, parçalan/maq/.
*Uşt/maq/* – yıxıl/maq/, dağıt/maq/, uçurt/maq/.
*Uvar/maq/* – çalış/maq/, izlə/mək/, darıx/maq/, səy et/mək/.
*Uyar* – uyu/maq/, yuxla/maq/
*Uyatlu* – utanan, utancaq, həyalı-abırlı.
*Uyqu // uyğu* – yuxu, vaqiə, röya.
*Uyluq // oyluq* – omba, dizin üstü.

## Ü

*Ün* – səs, səs-səda, çağırış, nəğmə.
*Ünlə // ündə/mək/* – səslə, səslə/mək/, çağır/maq/, nəğmə oxu/maq/.
*Üzlət/mək* – üz çevir/mək/, dön/mək/, kənara çəkil/mək/.

## Y

*Yaxtu // yəxtü* – göyçək, qəşəng, yaxşı.
*Yaqlaş/maq/* – yaxınlaş/maq/.
*Yakıl/maq/* – birləş/mək, yaxınlaş/maq/.
*Yalan/maq/* – yalan de/mək/, yalan danış/maq/,
*Yalavçı // yılavçı* – qasid, çapar, ayaqçı.
*Yalqı* – ağılsız, beyinsiz, şüursuz.
*Yalqurluq* – ağılsızlıq, səfehlik, beyinsizlik.
*Yanar* – ütü.
*Yanıq* – yanılma, günah, səhv.
*Yap/maq/* – pul, para.
*Yatr/maq/* – tabe ol/maq/, "ipə yatmaq", ram ol/maq.
*Yarındası* – sabahkı gün, sabahısı, ertəsi.
*Yarıngı* – sabahı, sabahkı.
*Yarlıq, yarlıqla/maq/* – uğurlu, kömək, kömək et/mək/.



*Yarlı* – həlim, rəhimli, mərhəmətli, istəkli, uğurlu, nəcib.
*Yas/maq/* – yağ/maq/.
*Yazu // yazı* – çöl, oba, düzənlik, obalıq.
*Yazuq, yazıqlı* – günah, təqsir, günahkar, təqsirli.
*Yava* – səfeh, axmaq, vecsiz, yava.
*Yavlaq // yuvlaq // yıvlaq* – nifrət, məkr, hiylə, qəzəb, qəti, istənilməyən tərzdə.
*Yavız // yuvuz* – müdhiş, yava, acıqlı, qəzəbli.
*Yavuq* – yaxın.
*Yayaq* – piyada, yalın ayaqla, yazıqcasına.
*Yayıt // yayut/maq/* – iz itir/mək/, yayındır/maq/.
*Yek* – yaxşı, gözəl, yey.
*Yekrək* – ən yaxşı, ən gözəl.
*Yengi* – ətək, qolun ətəyi, ağzı.
*Yengili* – təzə, yeni.
*Yerinə* – istənilən kimi, arzu olunduğu kimi.
*Yeti qıl/maq* – hörmət et/mək/, üzr istə/mək/, daxilən narahatlığını yetir/mək/.
*Yetik/mək/* – çat/maq/, yet/mək/.
*Yetkür/mək/* – çatdır/maq/, bildir/mək/, yetir/mək/.
*Yetrür/mək/* – çatdır/maq/, məqsəd bildir/mək/.
*Yəsi* – sahibi, yiyəsi.
*Yığıla/maq/* – ağlamsın/maq/, qəhərlən/mək/, tutul/maq/.
*Yığlaş/maq/* – görüş/mək/, qucaqlaş/maq/.
*Yığrın/maq/* – bildir/mək/, özünü tanıt/maq/.
*Yıq/maq/* – salla/maq/, yıx/maq/.
*Yılğa // yılğı* – birgə, bütün, toplu halda.
*Yıl/maq/* – get/mək/, hərəkət et/mək/, yollan/maq/.
*Yıva* – pis hal, bədbəxt vəziyyət, yava.
*Yıvaq qıl/maq/* – pis halını gör/mək/, ölümü müşahidə et/mək/.
*Yor/maq/* – yoz/maq/, məna ver/mək/.
*Yovuq/youq* – yaxın, yavuq.
*Yulaq* – qaynaq, sızaq, su gözü, su damcısı.
*Yulan* – tez, qabaq.
*Yüküntür/mək/* – yükləmək, yüklətmək.
*Yümüp/mək/* – xeyir-dua dilə/mək/, yaxşı yol de/mək/.

## ƏRƏB VƏ FARS SÖZLƏRİ

### A

*Adamiyyə // adəmiyyət* – adamlıq, insanlıq.
*Aqibət* – nəticə, nəticə etibarilə, axırda, son.
*Afət* – bəla, müsibət, gözəl.
*Asi* – günahkar, günah sahibi.
*Azımayış* – imtahan etmək, aramaq, yoxlamaq.

### B

*Baqi* – daimi, həmişəlik, əbədi, məhv olmayan.
*Batil* – doğru olmayan, həqiqətə zidd, heç.
*Bavər* – inam, ağıl kəsmə, ehtimal, etibar.
*Bey* – alqı, satqı.
*Bəd* – sonra, uzaq, aydınca.
*Bədtər* – daha pis, daha yaman.
*Bəhəmdullah* – Allaşa şükür, şükür Tanrıya.
*Bəsarət* – dünya görüşü, gözün nuru, ziya.
*Bəşarət* – şad xəbər, gözaydınlığı, muştuluq.
*Bəşir* – şad xəbər gətirən, muştuluqçu, ad.
*Bəşərə* – bədəni örtən dəri təbəqə, dərinin üst qatı, xarici görünüş.
*Bəyan* – anlatma, söyləmə, aşkar.
*Bidət // büdət* – adət-ənənə, qayda-qanun.
*Bihudə* – boş, faydasız, hədər.
*Bixud* – hissini itirmiş, ixtiyarsız, özündə olmayan, yersiz.
*Bikr* – qız, bakirə, bütöv, əl dəyməmiş, təmiz, saf.
*Binəva* – yazıq, fağır, zavallı, kasıb, çarəsiz.
*Birun* – bayır, evin kişilərə məxsus olan hissəsi.
*Biyar* – arsız, həyasız, laqeyd.
*Bud* – varlıq, həyat.
*Bustan* – bağ, güllük, çiçəklik, güllü-çiçəkli yer.
*Bürhan* – dəlil, sübut, isbat.

### C

*Cahil* – savadsız, anlamaz, avam, nadan, küt.
*Caiz* – icrasına yol verilən, rüxsətli, mümkün ola bilən, qəbul edilən.



*Cəbbar* – qüvvət, qüdrət, əzəmət, sahibi, cəbr edən, zülm edən, qəzəbli.
*Cəbr* – zor, zor işlətmə, məcbur etmə.
*Cəlil* – böyük, uca, yüksək, cəlal sahibi.
*Cilvə* – parıltı, işıltı, gözəl surətdə görünmə, cilvələnmə.
*Cəmil* – gözəl, istəkli, cəmal sahibi.
*Cərahət* – yara, zədə, ağrı.
*Covr // cövr* – incitmə, zülm, cəfa.
*Cübbə* – xüsusi biçimli geyim.
*Cürm* – xəta – günah, təqsir, nöqsan, xəta eləmək.

### Ç

*Çəndən* – o qədər, o dərəcədə, o mərtəbədə, o miqdarda.

### D

*Dad* – ədalət, insaf, ədalət məhkəməsi.
*Dar* – yer, məkan, məqam, ev.
*Darülməhzən* – qəm evi, hüzn evi, kədər evi.
*Dəricə* – kiçik qapı, qapıcıq, pəncərə.
*Dəriğa* – əfsus ki, əfsus olsun, heyf ki.
*Dərmandə* – aciz qalmış, biçarə, uğursuz.
*Dəstgir* – köməkçi, arxa.
*Dəstur* – icazə, tapşırıq, fərman.
*Dəyyan* – dəyanətli, əqidə sahibi, dindar.
*Didar* – üz, cəmal, görmə, görüş.
*Diba* – ipək.
*Dürud* – salam, dua.
*Düşvar* – çətin.

### Ə

*Ədl* – ədalət bərabərlik.
*Əcaib // əcayibə* – təəccüb, heyrət, matqalma, qəribə.
*Əcəll* – ən ali, ən yüksək, ən böyük.
*Əcz // icz* – acizlik, bacarıqsızlıq, taqətsizlik.
*Əhəd* – tək, vahid, bir.
*Əhli-beyt* – əhl-əyal, ev adamları.
*Əhli-üns* – dost, həmdəm.

*Əhrar* – azad adamlar, dostlar, paklar.
*Əxi* – qardaş.
*Əqdi-nigah* – kəbin kəsmə, nigahlanma.
*Əladdəvam* – daimi olaraq, ömürlük, həmişəlik.
*Ələlhal* – dərhal, o dəqiqə, o saat.
*Ələm* – bayraq, qəm, qüssə.
*Əlassəbah* – səhər tezdən, sübh çağı.
*Əlhəmd* – şükür.
*Əndişə* – düşüncə, fikir, qayğı.
*Ərhəmərrahimin* – Tanrı bağışlayanların bağışlayanı.
*Ərusanə* – gəlin kimi, gəlinyanə.
*Ərş* – qübbə, göy, səma.
*Ərz* – ərz eləmək, sözün demək.
*Əta* – bəxşiş, bağışlama.
*Əttar* – ətir satan, ədviyyat, ətriyyat və b. şeylər satan, dərman satan.
*Əza* – təskin, təsəlli, səbr, dözüm, matəm.
*Əzim* – böyük, yüksək, ulu.

## F

*Fəda // fida* – qurban, candan keçmək.
*Fəraq // firaq* – ayrılıq, hicran.
*Fərar* – qaçma, sovuşma, can qurtarma, əkilmə.
*Fərsənk* – ağac /uzunluq ölçüsü/ (7 km).
*Fəsad* – pozğunluq, nifaq, pis əməl.
*Fəsih* – fərasətli, gözəl natiq, dilavər.
*Fəzl* – məziyyət, ləyaqət, yüksəklik.
*Filhal* – bu saat, tez, indi, hazırda.
*Firdovs* – bağça, cənnət, behişt.
*Firiştə* – mələk, məlakə, huri, pəri.
*Firqət* – ayrılıq, hicran.
*Fisq* – pozğunluq, əxlaqsızlıq, düz yoldan sapmaq.

## G

*Giriftar* – tutulmuş, dustaq, əsir.
*Giryan* – ağlayan, ağlaya-ağlaya, aylayaraq.



*Gur* – qəbir, məzar.
*Guristan* – qəbirlik, qəbristan.
*Güzidə* – seçilmiş, ayrılmış, bəyənilmiş.

## H

*Hacət* – ehtiyac, lüzum, lazım olan şey.
*Hacib* – qapıçı, qaroul, gözətçi.
*Hadis* – rəvayət, hadisə, xəbər.
*Haşəllah* – Allah eləməsin, Allah göstərməsin.
*Haza* – bu /kişi cinsi/, işarə əvəzliyi.
*Heybət* – qorxu, dəhşət.
*Həccam* – qan alan /hecəmət-qanalma, el arası təbib/.
*Həmd* – mədh, dua, sitayiş, şükür.
*Həmd-səna* – tərif, mədh, razılıq.
*Həmrah* – yoldaş, həmfikir, həməqidə.
*Hərəm* – müqəddəs yer, ziyarətgah.
*Hərir* – ipək, ipək parça.
*Həsəd* – paxıllıq, gözü götürməmək, düşmən münasibət.
*Həşəmkərrar* – qüdrətli, əzəmətli, bacarıqlı.
*Həzar* – min, bülbül /məc./.
*Həzən* – hüzn, kədər, qəm-qüssə.
*Həzrət* – ön, qabaq, hüzur, cənab, qulluq.
*Hidayət* – doğru yol göstərmə, rəhbərlik, rəhbərlik etmək, öncül.
*Hudəç* – gocavə.
*Hüllə // hillə* – bəzəkli paltar, naxışlı geyim, bəzək, zinət.
*Hümam* – hümmətli, yüksək təbli, xoş xasiyyətli, nəcabətli.

## X

*Xaif* – qorxaq, səksəkəli.
*Xaslar xası* – seçilmişlərin seçilmiş, ən yaxın adam.
*Xasü-am* – hamı, camaat, əyan və kütlə.
*Xəbbaz* – çörəkçi, çörək bişirən.
*Xəfayə* – xəfiyyə, gizli, gizlicə.
*Xəfi* – gizlin, gözdən kənar.
*Xəlayiq* – bütün canlılar, insan toplusu, camaat, xalq.

*Xəlil* – dost, yaxın yoldaş, ad.
*Xərif* – səfeh, dönük, sarsaq.
*Xəvəs* – xassənin cəmi, xasiyyətlər, yüksək təbəqə.
*Xilaf* – zidd, qarşı, əks, əleyhinə, tərsinə.
*Xof-təhdid* – qorxu, hədə.
*Xub* – yaxşı, qəribə, gözəl, göyçək, əcayib.
*Xulq* – xasiyyət, təbiət.
*Xürrəm* – şad, qəmsiz, kədərsiz, fərəhli.

## İ

*İkram* – hörmət, təzim, əzizləmə.
*İqrar* – qərarlaşdırma, dil ilə söyləmə, ifadə etmə, danışıq, söz vermək, etiraf.
*İlahüna* – ey bizim Tanrımız.
*İman/maq/* – aman gətirmək, inanmaq.
*İnan* – çilov, noqda, ovsar.
*İnayət* – qayğı, kömək, hüsn-rəğbət, yaxşılıq.
*İntiqal* – nəql etmək, danışmaq, yerini dəyişmək.
*...rsal* – göndərmə, yollama, çatdırma.
*...may // ima* – işarə ilə anlatma, him-cimlə bildirmə, him-cim.
*...a* – əziyyət vermə, incitmə.
*...zəti-rüfət* – əziz, hörmətli, yüksək mərtəbəli.

## K

*...ur* – qar kimi ağ/maddə/.
... – iş, fayda, təsir.
*...d* – hiylə, məkr, yalan, kələk.
*...var* – iki dəfə qüdrətli, güclü.
*...fr* – kafirlik, dinsizlik, Allaha inanmamaq.
*...fr-şirkət* – Allahı danıb ona şərik qoşmaq.

## Q

*Qabqovseyn* – qövsi-qüzeh, göy qurşağı.
*Qadir-Sübhan* – qüdrətli Tanrı.



*Qafil // ğafil* – qəflətdə olan, hər şeydən xəbərsiz, diqqətsiz.
*Qafilə* – karvan, birlikdə səfər edən dəstə.
*Qar* – mağara, kaha.
*Qəbalə* – qəbz, bir şeyin götürə və ya bütöv satılması barədə kağız.
*Qəfur // ğəfur* – güzəşt edən, əfv edən (Allah).
*Qəni // ğəni* – varlı, dövlətli, zəngin.
*Qəvi* – qüvvətli, güclü, zorlu.
*Qəzara // ğəzarə* – təsadüfən, qəsdən olmayaraq.
*Qissə* – hekayə, povest, novella, poema, dastan, nağıl.
*Qiyas* – tutuşdurma, müqayisə, bənzətmə fikir.
*Qövl* – söz, danışıq, söz vermə, vəd etmə.
*Qövm* – bir nəsildən olan tayfa, qohum-əqrəba.
*Qüddus* – çox əziz, çox müqəddəs, pak.
*Qüfran // ğüfran* – bağışlamaq, əfv etmək, mərhəmət etmək, diləmək.
*Qüsl // ğüsl* – çimmək, yuyunmaq.

## L

*Lacərəm* – əlbəttə, şübhəsiz, nəhayət, xülasə, mütləq.
*Leyk* – lakin, amma, ancaq.
*Ləfz* – danışıq, söz.
*Ləin* – məlun, lənətlənmiş, mənfur.
*Lisan* – dil, danışıq,
*Lölö* – inci, dürr, parlaq, daş-qaş.
*Lütf* – mehribanlıq, yumşaqlıq, ehsan, kərəm, yaxşılıq.

## M

*Maaf // məaf* – çıxarmaq, kənara qoymaq, azad etmək.
*Macal* – imkan tapmaq, vaxt tapmaq, fürsət əldə etmək.
*Məazallah* – Allaha pənah, Allaha sığınmaq.
*Məbud* – Allah, ibadət olunan.
*Məcruh* – yaralı, yaralanmış, parçalanmış.
*Mədfən* – gor, qəbir, məzar, dəfn olunan yer.
*Mədfun* – dəfn edilmiş, gözdən itmiş.
*Məğbun* – aldanmaq, yanılmaq.
*Məğmum* – qəmli, qüssəli, məhzun, tutqun.

*Məğrib* – qərb, günbatan, günəşin batdığı vaxt, axşam.
*Məhbub* – sevgili, sevilmiş, dost.
*Məhcur* – ayrılmış, hicrana düşmüş.
*Məhruq* – yanmış, alovlanmış.
*Məhzun* – qəmli, kədərli.
*Məkin* – yerləşən, oturan, sakin, sabit, məkan tutmuş.
*Məkr* – hiylə, aldatma.
*Məqam* – dayanılan yer, duracaq məkan.
*Məqhur* – qəhr olmuş, məhv olmuş, əzilmiş.
*Məlaik* – mələklər.
*Məlhuz* – müəyyən olan, nəzərdə tutulan.
*Məmluk* – yiyələnmiş, xüsusi mülkiyyət şəklinə salınmış, mal-əmlak, qul, əsir.
*Mən* – qadağan etmə, qabağını saxlama, mane olma.
*Mənazir* – mənzərələr, tamaşa yerləri, seyrəngah.
*Məni* – mövzu, məsələ, səbəb /məc/.
*Mənnan* – mərhəmətli, səxavətli, şəfəqqətli.
*Məruf* – bilinən, tanınan, məlum olan.
*Məsiyət* – *günah, təqsir.*
*Məşrəbə* – su qabı, parç, kasa.
*Məvalı* – sahiblər, hamillər, dostlar.
*Məyub* – eyiblənmiş, nöqsanlı, şikəst.
*Məzkur* – zikr edilmiş, adı çəkilmiş, məlum.
*Möbir* – açan, aydın edən, təbir edən, yozan.
*Möcizat* – möcüzələr, təəccüb doğuran şey və qeyri-adi hadisələr.
*Möhnət* – zəhmət, əziyyət, dərd, ələm, müsibət.
*Mövla* – sahib ağa, yiyə, hami, havadar.
*Mucib* – səbəb, bais, lüzum, zərurət.
*Mücib* – müşabeh, yaxın, məhrəm, bənzər, oxşar.
*Müəbbir* – yuxu yozan, yuxuya məna verən.
*Müəlləq* – asılı, asılmış, üzüqoylu.
*Müəlləm* – qəmgin, qəmlənmiş, kədərlənmiş, ələmlənmiş.
*Müəttər* – ətirli, ətirlənmiş.
*Müfərrəh* – şad edən, izah verən.
*Müfsid* – fəsad törədən, fitnəçi, ara qarışdıran.
*Müxlis* – xalis, səmimi, səmimi olan, dost.



*Müin* – kömək, yardım, hayan, arxa.
*Mükərrəm* – möhtərəm, hörmətli, səxavətli, comərd, əliaçıq, əzizlənmiş.
*Müqərrəb* – yaxın, dost, yaxın adam.
*Müqir // miqir* – etiraf edən, boynuna alan.
*Müqtəda* – təqlid edilən adam, dalınca gedilən adam, rəhbər, başçı.
*Mülkət* – şahlıq, hökmranlıq, səltənət.
*Mülki-bizəval* – heçə getməyən, mülk, cənnət, Tanrı məqamı.
*Mülləvən* – rəngli, əl-əlvan, boyalı, cürbəcür.
*Münacat* – çağrış, dəvət, dərdini demək.
*Münazirə* – dəyişmə, mübahisə, bəhsetmə.
*Münəqqəş* – nəqş edilmiş, naxışlı, şəkilli, bəzəkli.
*Münəvvər* – işıqlı, nurlu, parlaq, işıqlandırılmış.
*Münkir* – inkar edən, rədd edən, şeytan, iblis.
*Mürəssə* – qiymətli, daş-qaşla bəzənmiş, cavahiratla zinətlənmiş.
*Müşfiq* – mehriban, dost, şəfqətli adam.
*Müştaq* – arzulayan, həsrət çəkən, can atan.
*Müstəcab* – istəyi yerinə yetirilən, xahişi qəbula keçən, duası qəbul olan.
*Mütabiət* – tabelik, tabe olma, ardıcıllıq.
*Mütəhəyyir* – çatmış, heyrətlənmiş.
*Müzəyyən* – bəzənmiş, zinət verilmiş.

## N

*Nagah* – birdən, qəflətən, vaxtsız.
*Nas* – insan, xalq.
*Nədamət* – peşmançılıq, təəssüf.
*Nəf* – fayda, xeyir.
*Nəhif* – səfeh, qorxulu, zəhlətökən.
*Nəhy* – qadağan etmək, yox etmək.
*Nəqs // nəğs* – əskiklik, nöqsan, eyib.
*Nihan* – gizli, məxfi, gizli saxlanmış.
*Nigah* – baxma, baxış, nəzər.
*Nigar* – gözəl, bəzəkli.
*Nisar* – bəxşiş, şabaş.
*Niyaz* – ehtiyac, ödənilən.
*Nöhə-zar* – deyib-ağlamaq.

*Növbət* – növbə, gözləmə.
*Növhə* – qəmli-qəmli nəğmə demək, ağlamaq.
*Nurən-əla-nurın* – nur nurun üstə, daha gözəl.
*Nübüvvət* – peyğəmbərlik.
*Nühas* – camaat arası, kütlə içi.
*Nüzul* – nazi olan, düşmüş, göndərilmiş.

## P

*Pənd* – öyüd, nəsihət.
*Peyki-həzrət* – həzrətin qasidi, göndərdiyi şəxs.
*Peyvəstə* – yapşıq, birləşmiş, həmişə, birgə.
*Pünhan* – gizli, xəlvət, görünməyən.
*Pürnur* – şəfəqli, nurlu, işıqlı.
*Püşt* – arxa, dal, geri, sığınma yeri, kömək.

## R

*Rast* – doğru, düz, tuş.
*Ravi* – rəvayət edən, şeir oxuyan, hekayət söyləyən.
*Ray // rəy* – meyl, istək, niyyət, fikir, düşüncə.
*Raz* – sirr gizli şey.
*Raziq* – ruzi verən, bəsləyən, Tanrı.
*Rəçim* – insafsız, qəddar, pis əməl sahibi.
*Rəhman* – rəhimli, şəfqətli, rəhm edən, Tanrı.
*Rəxt* – paltar, döşənəcək, avadanlıq.
*Rəqiq* – incə, nazik, narın, rəhimli, həssas, qatı.
*Rənc* – zəhmət, əziyyət, narahatlıq.
*Rənçur* – naxoş, xəstə, incik, pərt.
*Rəsul* – elçi, səfir, peyğəmbər, göndərilmiş (adam).
*Rəunət* – köməklik, yardım etmək, mərhəmət etmək.
*Risalə* – məktub, namə, kitabça, məcmuə.
*Risalət* – elçilik, peyğəmbərlik.
*Riza* – razılıq, məmnunluq, qane olma.
*Rizq* – ruzi, azuqə, yemək.
*Rozə* – mərsiyə.



*Ruhüləmin* – Cəbrailin ləqəblərindən biri.
*Rübud // rübudən* – aparmaq, qapmaq.
*Rücu* – geri dönmə, qayıtma, müraciət etmə.
*Rüfət* – ucalmaq, mərtəbə, məqam, yüksəklik.
*Rüxsət* – icazə, aman, imdad.
*Rüşd* – böyümə, inkişaf etmək, ucalmaq.

## S

*Safi* – saflıq, təmizlik, ürəyi təmiz.
*Saleh* – düz adam, təmiz adam.
*Sane* – sənətkar, ustad, yaradan
*Sazvar* – düzgələn, uyğun, müvafiq, layiq, münasib.
*Seyd* – ov, şikar.
*Seyhət* – meydan, vüsətli yer.
*Səbi* – qız, bala.
*Sədiq* – həqiqi dost, vəfalı yoldaş, sədaqətli, Yusifin ləqəbi.
*Səhih* – düz, qüsursuz, aydın.
*Səxt* – möhkəm, bərk.
*Səlim* – sağlam, eybsiz, doğru, dürüst /adam/.
*Səna* – tərif, mədh, öymə.
*Sənəm* – büt, bütpərəstlərin sitayiş etdikləri heykəl, gözəl.
*Sərvan* – düz, qüsursuz, aydın, karvan başçısı.
*Səvab* – doğruluq, düzgünlük, doğru fikir, hamıya xoşgələn hərəkət.
*Sipah* – qoşun, ordu.
*Sirçə* – kiçir sirr, gizli fikir.
*Sirət* – xasiyyət, əqidə, istək.
*Sur* – boru, şeypur.
*Sübhan* – Tanrı, mərhəmətli, xeyirxah.
*Sücud* – səcdə etmə, pərəstiş, tapınmaq.
*Sün* – iş, əməl, iş görmə, şad etmə, sənət.

## Ş

*Şadkam* – şad, arzusuna çatmış. kam almış adam. qəmsiz, kədərsiz.
*Şaki* – şikayət edən, şikayətçi.

*Şakir* – şükr edən, razılıq bildirən, dözümlü.
*Şaiq* – layiq olan. ləyaqətli, bu və ya başqa mövqeyə yaraşan.
*Şayəd* – ola bilər ki, bəlkə, ehtimal ki.
*Şəbab* – cavanlıq, gənclik, tər-təzə.
*Şəddə* – bağlı, topa, boyunbağı, zinət şeyləri.
*Şəfaət* – bir günahkarın bağışlanması üçün vasitəçilik və iltimas, xahiş etmək.
*Şərif* – əziz, hörmətli, möhtərəm.
*Şərmsar* – utancaq, utanan, xəcalətli, həyadan qızaran. xəcalət.
*Şükr lillah* – Allaha şükür olsun.
*Şükr-səna* – şükr və tərif, razılıq bildirmək.
*Şürut* – şərtlər, yollar, qayda-qanunlar, ölçü-biçilər.

## T

*Taət* – itaət, pərəstiş etmək.
*Tağı* – zülmkar, qəddar, dönük.
*Talib* – tələb edən, istəyən, arzulayan, həvəskar, elm təhsil edən.
*Təam* – yemək, xörək, bişmiş.
*Təchiz* – yaraqlandırmaq, silah vermək, hazırlamaq.
*Təfərrüq* – ayrılıq, fərqləndirmək.
*Təhdid* – hədd təyin etmə, hədələmə, qorxutma.
*Təhqiq* – həqiqəti axtarıb meydana çıxarma, yoxlama.
*Təhsin* – bəyənmə, bəyənib əhsən demə, alqışlama.
*Təqdir* – qəzavü-qədər, qismət.
*Təqzib // təkzib* – yalana çıxartma, yalanlığı isbata çalışmaq.
*Təlbis* – hiylə, rəng vermə, don geyindirmə /məc./.
*Təməllüq* – yaltaqlıq
*Təvil* – təfsir etmə, izah etmə.
*Təzərrə* – itaətkarlıq, boyun əymə, yalvarma, yalvarıb-yaxarma, ağlama.
*Təzviç* – evlənmə.
*Tofiq* – kömək, qüdrət.
*Tifl* – uşaq, cocuq.
*Timar* – oxşamaq, əzab-əziyyət, qayğı.
*Türfə* – tapılmayan, misli-bərabəri olmayan, əcaib, nadir şey.



## Ü

*Übudiyyət* – qulluq, bəndəçilik.
*Üqba* – axirət, son.
*Üləma* – alimlər, bilicilər, elm sahibləri.

## V

*Vəbal* – günah, təqsir, xəta.
*Vəhy, vəhyi – peyğəmbər* – ilham, ilahi xəbər, bilik.
*Vəslət* – birləşmə, qovuşma, çatma.

## Z

*Zahid* – ibadət edən, pəhrizkar, asket, mənfur, riyakar.
*Zahir* – aşkar, açıq, aydın.
*Zari* – ağlama, nalə.
*Zəhi* – afərin, mərhəba, bərəkalla!
*Zinhar* – ay aman, saqın, ehtiyatlı ol, qorun/maq/.
*Zülcəlal* – cəlal sahibi, böyük, cəlallı.
*Zünnar* – İsəvilərin, xristianların bağladığı kəmər, bel bağı.

## POEMADAKI XÜSUSİ ADLAR

*Arslan* – Beniyəminin oğlanlarından biri.
*Arım // Arm* – Əsərdə işlənən ad, surət
*Bar* – Beniyəminin oğlu.
*Beniyəmin* – Yusifin doğma qardaşı.
*Bəşir* – Yəqub peyğəmbərin xidmətçisinin oğlu.
*Bəyran* – Yusifin yuxuda gördüyü ulduzlardan birinin adı.
*Buls* – Misirdə şəhər adı, ulduzlardan biri.
*Bustan* – Peyğəmbərə suallarla müraciət edən yəhudinin adı.
*Cabbar // Cəbbar* – Tanrının ləqəblərindən biri (mənası – qüvvət, qüdrət, əzəmət sahibi).
*Cəbrail* – Allahın qasidi.
*Cəlil* – Tanrının ləqəblərindən biri (mənası – böyük, cəlalı).
*Dar* – Beniyəminin oğlanlarından biri.
*Dava* – Surətlərdən biri.
*Dünya* – Yəqub peyğəmbərin qızı.
*Əhəd* – Tanrının adlarından biri (mənası – tək).
*Əli Kərrar* – İmam Əli.
*Əhməd* – Məhəmməd peyğəmbərin ləğəblərindən biri (mənası – bəyənilmiş, gözəl).
*Əli // qul Əli* – Poemanın müəllifi, şair.
*Əmud* – Ulduz adı.
*Əmun // Əmu/Əmin* – Yusifin qardaşlarından biri.
*Ərus* – Misirdə şəhər adı.
*Əziz // Əziz Sultan* – Misir məliki, şahı.
*Həsən* – İmam Əlinin böyük oğlu.
*Hüseyn* – İmam Əlinin ikinci oğlu.
*Xüləfayi-Rəşidi* – Rəşidi adı ilə məşhur olan xəlifələr.
*İbrahim Xəlil* – Yusifin babası.
*İshaq // İbn/İsaq* – Yəqub peyğəmbərin atası.
*İsmail // İsmayıl* – İbrahim Xəlil peyğəmbərin oğlu.
*İsrail* – Yəqub peyğəmbərin başqa adı və tayfa.
*Kəlimüllah* – Musa peyğəmbərin ləqəbi.
*Kənan* – Yusif doğma yurdu, vətəni.
*Kənan* – ulduz adı.
*Kor* – Benyəminin oğlanlarından biri.



*Qan // Xan* – Beniyəminin oğlanlarından biri.
*Qanığ* – ulduz adı.
*Qarğa sin-Talut // qarğa ibn-Talut* – əsərdə işlənən surət adı.
*Qayğu* – Beniyəminin oğlanlarından biri.
*Qəffar* – Tanrının adlarından biri mənası – günahları bağışlayan.
*Qənzəfr // Məlik Qənzəfr* – Misir padşahının adı.
*Qərib* – Beniyəminin oğlanlarından biri.
*Qılıc* – Misir şahlığında xidmətçi qul.
*Qul* – Beniyəminin oğlanlarından biri.
*Qurt* – Beniyəminin oğlanlarından biri.
*Quyu* – Beniyəminin oğlanlarından biri.
*Qüds* – Misirdə şəhər adı.
*Mamilə* – Yusifin kiçik oğlu.
*Məlikzadə Telmus // Temus* – Züleyxanın atası.
*Məlik Doğar // Doğar oğlu Məlik* – qul taciri.
*Məlik Rəyyan // Rəyyan* – Misir padşahı.
*Məlik Sübhan* – Misir padşahı.
*Məsalim* – Yusifin böyük oğlu.
*Mövla Cəlil* – Tanrının adlarından biri (mənası – böyük havadar, hörmət sahibi).
*Musa, Musa Kəlim* – Musa peyğəmbər.
*Mustafa* – Məhəmməd peyğəmbərin ləqəblərindən biri (mənası seçilmiş, bəyənilmiş).
*Nəhrülüyun* – Ərəbistanda yer adı.
*Nəmrud* – Yusifin babası İbrahim Xəlil (İbrahim Azər də deyirlər). Məkkədə adamları təkallahlığa dəvət edirdi. Bir gün bütxanəyə girib bütləri sındırır, baltanı isə aparıb böyük bütün biləyindən asır. Şübhələnib deyirlər ki, bütləri sən sındırmısan. Cavab verir ki, bütləri böyük büt sındırıb. Deyirlər – cansız büt bunu necə edə bilər? Xəlil cavab verir, bəs, cansız bütə niyə sitayiş edirsiniz?.. Buna görə, yerli hakim Nəmurd böyük bir tonqal qaladır və Xəlili oda atdırır. Guya ilahi bir qüvvə tərəfindən odun içindən gülüstan yaranır. Xəlil xilas olur.
*Niyan* – Misirdə şəhər.
*Osman* – dörd məşhur xəlifədən biri.
*Ömər Xəttab oğlu* – dörd məşhur xəlifədən biri.
*Rəbbi-Cəlil* – Tanrının ləqəblərindən biri (mənası – böyük Tanrı).
*Rəsul* – Məhəmməd peyğəmbərin adlarından biri (mənası – elçi).

*Rəvail* – Yusifin qardaşlarından biri.
*Rəyan* – Ulduz adı.
*Sabit* – əsərin surətlərindən biri.
*Sabit oğlu Neman* – Səhabə və ənsardan olub Bədr döyüşlərində iştirak etmiş, Xeybər vuruşlarında ölmüşdür.
*Salam oğlu Əbdüllah* – peyğəmbərin ləqəblərindən biri – günyəsidir; ona Əbuəbdüllah (Əbdüllah oğlu) da deyirlər.
*Sara* – Yusifin abası, böyük nənəsi.
*Sədiqi-Sahibi qar* – peyğəmbər Qureyşndən yayınmaq üçün Əbubəkrlə birgə Mədinəyə mühacirət edərkən Məkkə yaxınlığındakı Tur dağında mağarada gizlənmişlər. Bu sədaqətinə görə Əbubəkrə Sədiqi-Sahibi-qar (yəni mağara dostu) deyiblər ki, bəzən də o, Sədiqi Əkbər deyə xatırlanır.
*Səhah* – ulduz adı.
*Səməd* – Tanrının adlarından biri (mənası – tək).
*Sənəm* – bütpərestlərin pərəstiş etdiyi büt (gözəl mənasında da işlədilir).
*Sınığ* – ulduz adı.
*Sonuğ* – ulduz adı.
*Sübhan* – Tanrının adlarından biri (mənası – arxa, həyat).
*Şəmun* – Yusifin qardaşlarından biri.
*Təniz // Tənqiz* – Beniyəminin oğlanlarından biri.
*Təryan* – ulduz adı.
*Ümmirahil // Rahilə* – Yusifin mərhum anası.
*Yəhudə* – Zahidlərdən biri.
*Yəhudə // Yahuda* – Yusifin qardaşlarından biri.
*Yəqub* – Yusifin atası, poemanın əsas qəhrəmanlarından biri.
*Yusif* – poemanın baş qəhrəmanı, Yəqub peyğəmbərin oğlu.
*Züleyxa Məlikzadə Telmus/Temus qızı* – poemanın ikinci əsas qəhrəmanı.
*Zülfiqar* – İmam Əlinin qılıncının adı.



## MÜNDƏRİCAT

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Tərtibatçı-rəssam: *Nərgiz Əliyeva*

Kompyuter səhifələyicisi: *Rəşad Həmidov*

Korrektor: *Pərinaz Səmədova*

Yığılmağa verilmişdir 20.07.2004. Çapa imzalanmışdır 06.01.2005.
Formatı 60x90 $^1/_{16}$. Fiziki çap vərəqi 13,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 3.

Kitab "Şərq–Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.